**BU NÖMRƏDƏ**

## *Ali təhsil*



## *Pedaqogika və psixologiya*



## *İslam həmrəyliyi*



## *Təhsilin keyfiyyəti*



## *İnnovasiyalar*

**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 538-82-65; 538-82-67**

**Redaksiyanın ünvanı: Bakı şəhəri, Yasamal rayonu, Azad Mirzəyev küç., 236. İndeks AZ 1065 Kağız formatı 70x108 1/16 Sifariş: 06**

---

**Jurnal redaksiyanın kompüter mərkəzində yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

**В этом номере**



**In this number**



# ALİ TƏHSİL SİSTEMİNDƏ YENİ DƏYƏRLƏR YARADAQ



**Ədalət Muradov,**
***Azərbaycan Dövlət İqtisad Universitetinin rektoru, professor***

**Elşən Bağırzadə,**
***Azərbaycan Dövlət İqtisad Universiteti rektorunun müşaviri, dosent***

Son illər Azərbaycan elmində və təhsilində böyük irəliləyişlər baş verir, dərin islahatlar həyata keçirilir. Bu prosesdə Prezident İlham Əliyevin qarşıya qoyduğu əsas vəzifələrdən biri də dünyanın müxtəlif ölkələrində çalışan, Azərbaycana bağlı, Azərbaycanın yüksəlişində maraqlı olan tanınmış alim və mütəxəssislərlə əlaqələr qurmaq, onların zəngin təcrübələrindən yararlanmaqdır. Elə bu məqsədlə Təhsil Nazirliyinin dəvəti ilə böyük elm adamı, ABŞ-ın Şimali Karolina Universitetinin professoru, elm üzrə Nobel mükafatına layiq görülmüş ilk türk alim Aziz Sancar bir həftə Azərbaycanda səfərdə oldu. Təhsil Nazirliyi və Azərbaycan Milli Elmlər Akademiyasında rəsmi görüşlər keçirdi, Azərbaycanın elm və təhsil ictimaiyyətinin görkəmli nümayəndələri, tələbələr və media mənsubları ilə bir araya gələrək dərin təcrübəsini, qiymətli fikirlərini onlarla bölüşdü və müvafiq tövsiyələrini verdi.

Nobel mükafatı laureatı Aziz Sancarın bütün elm adamları üçün nümunə ola biləcək həyat və yaradıcılığının əsas cəhətlərinə, elmi fəaliyyət və ictimai inkişaf istiqamətində verdiyi mesajlara keçməzdən əvvəl onun bioqrafiyasına qısa nəzər salaq. Aziz Sancar 1946-cı ildə Türkiyə Respublikasının Mardin vilayətinin Savur mahalında doğulmuşdur. İbtidai, orta və lisey təhsilini Türkiyənin Mardin vilayətində almışdır. 1963-cü ildə İstanbul Tibb Fakültəsinə daxil olmuş və 1969-cu ildə bu fakültəni birinciliklə bitirmişdir. 1973-1977-ci illərdə ABŞ-da, Dallasda yerləşən Texas Universitetində məşhur alim Claud Rupertin laboratoriyasında molekulyar biologiya proqramı üzrə doktorantura təhsili almış və 1977-ci ildə doktorluq dərəcəsini qazanmışdır. Sancar İstanbul Universitetini bitirdikdən sonra əmək fəaliyyətinə Türkiyə Respublikasının Mardin vilayətində həkim kimi başlamış və 1969-1971-ci illərdə bu vilayətdə işləmişdir. 1977-ci ildə Texas Universitetində doktorantura təhsilini başa vurduqdan sonra 1977-1982-ci illərdə postdoktorantura tədqiqatçısı və dosent kimi ABŞ-ın Yale Universitetində çalışmışdır. 1982-ci ildə ABŞ-ın Şimali Karolina Universitetində fəaliyyətə başlamış və hazırda bu universitetin Tibb Məktəbinin Biokimya və Biofizika üzrə Sarah Graham Kenan professoru və laboratoriya rəhbəri vəzifələrində çalışır. Biokimya və biofizika sahəsində araşdırmalar aparan Aziz Sancar

hələ doktoranturada oxuyarkən çox əhəmiyyətli kəşf olan “Maxicell” metodunu icad etmiş və ABŞ-da gen mühəndisliyi sahəsini inkişaf etdirən azsaylı alimlər sırasına qoşulmuşdur. DNA təmiri və bioloji saatın tənzimlənməsi sahələrində fundamental araşdırmalar aparan Sancar elmdə altı mühüm kəşfin müəllifidir. Onun bu kəşfləri gen mühəndisliyi və xərçəng xəstəliyinin müalicəsi sahələri üçün çox geniş imkanlar açmaqla, bütövlükdə bəşəriyyətin gələcək inkişafı baxımından mühüm əhəmiyyət daşıyır. O, 2015-ci ildə DNA təmiri sahəsində araşdırmalarına görə kimya üzrə Nobel mükafatına layiq görülmüşdür. Hazırda nüfuzlu ABŞ Milli Elmlər Akademiyasının üzvü olan üç türkdən biri (birincisi) və elm sahəsi üzrə Nobel mükafatı alan ilk türkdür. Çoxlu sayda nüfuzlu elm mükafatlarına layiq görülən Sancar həm də xeyriyyəçidir. O, Şimali Karolinada türk tələbələrin yaşaması və Türkiyənin tanıtımı məqsədilə “Türk Evi”ni qurmuşdur. Eyni zamanda xanımı Gwen Sancar ilə birlikdə ABŞ-da oxuyan türk tələbələrə yardım etmək və türk-amerikalı əlaqələrini inkişaf etdirmək məqsədilə “Aziz and Gwen Sancar Fondu”nu təsis etmişdir. Hazırda bu fond vasitəsilə elm və təhsil sahəsində bir çox xeyriyyəçilik layihələrini həyata keçirir.

**Aziz Sancar UNEC-də qonaq olmuşdur.** Aziz Sancarın Azərbaycana səfəri çərçivəsində UNEC-də onunla bağlı çoxlu sayda tədbir keçirildi. Bunlardan bir neçəsini xüsusilə vurğulamağa dəyər. İlk növbədə Aziz Sancarın şəxsən özü tərəfindən qələmə alınmış və Nobel Fondu tərəfindən nəşr edilən Nobel bioqrafiyası “Aziz Sancarın Nobel bioqrafiyası” adı altında Azərbaycan dilində nəfis şəkildə çap edilərək elm ictimaiyyətinin diqqətinə təqdim edildi. Bioqrafiya istər məzmun, istərsə də forma baxımından çox mükəmməl əsərdir. Professor Sancar çox da böyük həcmli olmayan bu bioqrafiyada həm həyatını, həm də fəaliyyətini mükəmməl və çox anlaşıqlı şəkildə əks etdirmişdir. Bu bioqrafiyanı oxuyan hər bir oxucu dəyərli alim barədə, onun elmi fəaliyyəti haqqında çox faydalı biliklər əldə edir və bir alimin timsalında “Nobelə gedən yol”un nə qədər çətin və məşəqqətli olduğunu görür. Əsərdə Aziz Sancarın bütün bu çətinliklərin və məşəqqətlərin öhdəsindən çox böyük əzmlə və ustalıqla gəldiyinin, dünya elminə çox dəyərli töhfələr verdiyinin şahidi olur. İkinci mühüm tədbir Azərbaycanın görkəmli elm adamlarının, ictimaiyyət nümayəndələrinin iştirakı ilə UNEC-də keçirilən “Aziz Sancar: bir elm fədaisinin həyat hekayəsi” adlı konfrans oldu. Konfransda böyük alimin həyat və yaradıcılığından bəhs edən film izlənildi, onun Azərbaycan cəmiyyəti qarşısında Azərbaycan sevgisiylə dolu ilk rəsmi çıxışı dinlənildi və görkəmli alimə suallar verildi. Konfransın yekununda UNEC Elmi Şurasının qərarı ilə Aziz Sancara UNEC-in fəxri doktoru diplomunun təqdimetmə mərasimi keçirildi və UNEC-də “Aziz Sancar Tədqiqat Mükafatı”nın və Aziz Sancar Qida Mühəndisliyi Laboratoriyasının təsis edildiyi elan olundu. Aziz Sancar səfəri çərçivəsində UNEC-in nüfuzlu “Thomson Reuters” şirkəti ilə birlikdə təşkil etdiyi “Universitetlərdə elmi fəaliyyətin müasir idarəetmə modeli” adlı beynəlxalq konfransda da iştirak etdi. Konfransın rəsmi açılışından öncə ümummilli lider Heydər Əliyevin məzarını ziyarət edən, onun ruhuna dualar oxuyan Sancar əsas məruzəçi kimi iştirak etdiyi bu tədbirdə geniş çıxış etdi və məruzəsi konfrans iştirakçıları tərəfindən alqışlarla qarşılandı.

**Aziz Sancar UNEC-də tələbələr və media nümayəndələrilə də görüşdü.** “Aziz Sancar - uğur formulu” adlı tədbirdə UNEC və digər universitetlərin tələbələrilə bir araya gələn Sancar onların suallarını cavab-

landırdı və gələcək fəaliyyətlərində əhəmiyyətli olacaq dəyərli tövsiyələrini verdi. Səfərinin sonuncu günündə isə şöhrətli alim UNEC-də Azərbaycan mediası üçün geniş mətbuat konfransı keçirdi, Azərbaycana səfəriylə bağlı xoş təəssüratlarını açıqladı, jurnalistlərin suallarını cavablandırdı və Azərbaycan ictimaiyyətinə bir-birindən qiymətli mesajlarını çatdırdı.

**Elmdə uğurun açarı alın təridir.** Aziz Sancarın həyat və fəaliyyəti, fikirləri hər bir elm adamı üçün çox faydalı təcrübələr və mesajlarla zəngindir. Bunlar arasında ən çox diqqəti çəkən qazandığı uğurların təməlində hansı amilin və ya amillərin dayanmasıdır.

Başqa sahələrdə olduğu kimi, elmdə də uğurun açarını bəziləri zəka səviyyəsini, bəziləri şansı, bəziləri isə çox çalışmağı qəbul edir. Bu barədə Aziz Sancara Azərbaycanda da çoxlu sual verildi. O, daha çox sonuncular sırasında olduğunu bildirdi və əldə etdiyi uğurlarda alın tərinin açar rolu oynadığına inandığını bildirdi. Aziz Sancar zəhmətə, çalışmağa o qədər əhəmiyyət verir ki, Nobeli aldıqdan sonra ona ünvanlanan təbriklər arasında ən çox sevdiyi təbrik də məhz onun zəhmətsevərliyinə işarə edən İsveçdəki Türk-İsveç Həmkarlar Təşkilatından gələn təbrik olur. Həqiqətən də Sancarın elmi karyerasına nəzər yetirdikdə ilk növbədə qarşımıza böyük zəhmət və səbir hesabına yüksək performans nümayiş etdirən bir elm adamının karyerası çıxır. 420-dən çox elmi məqaləyə, 33 mindən çox elmi istinada malik olan, Hirş indeksi isə 99-a çıxan Aziz Sancar fotoliyaz təmir mexanizmini kəşf etmək üçün 40 il, DNA ikili kəsim mexanizmini kəşf etmək üçün 35 il, kriptokrom və period proteinlərinin funksional mexanizmini kəşf etmək üçün isə 16 il zaman sərf etmişdir. Hazırda bioloji saat üzərində tədqiqatlar aparan Sancar bu sahəyə də 20 ildir ki, zaman sərf edir. Bütün bu dövr ərzində Sancarın sərf etdiyi əməyin intensivliyinə baxdıqda isə, özünün də qeyd etdiyi kimi, çox vaxt həftədə orta hesabla 70 saat çalışdığı ortaya çıxır. O, fotoliyaz fermenti üzərində 40 il tədqiqat aparmaqla bu sahədəki tədqiqatlara yekun vurmuş və həmin sahəni o qədər dərinləşdirmişdir ki, artıq elmi ədəbiyyatlarda fotoliyaz fermenti “Sancar fermenti” kimi də ifadə edilir. Elə məhz bunlara görədir ki, Yale Universitetində çalışdığı zaman laboratoriya rəhbəri olmuş professor Dean Rupp Sancarı özünü işinə fədaetmişliyin çox yaxşı nümunəsi adlandırır.

Elm pul üçün, mükafat üçün deyil, insanlığa xidmət üçündür. Aziz Sancara görə, elm könül işidir, maraq işidir, fədakarlıq işidir, yeni biliklər yaratmaqla bəşəriyyətə xidmət işidir. Bir sözlə, elmi fəaliyyəti pul üçün, mükafat üçün seçməzlər. O, hesab edir ki, dünyada pul qazanmanın elmdən qat-qat asan olduğu çoxlu sahələr qala-qala bir insanın pul qazanmaq üçün elmə gəlməsi məntiqli görünmür. Buna baxmayaraq, Sancar elmdə, xüsusilə fundamental elmdə yüksək məbləğlərdə pulun qazanıla biləcəyini də istisna etmir. Aziz Sancar elmə və tədqiqata o qədər könül vermiş adamdır ki, Nobel mükafatını aldıqdan sonra da həyatında maddi olaraq elə bir dəyişiklik baş vermir, mükafatdan gələn gəlirləri xeyriyyə işlərinə ötürür, özü isə mənəvi qazanclarla kifayətlənir.

Aziz Sancar insanın elmə olan marağının və bu yolda çalışmasının hər hansı bir mükafat naminə olmasını da düzgün hesab etmir. Bir gün şöbəsində onunla birlikdə çalışan bir xanım “çox çalışacam, Nobeli alacağıq” dediyi zaman Sancar ona belə cavab verir: “Biz tədqiqatı Nobel üçün aparmırıq. Mən sadəcə maraqlıyam və bəzi şeyləri kəşf etmək istəyirəm. Mən ölkəmi çox sevirəm və ölkəm üçün bir iş görmək istəyirəm. “Nobel almaq üçün tədqiqat aparacağam” deməyin, “insanlıq üçün, cəmiy-

yət üçün nəsə edəcəyəm" söyləyin".

Bütün bunlardan sonra Sancar gənclərin şan-şöhrətin yalnız zəhmətin nəticəsi olduğunu dərk etmələrini və Nobel almasına baxmayaraq, onu da yalnız belə yadda saxlamalarını arzu edir: "Həyatı boyu çox, hədsiz çox çalışmış və kəşfləriylə insanlığa xidmət etmiş bir vətənsevərdir".

**Nobel mükafatı elmdə yeganə kriteriya deyildir.** Hamıya məlum olduğu kimi, Nobel mükafatı çox vaxt elmdə yeganə kriteriya kimi qəbul edilir. Aziz Sancar bunun tamamilə yanlış olduğunu qeyd edir. O, hesab edir ki, elm üzrə verilən Nobel mükafatları tamamilə obyektivdir və həqiqətən də bu mükafatlar dünya elminə mühüm töhfələr etmiş tədqiqatlara verilir. Ancaq onu da nəzərə almaq lazımdır ki, bu tədqiqatlar Nobel Komitəsi tərəfindən seçilir, onlar tərəfindən əhəmiyyətli hesab edildiyi üçün mükafatlandırılır. Yəni elə mühüm tədqiqatlar ola bilər ki, onlar Nobel Komitəsinin diqqətini cəlb etmədiyindən Nobel mükafatından kənarda qala bilərlər. O, hesab edir ki, elmdə belə tədqiqatlar çoxdur. Aziz Sancar həmçinin Nobel mükafatının verilmədiyi elm sahələrində də bəşəriyyət üçün mühüm hesab olunan tədqiqatların aparıldığını qeyd edir və bu zaman əslən azərbaycanlı olan Lütfi Zadənin tədqiqatlarını misal çəkir. Sancara görə, Lütfi Zadənin tədqiqatları bəşəriyyət üçün çox böyük əhəmiyyət daşıyır, ancaq riyaziyyat üzrə Nobel mükafatı verilmədiyindən Lütfi Zadənin də bu mükafatı alması mümkün deyildir.

**Elm sevgisi və mədəniyyəti aşılayan universitetlərin əhəmiyyəti.** Aziz Sancar gələcəyin ciddi elm adamlarının yetişməsində elm sevgisi və mədəniyyəti aşılayan universitetlərin rolunu xüsusi vurğulayır. Bu baxımdan o, İstanbul Universitetindəki müəllimlərinin onun elm yolunu seçməsindəki rolunu hər zaman yüksək qiymətləndirir. Əslində elə geri qalmış dünyanın əsas problemi də məhz bu sevgidən və mədəniyyətdən məhrum olmasıdır. Buna görə də bu gün inkişaf etmək istəyən cəmiyyətlərdə universitetlərin təkcə elm öyrədən, araşdırma aparan qurumlar deyil, ilk növbədə elm sevgisi və mədəniyyəti aşılayan qurumlar olmaları zəruriliyi öz aktuallığını qoruyur.

Yol göstərən və tədqiqat sərbəstliyi verən elmi rəhbərlərin önəmi həmişə həlledici olmuşdur. Aziz Sancar Texas Universitetində doktoranturada oxuyarkən elmi rəhbəri olmuş professor Claud Rupert haqqında həmişə çox böyük minnətdarlıq hissiylə danışır. Onu özünün peşə həyatında ən təsirli insan hesab edərək, elmi rəhbərlik xüsusiyyətlərini belə ifadə edir: "Mənim üstün olduğum tərəflərimi və yetərsizliklərimi anlamışdı. Məni ürəkləndirdi, tövsiyələr verdi və mənə doğru yol göstərdi. Ancaq hamısından önəmlisi öz fikirlərimi formalaşdırmamda və bunları test etməmdə mənə sərbəstlik verdi. Bir elm adamı və alicənab olaraq mənim peşə həyatımda ən təsirli insandır". Ancaq Aziz Sancar da belə bir insanın əməyini yerdə qoymur, onun tərəfindən kəşf edilən fotoliyaz fermenti üzərində tədqiqatlarını 40 il davam etdirir, bu sahədəki tədqiqatlara yekun vurur və Nobel mükafatı alır. Sancar doktorluq işini tamamladıqdan sonra ABŞ universitetlərindəki qaydalara uyğun olaraq başqa bir universitetdə fəaliyyətini davam etdirmək məqsədilə Texas Universitetindən ayrılarkən elmi rəhbəri Rupert onun gələcəyini dəqiqliklə görürmüşcəsinə öz xanımına üzünü tutaraq "Azizin getməsi ilə mənim Nobel almaq şansım da əldən gedir!" deyir. Aziz Sancar da heç vaxt müəllimini unutmur və Nobel mükafatını aldıqdan sonra ilk telefon edib sevincini bölüşdüyü şəxslərdən biri məhz 97 yaşlı Rupert olur.

Elmi tədqiqatlarda inancdan doğan sonsuz motivasiya uğurun başlanğıcıdır. Sancar

eyni zamanda inanclı insandır. Elmi axtarışlarında ən böyük motivasiya mənbəyi yalnız Allahın bildiyi bir həqiqəti yenə də yalnız Allahın verdiyi zəkanın imkanları ilə aşkarlamağın onda yaratdığı mənəvi rahatlıqdır. Elə məhz buna görə də Sancar onu Nobel mükafatına aparan mühüm kəşfini - “DNA-nın ikili kəsim təmir mexanizmi”ni - tamamlayan kimi tələsik xanımının yanına gəlir və deyir: “İndiyə qədər yalnız Allahın bildiyi mühüm bir həqiqəti hazırda bütün dünyada yalnız mən bilirəm”. Doğrudan da çox möhtəşəm hisdir və şübhəsiz ki, heç bir başqa güc inanclı insanı bu qədər motivasiya edə bilməz.

**Aziz Sancar elmi kəşflərə böyük dəyər verir.** Aziz Sancar 2000-ci ildə Nyu York Universitetindən tədqiqatçı dostu Johannes Schelvislə elmi kəşflərin mənəvi və maddi dəyərləri haqqında söhbət edərkən dostunun maraqlı bir sualı ilə üzləşir: “Bu kəşfinə maddi dəyər verə bilərsənmi, məsələn, sənə on milyon dollar versələr, bu kəşfi başqa birinə verərsənmi?” Sancarın cavabı, həmişəki kimi, özünəməxsus və möhtəşəm olur: “Heç fikirləşmədən “xeyr” deyərəm. Çünki bu kəşf hər cür maddi mükafatdan fərqli olaraq məndə çox nadir hallarda tapa biləcəyim bir daxili sükunət yaratmışdır. Həmçinin də gələcək nəsil türk tədqiqatçıları biokimya və molekulyar biologiya dərslərində bunu görərək “bu kəşfi bizdən biri etdi” deyə biləcəklər. Onlarda bu güvəni yaratmaqla məmləkətimə xidmət etdiyimi hiss edirəm”. Həqiqətən də insanın uzunmüddətli elmi axtarışlarının uğurlu nəticələri olan elmi kəşflərin onda yaradacağı mənəvi rahatlıq və güvən hissinin hər hansı maddi ölçüsünün tapılması çətindir, bəlkə də heç mümkün deyildir. Aziz Sancarda isə bu hissə millət və məmləkət sevgisi də əlavə olunur ki, bu da qeyd olunan məsələni tamamilə mümkünsüz edir. İllər keçdikdən sonra yazar Orhan Bursalı onun haqqında kitab yazarkən Schelvisin verdiyi sualı Aziz Sancara bir daha yönəldir. Sancar bu dəfə cavabında elmi həqiqətə, doğruluğu qəti şəkildə təsdiqlənmiş biliyə, bir sözlə, elmə olan sonsuz inancını bu ifadələrlə dilə gətirir: “Nobel üçün bioqrafiyamı yazarkən bu kəşfin dəyəri haqqında təkrar fikirləşdim və nəinki on milyon, on Nobel versələr də, dəyişmərəm deyərək içimdən keçirdim. Çünki Nobel mükafatı verilməsi belə başqalarının (Nobel Komitəsinin) təqdirindən asılıdır. Ancaq “bunu bir Allah, bir də mən bilirəm” deməyə imkan verəcək səviyyədə olan kəşf qəti bilikdir, fenomendir. Bu, bu gün də elədir, bundan 100 il sonra da elə olacaqdır. Bu, bir az fəlsəfi və duyğu yüklü düşüncə tərzi kimi görünə bilər, ancaq bu, biz türklərin təbiətidir. Bir amerikalı və ya bir ingilis bu kəşfi etsəydi, hesab edirəm ki, mənim qədər sevinərdi, ancaq mənim etdiyim kimi müqayisələr etməyi düşünməzdi. Onların şəxsiyyəti və düşüncə tərzi fərqlidir”.

**Aziz Sancarın elmi uğurlarında millətsevərlik amilinin rolu az deyildir.** Professor Aziz Sancar ilk türk kimi elm üzrə Nobel mükafatını almaqla Azərbaycan da daxil olmaqla, bütövlükdə Türk dünyasının dünya elminin zirvəsində təmsil olunmasını təmin etmişdir. Aziz Sancar kimya üzrə Nobel mükafatını alana qədər biz hər zaman məlum xalqların nümayəndələrinin bu mükafatı almasından danışırdıq. Ancaq Aziz Sancar, “Nobel bioqrafiyası”nda da işarə etdiyi kimi, bütün dünyaya sübut etdi ki, türk millətinin içindən də belə alimlər çıxa bilər və bu, heç kimdə təəccüb doğurmamalıdır. Elə məhz buna görədir ki, bu gün bütün türk ellərində Aziz Sancar adı çox böyük sevgi, məhəbbət, ehtiramla çəkilir və müxtəlif formalarda əbədiləşdirilir. Aziz Sancar vətəninin və millətinin yüksəlişinə böyük önəm verən, milli qürur və ləyaqəti daim öndə tutan həqiqi bir vətənsevərdir.

Nobel alması xəbərini ilk növbədə vətəni Türkiyə ilə bölüşən Sancar millətsevərliyi, bir növ, özünəhörmət kimi qəbul edir: "Hörmət görmək istəyirsinizsə, öncə özünüzə hörmət etməlisiniz. Biz hamıdan üstün deyilik, ancaq heç kimdən də aşağı deyilik. Özümüzlə fəxr edək ki, başqası da bizə hörmət göstərsin. Mən belə birisiyəm". Sancar bir türk olsa da, bu gün bir ABŞ professorudur və Nobel mükafatını da ABŞ Şimali Karolina Universitetinin professoru kimi almışdır. Ancaq Sancar vətəninə, milli kimliyinə o qədər bağlı insandır ki, Nobel mükafatını aldıqdan sonra dünyada daha çox elm üzrə Nobel mükafatı alan ilk türk kimi tanınmağa başladı. Nobel mükafatını təqdimetmə mərasiminə üzərində Osmanlı möhürlü naxışları olan qalstuku ilə gələn Sancar burada da bir türk kimi qarşılanır. Belə ki, mükafatın təqdim edilməsi mərasimində İsveç Kralı XVI Qustav ona türk mədəniyyətində xüsusi yeri olan lalə gülləri təqdim edir, çalınan musiqi isə Motsartın "Türk marşı" olur.

Nobel mükafatlarının təqdimetmə mərasimində mühüm məqamlardan biri də mükafatı qazananların verdiyi "Nobel dərsi"dir. Sancar bu dərsi də, bir növ, milli məsuliyyət hissi altında verir. O, UNEC-dəki çıxışında bəyan etdi ki, "Nobel dərsi"ni verdiyim zaman bir anda onları layiqincə təmsil etdiyim üçün bütün Türk dünyasına borcumu ödədiyimi hiss etdim və o an mənim ən xoşbəxt anlarımdan biri idi. Sancar Nobel mükafatı almasına baxmayaraq, bir alim kimi onun üçün ən böyük mükafatı belə açıqlayır: "Mənim üçün ən böyük mükafat türk tədqiqatçıların biologiya, genetika və ya molekulyar biologiya kitablarında mənim kəşflərimə rast gəlmələri, "bunları bir türk kəşf etdi" demələridir". Bu fikirlərdən açıq şəkildə görünür ki, Sancarın uzunmüddətli və gərgin tədqiqatlarında əsas motivasiya mənbə-lərindən biri də məhz türk millətinin adını dünya elm xəzinəsinə yazdırma və bu millətin gələcək nəsillərini bu xəzinəni zənginləşdirmə yolunda cəsarətləndirmə istəyidir.

**Aziz Sancar İslam dünyasında elmi inkişafdan da danışmışdır.** Hər bir müsəlman və türk aydını kimi, Aziz Sancar da İslam dünyasında, eləcə də vətəni Türkiyədə elmin nə üçün inkişaf etmiş Qərbdən bu qədər geri qaldığı üzərində düşünür və bu barədə fikirlərini dilə gətirir. Müsahibələrindən birində bu haqda deyir: "Təkcə Türkiyədə deyil, bütövlükdə İslam dünyasında son 500 ildə elmə elə bir ciddi xidmət yoxdur. Elmlə məşğul olmaq, elm mədəniyyətini inkişaf etdirmək, bir növ, ənənə olmalıdır. Bunu Türkiyədə inkişaf etdirmək lazımdır. Yəhudi qardaşlarımız dünya əhalisinin 2%-ni təşkil edir, ancaq Nobel mükafatlarının 20%-ni qazanıblar. Onlar digər insanlardan daha üstün zəkaya sahibdirlərmi? Xeyr. Onların mədəniyyətində elmə, təhsilə əhəmiyyət verilir". Yenə də klassik sual ortaya çıxır: bəs nə etməli? Sancara görə, övladlarımıza uşaq vaxtından elm sevgisi və mədəniyyəti aşılamağa başlamaq lazımdır: "Uşaqlarımıza elmi sevdirmək lazımdır. Uşaqlarımızı fizika, kimya, biologiya və texnologiya sahələrinə təşviq etmək lazımdır. Çox gənc yaşlarında onlarda sınaq keçirmək vərdişi yaratmalıyıq. Sınaq keçirməyə vərdiş edən insan düşünəcək və bu, vərdiş halını alacaq. Bunu bir ənənə halına gətirməliyik. Hər şeyi dövlətdən gözləməməliyik. Bunun məsuliyyəti mühüm dərəcədə də valideynlərin üzərinə düşür". Övladlarımıza elm sevgisi və mədəniyyəti aşılayacaq olanlar bir tərəfdən valideynlərdirsə, digər tərəfdən də müəllimlərdir. Müəllimlərin cəmiyyətdəki statusu yüksəldilməli, onlara elmli və bilikli nəsil yetişdirmək üçün hər cür şərait yaradılmalıdır. Sancara görə, təəssüf ki, bu gün müəllimlərə yetərincə dəyər verilmir:

"Müəllimlər dünyanın hər tərəfində az təqdir edilir. Amerikada da, Avropada da, burada da belədir. Təəssüf ki, dünyanın hər tərəfində müəllimlər təqdir edilmir. Bu bizə məxsus bir cəhət deyil. Onlar uşaqlarımızı, sabahın insanlarını yetişdirən şəxslərdir. Onlara daha çox dəyər vermək lazımdır. Dünyaya təkrar gəlsəm, müəllim olmaq istərdim. Çünki gələcəyi onlar qurur, onlar yaradır. Məncə, müəllimlərin həkimlər qədər maaş almaq haqqı var".

İslam dünyası üçün zəruri olan digər bir sual da "hansı elmlərə daha çox üstünlük verilməlidir" sualıdır. Aziz Sancarın bu suala birmənalı olaraq cavabı belədir: fundamental elmlərə. Həqiqətən də bu gün İslam dünyasına nəzər yetirdikdə fundamental elm sahələrində daha çox geridə qaldıqları, inkişafın isə daha çox bu elmlərə bağlı olduğu qənaətinə varmaq çətin deyildir. Fikrimizcə, bu barədə Sancarın İstanbul Aydın Universiteti Elm və Texnologiya Mərkəzinin açılışında ifadə etdiyi bu fikirlərə diqqət yetirmək faydalıdır: "Hər universiteti ziyarət edərkən deyirəm: Türkiyənin inkişafı, Avropa və Amerika ilə eyni səviyyədə olması üçün fundamental elmə əhəmiyyət verməli, fundamental elmdə insan yetişdirməliyik. Texnologiya, təbii ki, çox vacibdir, texnologiyanın təməlində fundamental elm dayanır. Burada bir sıra müasir cihaz gördüm, bunların üzərində xarici ölkələrin markası var. İnşallah, bu məhsulları biz istehsal edərik. Fundamental elmdən ən son dərmanları istehsal etməyə, avtomobillər istehsal etməyə, təyyarələr yaratmağa qədər bütün mərhələdə öz məhsulumuz olar. Bunu bacardığımız vaxt özümüzü Avropa və Amerika səviyyəsində hesab edə bilərik. Yoxsa biz xaricdən material, maşın idxal edib burada Avropa və Amerika ilə yarışa bilmərik. Bunu təkrar edirəm, biz mütləq bunları istehsal etməliyik. Yoxsa xaricdən asılı vəziyyətdə qalarıq. Bu bizim sürətimizi yavaşladır. 2023 düşüncəmiz var. Respublikanın 100-cü ilində bizim Atatürkə, atalarımıza borcumuz var. Biz Avropa və Amerika səviyyəsində olmalıyıq, bu bizim namus borcumuzdur, vəfa borcumuzdur".

**Aziz Sancar eyni zamanda xeyriyyəçi fəaliyyətlər ilə məşğuldur.** Sancar quru millətpərvər deyil, eyni zamanda bu yolda malını-mülkünü sərf edən insandır. 2007-ci ildə Vehbi Koç Fondu Sancarı 100 min dollarlıq Vehbi Koç mükafatına layiq görür. Sancar buna 100 min dollar da öz vəsaitini əlavə edir və Şimali Karolinada uzun müddətdir xəyal etdiyi "Türk Evi"ni qurur. O, Nobeldən əldə etdiyi 325 min dollarlıq pul mükafatının da xərcləri çıxdıqdan sonra 315 min dollarını məhz bu evə bağışlayır. Bu gün Şimali Karolinada uğurla fəaliyyət göstərən "Türk Evi" türk tələbələrin qalması üçün istifadə edilir və Türkiyənin tanıtımına xidmət edir. Sancar "Türk Evi"ni yaratmaqla yanaşı, xanımı ilə birlikdə ABŞ-da oxuyan türk tələbələrə yardım etmək və türk-amerikalı əlaqələrini inkişaf etdirmək məqsədilə "Aziz and Gwen Sancar Fondu"nu da qurmuş və hazırda bu fond vasitəsilə bir çox xeyriyyə layihələrini həyata keçirir.

**Gələcəyin elm adamlarına Aziz Sancardan 15 tövsiyə.** Aziz Sancarın bütün elm adamlarına, xüsusilə də gənc elm adamlarına çox önəmli tövsiyələri var. Aziz Sancar deyir ki:

1. Oxumaqla yanaşı, düşünmək üçün də özünüzə vaxt ayırın.
2. Çox vaxt və əziyyət tələb etsə də, analitik və kreativ düşünmə bacarığı əldə edin.
3. Elm adamı kimi yaxşı karyera əldə etmək üçün uzun illər tələb olunduğunu və bu istiqamətdə çalışmanın davamlı proses olduğunu bilin.
4. Elm adamı kimi yetişmə prosesində hər addımda sizin inkişafınıza kömək edəcək yaxşı məsləhətçilər və müəllimlər

tapın.

5. Təhsil almaq və tədqiqat aparmaq üçün xaricə gedin, ancaq sonra mütləq ölkənizə qayıdın.

6. Üzərində tədqiqat aparacağınız bir mövzu müəyyən edin, mövcud ədəbiyyatı da araşdırın, tələb olunan qədər öyrənin.

7. Uğurlu elm adamında üç təməl xüsusiyyət olmalıdır: biliyə əsaslanan yaradıcılıq, ciddi çalışmaq və uğursuzluq qarşısında dirənmək.

8. Uğur zəka ilə bağlı olduğu qədər də çalışmaqla əldə edilir. Bunun üçün səbat lazımdır, inad etmək lazımdır və çalışmaq lazımdır.

9. Birincisi, çox çalışmaq, ikincisi, ətrafınızda mövzunuzla əlaqəli hadisələri izləmək, üçüncüsü, ən müasir texnologiyanı öyrənərək öz işinizə tətbiq etmək. Mənim uğurumun addımları bunlardır.

10. Özünüzdən razı olmayın. Özündən razı olmaq Allaha yaraşır, insana yaraşmaz. Əlinizdən gəldiyi qədər təvazökar olun.

11. Elm könül işidir, fədakarlıq işidir, maraq işidir, məmləkətinə-insanına xidmət işidir. Yəni elmə pul qazanmaq üçün gəlməyin.

12. Elmdə heç vaxt ümidsizliyə qapılmayın. Nobel aldıqdan sonra yaxşı bir jurnala göndərdiyim məqalə 4 resenzentdən 8 səhifə tənqid yazılaraq rədd edilmişdi. Yəni Nobel alanın belə məqaləsi rədd edilə bilər. Siz yaxşı tədqiqat aparsanız, əvvəl-axır mükafatınızı alacaqsınız.

13. Gündəlik siyasətlə, dedi-qodularla məşğul olmayın, onunla məşğul olanlar var. Məmləkətə xidmət üçün elm lazımdır, Avropa və Amerika səviyyəsinə gəlmək üçün elm lazımdır.

14. Vətən sevgisi olmasaydı, bu səviyyələrə gələ bilməzdim. Çox çalışın, övladlarınıza da həm çox çalışmağı, həm də vətən sevgisini öyrədin. Məmləkətinə faydalı olan bütün dünyaya faydalı olar.

15. Nobel mükafatı qazanmaqdan daha önəmli şeylər var: insanın ailəsi, insanlıq və ölkəsinə xidmət etməsi.

"Azərbaycandan da tələbəmin olmasını istəyirəm", - deyən Aziz Sancar bir həftəlik səfəri boyunca hər fürsətdə Azərbaycana olan sevgisini, ehtiramını ifadə etməkdən geri qalmadı. Azərbaycanı Türkiyə qədər sevdiyini, onun daha da inkişaf etməsini istədiyini dilə gətirdi. O, xüsusilə Azərbaycanda elmin və təhsilin inkişafı üçün əlindən gələn yardımı göstərəcəyini vurğuladı və bu istiqamətdə konkret təklif də irəli sürdü: "Hazırda mənim laboratoriyamda çoxlu millətlərin nümayəndələri çalışır. Bunlar arasında Türkiyədən, digər türk toplumlarından da gənclər var. Ancaq Azərbaycandan tələbəm yoxdur. Çox arzu edirəm ki, bu tələbələrim arasında Azərbaycandan da biri olsun. Əgər mənim laboratoriyama belə bir tələbə göndərə bilsəniz, mən onu yetişdirərəm və bunun gələcəkdə Azərbaycana çox faydası olar".



# ALİ TƏHSİLİN İNTEQRASİYA HƏDƏFLƏRİ: YENİ NƏSİL UNİVERSİTETLƏRİN YARANMASI GERÇƏKLİYİ

**Cəsarət Valehov,**
***filologiya üzrə fəlsəfə doktoru, dosent***

İnkişafın müasir anatomiyası o təsbitlə bağlıdır ki, hər bir cəmiyyətin tərəqqisi, rifahı halı, rəqabətlilik immuniteti həmin sosiumun biliklər iqtisadiyyatına verə bildiyi töhfə, yeni texnologiyalara sahiblənmə əmsalı ilə bağlıdır. Bu anlamda beynəlxalq aləmdə rəqabətəqabil məzunlar yetişdirmə gücü olan, biliyi toplumun əsas öhdəliklərinin gerçəkləşməsində aktiv olaraq tətbiq edə biləcək ali təhsil qurumlarının formalaşması əsas məsələlərdəndir. Beləki, müasir dövrdə keyfiyyətli insan gücü yetişdirən, elmi araşdırma fəaliyyətini yürüdən və toplumun əsas inkişaf alqoritmlərini ifadə edən başlıca təsisatlar universitetlərdir.

Bütün dünyada olduğu kimi, Azərbaycanda da universitetlərə yönələn əsas çağırışlar

a) məzunları əmək bazarının daim dəyişən tələblərini qarşılaya bilirmi?

b) yetərli keyfiyyət və kəmiyyətdə xidmət alqoritmini təşkil edə bilirmi? düşüncəsidir.

Son 20-30 il ərzində dünyanın inkişaf etmiş ölkələri yeni nəsil universitetlərinə (3.0 konsepti) transformasiya islahatları aparıb. Bir tərəfdən toplumun ali təhsil qarşısında artan və çeşidlənən tələblərinə cavab vermək, digər tərəfdən qloballaşmanın fürsət və təhdidlərini qarşılamaq bu islahatların əsas fəlsəfi mahiyyətini təşkil edib. Bu məqalədə universitetlərin tarixən keçdiyi inkişaf yoluna qısa nəzər salınaraq yeni nəsil universitetlərin qarşısında duran əsas hədəflər (o cümlədən Azərbaycan təcrübəsində) təhlil olunur.

***Açar sözlər:*** *biliklər cəmiyyəti, 3-cü nəsil universitet, biliklərin kommersiyalaşması, innovasiyalar, publik hüquqi şəxslər.*

***Ключевые слова:*** *общество знаний, университет 3-го поколения, коммерциализация знаний, инновации, публико-юридическое лицо.*

***Key words:*** *knowledge society, 3rd generation university, commercialization of knowledge, innovations, legal entities of public law.*

Biliyin fərddən-fərdə və nəsildən-nəslə ötürülməsi insanı fərqləndirən və mədəniyyətin formalaşmasını təmin edən həlledici xüsusiyyətdir. Tarix boyu yazının icadı, mətbəənin ixtirası, internetin inkişafı kimi biliklərə yiyələnmə ilə bağlı əldə edilən nailiyyətlər bu tələbatın daha effektiv şəkildə reallaşdırılmasına birbaşa xidmət edib. İnsanların öz biliklərini artırmaq, qorumaq və paylaşmaq məqsədi ilə məktəblər və digər sosial quruluşlar təsis etmələri isə tarixin yazıya alındığı ilk dövrlərə qədər gedib çatan qədim ənənədir. Avropada modern tipli universitetlərin meydana gəldiyi XII əsrə qədər bir çox cəmiyyətlər öz təhsil sistemlərini formalaşdırmış, təcrübəsini bir-biri ilə paylaşmaqla, sözügedən sosial quruluşların inkişafına

xidmət etmişdir.

Professor Hans Vissema keçdiyi inkişaf yoluna uyğun olaraq, universitetləri üç mərhələyə ayırır: 1.0 (tədris) universiteti və ya "orta əsr universiteti", 2.0 (tədris-araşdırma) universiteti və ya "Humbolt tipli universitet" və 3.0 (tədris-araşdırma-nəticələrin kommerisyalaşması) universiteti (1).

Birinci nəsil universitetlərinin başlıca missiyası - kilsənin və dövlətin tələblərinə cavab verən mütəxəssislər yetişdirmək və antik biliklərə yiyələnmək öhdəliyi idi.

İkinci nəsil universitetlərinin ilk örnəyi 1810-cu ildə Berlində Prussiyanın təhsil naziri Vilhelm fon Humboltun təşəbbüsü ilə qurulan Humbolt universitetidir. XIX-XX əsrlər boyu universitetin Humbolt modeli (təhsil-tədqiqat) hakim olub. Bolonya universitetinin yaranmasından Humbolt universitetinin təşəkkülünədək olan 700 illik dövr ərzində Avropa fəlsəfə, təbiət elmləri və texnologiya sahəsində böyük inkişaf yolu qət etmişdi.

Və nəhayət 3.0 konseptinə keçməzdən öncə müasir universitetin təşəkkül tarixnə diqqət edək.

Modern universitetin əcdadı sayılan Bolonya universitetinin əsası 1088-ci ildə İtaliyada qoyulmuşdur. Orta əsrlərdə Qərbdə hökm sürən dini anlayışa uyğun olaraq, cəmiyyətin təhsil ehtiyacları XII əsrə qədər kilsə məktəblərinin hesabına qarşılanmışdır. O dövrdə təhsil dinin ayrılmaz bir elementi sayılırdı, ağılın və doqmanın göstəricisi idi, elə buna görə də həmin dövrün şərtlərinə əsasən, cəmiyyətdə bilik mübadiləsi kilsənin birbaşa nəzarətində idi. Bu baxımdan ilk universitetlərin məhz kilsənin nəzdində fəaliyyət göstərən qurumlardan təşkili faktı təbii hal kimi dəyərləndirilməlidir.

İlk universitetlər tək və ortaq bir model əsasında qurulmamışdır. Məsələn, Bolonya (1088-ci il) universitetində tələbələr təhsilin maliyyələşməsini öz vəsaitləri hesabına qarşılayırdılar. Paris universitetinin (1200-cü il) tələbələrinin təhsil xərclərini kilsə təmin edirdi. 1096-cı ildə qurulan Oksford universitetindəki təhsil prosesi isə kilsə və dövlət tərəfindən həm mənəvi, həm də maliyyə dəstəyi görürdü və bu cəhətlərinə görə sonradan qurulan universitetlər üçün bir nümunəyə çevrilmişdir.

Bolonya universitetinin ardınca bir neçə əsr boyu bütün Avropada universitetlərin sayı sürətlə artdı. XII yüzildə sadəcə 2 universitetin qurulduğu Avropa qitəsində XIII əsrdə 17, XIV əsrdə 22, XV əsrdə 38, XVI əsrdə 61, XVII əsrdə 37, XVIII əsrdə 24, XIX əsrdə 58 yeni universitet fəaliyyətə başlamışdı.

Bu məqamda kilsənin öz sxolastik təlimini gücləndirmək və bundan ötrü təhsilli insan qaynaqlarını təmin etmək kimi praktik məqsədlər baxımından ilk universitetləri dəstəklədiyinə diqqəti çəkmək lazımdır. Bu məqsədlə də universitetlərin ilk maliyyə tərəfdaşları arasında əsas mərkəz kilsə olmuşdur. "Universitetlərin kilsə xarakteri əsasən Fransa inqilabına qədər qorunaraq (2, 45) öz təsirini XX əsrədək davam etdirir. Bu dövrədək Papanın və ya kralların rəsmi icazəsi olmadan qurulan heç bir universitetə rast gəlinmir. Məhz belə bir rəsmi icazənin yoxluğu Lion və Reym şəhərlərində təsis edilən bir sıra təhsil müəssisəsinin universitet statusu qazanmasına mane olmuşdur.

Orta əsrlərdə Avropa cəmiyyətinin təhsilə olan tələbatının yenə də kilsə strukturu daxilində qurulan kafedral məktəblər hesabına qarşılandığı və universitet anlayışının formalaşmasında bu təhsil ənənəsinin təsiri danılmazdır. Ona görə də orta əsrlərdə "universitet" termini hələ də bugünkü mənasında işlənmirdi, o, firma, icma (topluluq, cameə) və dərnək (lonca, assosiasiya)

kimi peşə-sənət birliklərinin hamısını ifadə edən universal bir termin idi. Başqa sözlə desək, “universitet” fiziki bir sahəni deyil, icmanı assosiasiya edirdi. “Universitet sonuncu min il ərzində fundamental strukturunu, baza sosial rolu və funksiyasını qoruyub saxlayan yeganə avropa institutu olub” (3).

Buna görə də, universitetin meydana çıxma faktı tarixi kontekstdə nəzərdən keçirilərsə, orta əsr universitetlərinin birbaşa təhsili inkişaf etdirən təşkilatlar kimi təsis edilmədikləri, ictimai baxımdan müəllim və tələbələrin təşkilatlanmasını təmin etməklə yanaşı, o dövrün peşə, ticarət, dərnək sistemləri örnək alınmaqla ortaya çıxdıqları diqqəti çəkir. Bəzi araşdırmaçılara görə, orta əsr universitetləri mövcudluğu baxımından belə təsadüfən formalaşan şərtlərin kombinasiyasına borcludur.

“Universitet” anlayışının orta əsrlərdə daşıdığı mahiyyət və o dövrdə təşkilatlanma vasitəsi kimi oynadığı rol birgə dəyərləndirilərsə, ilk nəsil universitetlərinin müəyyən mənada ictimai maraqların ifadəçisi kimi ortaya çıxdığı nəzərə çarpar.

Sözügedən dövrdə universitetlərin başlıca məqsədi kilsənin və dövlətin tələbatlarına cavab verən mütəxəssislər yetişdirmək, elmi araşdırmalar aparmaq, cəmiyyətin inkişafına nail olmaq və antik biliklərə sahiblənmək idi. Bu öhdəliklər universitetin başlıca missiyasına- yeniliklərin lokomotivi olmağa zəmin yaradırdı. Bu səbədən idi ki, dövrünün bir çox yeniliklərinin ilk təsis məkanı universitetlər idi. Məsələn, “1583- cü ildə Kembric universitetinin əməkdaşı Villiyam Lee toxucu makinasını yaradaraq dövrünün inqilabi texnologiyasını yaratdı” (4.172).

Filosof Şleyermaxer Humbolt universitetinin strukturunda əsas götürülən biliyin birtərəfli qaydada ötürülməsi metodunu tənqid etmiş, tələbələrin düşüncəsində elmi fikirlərin canlanması baxımından onlara cəsarət aşılanmasının və biliyin necə ortaya çıxdığını nümunələrlə izah edilməsinin vacibliyini məqsədəuyğun saymışdır. Universitetin Humbolt modeli o dövrün və sonrakı dövrlərin ali təhsil standartını müəyyən edirdi.

Bu yanaşma, bir tərəfdən Humbolt modelinin universitetin empirik biliklərə əsaslanan, ortaq təcrübə toplamağa və praktikaya söykənən təhsil modelini təsdiqləyir, digər tərəfdən isə əsrlər boyu davam edən doqmaların (ehkamların) elm üzərindəki basqısının ortadan qalxdığını, maarifçilik dövrü fəlsəfəsinin artıq universitetlərdə də dominant olduğunu isbatlayırdı.

İkinci nəsil universitetlərində təcrübə və müşahidənin əhəmiyyəti get-gedə artırdı. Ancaq bu heç də araşdırmaların birinci nəsil universitetlərdə deyil, ancaq ikinci nəsil universitetlərdə aparıldığı anlamına gəlməmlidir.

Birinci nəsil universitetlərin əsas funksiyası zaman ilə ayaqlaşan, kamil filosoflar və elm xadimləri yetişdirməkdən ibarət olub. Zaman ötdükcə, bu funksiya sadəcə köhnə biliklərin tədrisi ilə yanaşı, yeni biliklərin əldə edilməsini təmin edəcək səviyyəyə yüksəldi, araşdırmanın daha da sərbəstləşməsinə şərait yaratdı.

Araşdırma fəaliyyətinin funksional baxımdan sərbəstlik qazanması tədris funksiyasının təsir gücünü və ya əhəmiyyətini azaltmadı, bu iki anlayışın sintezini yaradan mühitin formalaşmasını təmin etdi.

Digər tərəfdən birinci nəsil universitetlərinin özünə qapalı özəlliyinin ikinci nəsil universitetlərdə tam dəyişikliyə uğradığını da söyləmək doğru olmaz. İkinci nəsil universitetlərinin timsalında təhsil ictimai missiya kimi dəyərləndirilərək, ali

təhsil imkanı istənilən təbəqəyə aid insanın faydalana biləcəyi bir status qazandı və universitet məzunları vasitəsi ilə bütün cəmiyyətə təsir edəcək gücə çevrildi.

Cəmiyyətin yüksəlişinə təminat verən qurumlar kimi universitetlər XX əsrin ortalarınadək bu rollarını qoruyub saxladılar. Digər tərəfdən, ikinci nəsil universitet öyrənmə müstəvisində tələbə və pedaqoqu bilik istehsalının az qala bərabərhüquqlu elementi halına gətirmişdir.

Professor Hans Vissema universitetlərin transformasiyalarını araşdırarkən onlar arasında keçid dövrlərinin mövcudluğunu da nəzərə alır, üçüncü nəsil universitetlərinin isə fərqli bir keçid mərhələsində olduğunu vurğulayırdı. Vissemanın təklif etdiyi bu model tarixi materializmə əsaslanır və universitetlərin tarixi-ictimai kontekstdə necə dəyişib inkişaf etdiyini və hansı modullarla gələcəyə gedəcəyini ifadə edir:




***Şəkil 1.***

Bu şəkildən də göründüyü kimi, 3-cü nəsil universitetlərinə yeni iqtisadi kontekstdə baxılmalı, eyni zamanda bu tip universitetlərin inkişaf trendlərini formalaşdıran faktorları aşağıdakı kimi təsnif etmək olar:

1. Ali təhsilin kütləvilik qazanması;
2. Qloballaşma;
3. Fənlərarası tədqiqatların spektrinin genişlənməsi;
4. Biliklərin dərinləşdirilməsi modeli kimi araşdırmaların geniş tətbiqi;
5. Xərclərin artması;
6. Universitetdənkənar sektorların bilik mübadiləsində iştirak sərbəstliyi;
7. İnnovasiya kontekstində fərdiliyin genişlənməsi;
8. Peşəkar idarəetməyə tələbatın artması.

XX əsrin ikinci yarısından etibarən formalaşmağa başlayan biliklər cəmiyyətində universitet yeni və fərqli funksiyaları yerinə yetirməli idi. Belə ki, biliklər cəmiyyəti hər şeyin idrakla dərk edilə bildiyi və biliyin insanlara daha çox fayda verəcəyi bir mərhələdir. Bu transformasiyada universitetlər vacib həlqəni təşkil edir. Xüsusilə, bu 3-cü nəsil universitetlərindən olan gözləntidə daha böyükdür.

Biliklərə əsaslanan iqtisadiyyatda universitetlər – təhsil, tədqiqat və biliklərin kommersiyalaşması missiyasına uyğun fəaliyyət çevrəsinə malik olur. 3-cü nəsil universitetlərinin ilk yaranma prosesi ABŞ-da olub. ABŞ-da 1980-ci ildə qəbul olunan Bey-Doul qanunundan sonra universitetlərdə texnologiyaların kommersiyalaşması ilə məşğul olan minlərlə şirkət yarandı. Bu gün Birləşmiş Ştatlarda əksər aparıcı sənaye sahələrinin formalaşmasının 80%-dən çoxu universitetlərdə icad edilən yeniliklərlə bağlıdır. Bu, ABŞ universitetlərinin keçdiyi tarixi təkamül prosesinin məntiqi yekunu olmaqla, təkcə ABŞ-da deyil, bütün dünyada ali təhsildə qlobal trendlərin formalaşmasında zəmin rolunu oynayıb. Təqdim olunan cədvəldə bu prosesin ayr-ayrı hissələri təsvir olunur:

**Ali təhsildə qlobal meyllər**

| # | Mövzular | Meyllər |
|---|---|---|
| **1** | Ali təhsilin qloballaşması | 1. Müəllim və tələbələrin mobilliyi artır<br>2. Universitetlər xarici ölkələrdə öz kampuslarını açırlar<br>3. Yüksək ixtisaslı kadrların cəlb olunması üçün tək ölkə daxilində deyil, xaricə doğru da baxılır<br>4. Tədrisdə ingilis dilinin rolu artır |
| **2** | Qeyri-ənənəvi təhsil ocaqlarının yaradılması | Korporativ universitetlər, ixtisaslaşmış dar fokusu olan tədqiqat mərkəzləri, onlayn universitetlər yaradılır |
| **3** | Maliyyə mənbələrinin diversifikasiyası və rəqabətin güclənməsi | 1. Maliyyələşmədə dövlətin payının azalması və rentabelliyin azalması<br>2. Aqressiv fandreyzinq kampaniyaların aparılması ilə maliyyə uğrunda rəqabətin sərtləşməsi |
| **4** | Fənlərarası mövzulara diqqətin artması | Kafedraların süqutu və fənnlərarası fəaliyyətin və əməkdaşlığın güclənməsi |
| **5** | Universitetlərlə xarici tərəfdaşlar arasında əlaqələrin artması | 1. İqtisadi sahələrlə, biznes ictimaiyyəti ilə əməkdaşlığın rolunun artması<br>2. Məzunların Universitetlərə daha çox yaxınlaşdırılması |
| **6** | “Akademik istiqamət” və tələbələr anlayışının mənasının dəyişməsi | 1. “Rəqəmsal” tələbələrin artması və ya daha çox onlayn təhsilə doğru dəyişiklik<br>2. Ənənəvi ali təhsil piramidasından (bakalavr – magistr – fəlsəfə doktoru) müxtəlif diffuz olunmuş akademik dərəcə proqramlarını təklif edən sistemə keçid<br>3. İxtisasartırma və əlavə təhsilə investisiyaların və tələbin artması<br>4. Tələbə qəbulu üzrə meyarların dəyişməsi və daha çox inklyuzivliyin təmin olunması |
| **7** | Ali təhsil rəhbərliyinin professionallaşması | 1. Müəllim-professor, inzibatçı və tərəfdaşlıqların fəaliyyət nəticələrinə görə ödənilməsi<br>2. Müəllim-professor heyətinin müxtəlif kateqoriyalara ayrılması (tədqiqat, tədris, tətbiqi və ümumi ixtisaslı )<br>3. Strategiya, planlaşdırma, əsas prosesləri dəstəkləmək üçün peşəkar menecerlərin cəlb olunması |

***Şəkil 2.***

Qeyd olunan bu çərçivə yeni nəsil universitetlərinin yaranması üçün tarixi təkamülün bazisi və perspektiv tərəqqi xəttini təmin edəcək invariantlardır.

Bu çərçivədən Azərbaycan universitetlərinin transformasiyasına baxdıqda məqsədin innovativ inkişaf olduğunu hədəf götürərək yeni ekosistemin yaranmasına ehtiyac vardır. Bu mərhələdə Azərbaycan universitetlərinin idarəetmə fəlsəfəsində baş verən dəyişikliklər (publik hüquqi şəxslərin yaranması) həmin qurumların innovasiyalı inkişafda və beləliklə, iqtisadi artımda

həlledici roluna zəmin yaratmalıdır. Deməli, universitetlərin sosial-iqtisadi funksiyalarının dəyişməsi qaçılmazdır. Təkcə, təhsil və elm funksiyaları deyil, iqtisadi artımın təmin olunmasında da universitet yeni funksionallıq qazanır. Bu da 3-cü nəsil universitetin yarada biləcəyi ekosistemdir. Professor Kamran İmanovun təbirincə desək, "biliklər iqtisadiyyatında universitetlər korporativ subyektlərə çevrilərək, "Universitet 3.0" adını əldə etmişlər və onların adındakı rəqəm şəklində informasiyalı metaforanın məntiqi universitetin missiyasının sayını nəzərdə tutur: 1.0-yalnız təhsil, 2.0-təhsil və tədqiqatlar, 3.0-təhsil, tədqiqatlar və biliklərin kommersiyalaşması (5, 8).

Professor Kamran İmanov Azərbaycanda 3-cü nəsil universitetlərinin yaranma gerçəkliyini aşağıdakı kimi təsvir edir: "Azərbaycan üçün 3.0 universitetlərinin təkamülü ciddi sosial və iqtisadi problemdir. Belə ki, bu növ univeristetlər bu gün cəmiyyətin modernləşdirilməsində və bilik iqtisadiyyatına transformasiyasında aparıcı rol oynamalıdırlar. Digər vacib amil isə əqli mülkiyyətin müasir "biliklər cəmiyyət"ində dəyişən rolu ilə bağlıdır" (5, 10).

"Azərbaycan universitetlərinin 3-cü nəsil konseptinə uyğunluğu" mövzusunda aparılan sorğu maraqlı nəticələrlə yekunlaşıb. BDU, UNEC, Azərbaycan Texniki Universiteti və Mingəçevir Dövlət Universitetinin professor-müəllim heyəti arasında keçirilən sorğunun nəticələrini təqdim edirik. Diaqramlardan da göründüyü kimi "çalışdığınız universitet 3.0 konseptinə uyğundurmu?" sualına paytaxt ali məktəblərinin professor-müəllim heyəti təxminən eyni cavabı veriblər. Ancaq "universitet sənaye işbirliyi" diaqramında qeyd olunan məsələyə (universitetlərdə tədqiqat-ların kommersiyalaşması uğurla aparılır sualına) əvvəlki diaqramdakından fərqli cavab verilir. Problem ondadır ki, universitetlərdə çalışan müəllim heyəti 3.0 universiteti haqqında demək olar ki, məlumatlı deyillər və 3-cü nəsil universitetlərinin əsas mahiyyətinin tədqiqatların kommersiyalaşması olduğunu yaqinləşdirə bilmirlər. Mingəçevir Dövlət Universitetində sorğuya cəlb olunan müəllim heyəti ümumiyyətlə, 3.0 universitetlərinin nə anlam daşıdığını qeyd etməyiblər. Ancaq yaxşı hal ondan ibarətdir ki, 4 universitetin sorğuya cəlb olunan əməkdaşları mənsub olduqları universitetlərdə texnoparkların yaradılmasını təqdir edir və birmənalı qeyd edirlər ki, universitetlər iqtisadi resurslar yaratmalıdırlar.



## Azərbaycan Texniki Universiteti




## Bakı Dövlət Universiteti




## Mingəçevir Dövlət Universiteti



Dünyanın nüfuzlu universitetləri üçün məşhur sloqan olan "iş yerini tutma, iş yeri yarat" düşüncəsi son illərdə Azərbaycanın bir çox universitetlərində (UNEC, ADNSU, BMU) yaranan startap ideyasının əsas fəlsəfəsidir. Bu yanaşma yeni nəsil universitetlərin yaranmasında sistemyaradıcı həlqə olaraq biliklərin kommersiyalaşmasına təkan verəcək. Doğrudur, ölkəmizin universitetlərində hələ də mövcud olan klassik universitet ənənəsinə uyğun olaraq tədiqiqatların kommersiyalaşması zəif inkişaf edib. Məsələn, Global İnnovation İndexdə universitet tədqiqatları dəyərləndirilməsinə görə Azərbaycan (2017-ci il) 70-ci yerdədir (6).

Ənənəvi (klassik) universitetlərin yeni nəsil universitet statusuna transferi bir çox hallarda uğurlu baş vermir. "İctimai dəyişikliklər zamanı universitetlərin rolu" adlı hesabatda məşhur sosioloq Ralf Dahrendorf qeyd etdiyi kimi, "Dəyişməyən universitetlər əsasən keçmişdə qalan və tükənmiş statusun, dünənki dünyanın mühafizə edildiyi qiymətli və effektsiz abidələrdir" (7).

Bu durum ən çox da özünə qapalı və cəmiyyətdən təcrid olunmuş universitetlər üçün bir təhlükədir.

Biliklər cəmiyyətində iqtisadi artım mərkəzi və innovasiyaların episentri sayılan universitetlərin cəmiyyətin bütün təbəqələri ilə daha yaxın və daha güclü əlaqələr qurması xüsusilə əhəmiyyətlidir. Yeni informasiya fəzasının yaradıcılarından biri olan Bill Qeytsin qeyd etdiyi kimi, "Rəqiblə mübarizənin ən yaxşı üsulu informasiya (burada hər informasiya bilik deyil, hər bilik informasiyadır tezisi qeyd olunmalıdır) ilə işləyə bilməkdir. İnformasiyanın toplanması, təşkili və istifadəsinin hansı keyfiyyətdə olması sizin qalib və ya məğlub olmağınızı şərtləndirir" (8, 199). Universitet istehsal etdiyi biliyi cəmiyyət ilə birgə çoxaltmağın, yaymağın və təkrar emal etməyin yollarını aramalıdır. Uzun müddət cəmiyyət qarşısında cavabdehlik tərzi ilə topladıqları gücdən sosiumun ehtiyaclarına uyğun şəkildə faydalanmayan müəssisələr zaman ötdükcə bu güclərini itirməyə məhkumdurlar.

Azərbaycanda 3-cü nəsil universitetlərinin yaranması üçün münbit zəminin formalaşmasında universitetlərin publik hüquqi şəxslərə çevrilməsi prosesi təkanverici rol oynayacaqdır. Bu həm yeni nəsil tədqiqat universitetlərinin yaranmasında, həm də universitetlərin ənənəvi (klassik) idarəetmədən uzaqlaşaraq hesabatlılığı təmin etməklə daha çevik idarəetmə formulunu tətbiq etməyə imkan verəcəkdir.

### UNİVERSİTETLƏR VƏ SOSİAL TƏSİR ASPEKTİ

Universitet cəmiyyətin formalaşdırdığı başqa qurumlar kimi daim sosiumla qarşılıqlı əlaqədədir və buna uyğun dəyişir. Başqa sözlə, cəmiyyət öz-özünü dəyişdirən daxili enerji qaynağına sahibdir. Onu formalaşdıran qurumların hər biri kiçik sosial institutlardır və universitet də bunlardan biridir. Onlar birlikdə ictimai dəyişiklikləri və bunun səbəb olduğu təsirləri necə idarə edəcəklərini bacarmalıdırlar.

Liberal iqtisadiyyatın bünövrə daşı sayılan sahibkarlıq qurumları ilə yanaşı, sosial institutlar da bu yeni mərhələdə özlərini təkcə iqtisadi gəlir nöqteyinəzərindən deyil, həm də ictimai mövqe baxımından da dəyərləndirməlidirlər. Sosial məsuliyyət ixtiyari institutun mənfəəti ilə yanaşı, cəmiyyətin sosial rifahının qorunmasında başlıca öhdəlikdir. Bu baxımdan bir çox tədqiqatçılar universitetin üçüncü funksiyası kimi iqtisadi artım gücünü qeyd etməklə yanaşı, bunun biliklər cəmiyyəti dövründə həm fərdi, həm də cəmiyyəti anlamaq, bu sahədə ictimai faydanı daha da artırmaq baxımından yetərli olmadığını göstərirlər. Beləki, XX əsrin sonlarından

başlayaraq, universitetlərin texnologiyanı paylaşma və yenilikçilik müstəvisində iqtisadiyyata, daha geniş miqyasda isə cəmiyyətə faydalı olmaqla üçüncü funksiyasına (iqtisadi artım) köklənməyə başladıqları bəllidir.

Bir daha qeyd edək ki, tarixi və ictimai mövqeyi baxımından ənənəvi universitet sosium üçün yaxşı təhsil görmüş elit insanlar yetişdirən və fəaliyyəti ilə cəmiyyətin inkişafına təkan verən bir təsisat olmuşdur. Sənaye cəmiyyətindən biliklər cəmiyyətinə keçiddə universitetin ənənəvi roluna kreativ iqtisadiyyatın yaranmasına dəstək vermək vəzifəsi də əlavə olunub. Bu ilk növbədə universitetlərin innovasiya sahibkarlığında yeni rolu ilə bağlıdır. Burada Azərbaycan təcrübəsinə nəzər yetirdikdə elmi tədqiqata nə qədər vəsait ayrılır? sualı aktualdır. Aşağıda təqdim olunan cədvəldən göründüyü kimi bu nisbət digər Avropa ölkələri ilə müqayisədə çox aşağıdır:




**(SOURCE: European Commission "European University Funding And Financial Autonomy", 2011)**

Bu nisbət həm də digər statistikada da öz yerini göstərir. Beləki Azərbaycanda bilik iqtisadiyyatına aid olan sahələrin ÜDM-dəki payı 8 % civarındadır. Digər bir göstərici - 2017-ci ilin ilk yarısına ola məlumata görə, Azərbaycanda 34 startap fəaliyyət göstərir, bu say Qazaxıstanda 166, Türkiyədə isə 2.226-dır (9). Bu fəaliyyətin ölkəmizin universitetlərində geniş spektrdə əhatə olunması üçün böyük potensial vardır. İnkişaf etməkdə olan ölkələrin qlobal rəqabətdəki yeni roluna diqqət etdikdə universitetin regional, sosial, iqtisadi və mədəni inkişafa təsiri daha böyük əhəmiyyət daşıyır.

Araşdırmanın giriş hissəsində bəhs edilən 8 başlıca prinsip diqqətə alınarsa, müasir universitetin sosiuma təsirinin daha da artırılmasına dəstək verən elementləri aşağıdakı kimi sadalaya bilərik:

1. İctimai fəaliyyətə açıq olmaq. Biliklər cəmiyyətinə verdiyi ictimai faydanı daha da artırmaq istəyən universitetin cəmiyyət ilə ikitərəfli və birbaşa bağlantı qurması şərtdir.
2. Universitet təhsil xidmətlərini çeşidlərə ayıraraq malik olduğu zəngin insan və infrastruktur mənbələri sayəsində daha geniş kütlələrin bunlardan faydalanmasının yollarını tapmalıdır.

Xüsusilə də, fəaliyyət göstərdiyi məkanın ictimai ehtiyaclarını təhlil edə bilən universitetin cəmiyyətin fərqli ictimai təbəqələrə və qruplara nüfuz edə bilməsi üçün təhsil fəaliyyətlərindən əlavə, daxili tərəfdaşları (stakeholder) sayılan tələbə, pedaqoq və valideynlərin ictimai problemlərlə daha sıx bağlantısını yaratması vacibdir.

Biliklər cəmiyyətinin bir xüsusiyyəti də qloballaşma və texnologiya sahəsində dəyişiklik tsikllərinin bundan əvvəlki min ildə olduğu kimi əsrlər boyu deyil, onillər ərzində baş verməsidir. Başqa sözlə, dəyişikliklər hər bir fərdin ömür müddətinə sığacaq qədər fasiləsiz xarakter daşıyır.

Bu mərhələdə ancaq təhsil və tədqiqat funksiyaları üzərində formalaşan ənənəvi universitet biliklər cəmiyyətinin tələblərinə cavab verməyəcək. Təhsilşünas Peter Drucker “ Gələcəyin toplumunda

idarəetmə" tədqiqatında qeyd etdiyi kimi, "biliyin yayılmasının asanlaşmasını və sürətini nəzərə alsaq, biliklər cəmiyyətindəki hər qurum-məktəblər, universitetlər qlobal olaraq rəqabət aparmaq gücündə olmalıdırlar" (10, 205 ).

Elə buna görə də, ənənəvi universitetin (2.0) ictimai faydası məzun yetişdirmə gücü ilə məhdudlaşdığı halda, yeni nəsil universitetlər (3.0 ) nəticələrin kommersiyalaşmasını həyata keçirməklə cəmiyyət qarşısında həm sosial məsuliyyətlilik baxımından, həm də yeni innovasiyalar yaratması baxımından rolunu dəyişir. Doğrudur, universitetlərdə nəticələrin kommersiyalaşmasına bir çox tədqiqatçılar ehtiyatla yanaşırlar. Məsələn, 2 dəfə Harvard universitetinin rektoru olmuş Derek Bok qeyd edir ki, "universitetlər buna çox ehtiyatla və uzaqgörənliklə yanaşmalıdırlar. Yoxsa ad hoc kommersiya təklifləri akademik həyatın əsaslarını sarsıda bilər. Nəticələrin kommersiyalaşmasını təkcə fayda tərəfindən deyil, gətirə biləcəyi təhdidlər tərəfindən də düşünmək lazımdır (11, 140.).

Dəyişən sosial-iqtisadi münasibətlərin universitetlərə təsiri getdikcə aşkar xarakter daşıyır. Buna görə də, dövlət yardımından asılılıq yeni nəsil universitetlərinin arxitektonikasının qurulmasında baza şərt hesab olunmur. Bu nəsil universitetlər istər Avropada olsun, istərsə də MDB məkanında qaynaqlarını diversifikasiya etməklə Amerika universitetlərinin keçdiyi yolu təqib etməyə çalışır.

Bu reallıq nəticəsində qlobal trend bundan ibarətdir ki, universitet-tələbə, pedaqoq və idarəedən heyətdən ibarət insan resursunu, təhsil və tədqiqat fəaliyyəti hesabına qazanılan bilikləri, özünü təmin etməyə qadir və hər biri ayrıca qəsəbəni xatırladan fiziki strukturunu (kampusu) cəmiyyətlə paylaşır. Məhz bu əlçatanlıq nəticəsində biliklər cəmiyyətinin vətəndaşları universitetin tələbəsi olmadan belə bu qurumla mənsubluq əlaqəsi yarada, universitet isə cəmiyyətlə birbaşa və qarşılıqlı akademik ünsiyyəti paylaşa bilər. "Açıq kampus" modelinə keçid ictimai mahiyyətini "sosial effekt" çərçivəsində formalaşdıran universitet üçün vacib sayılmalıdır.

Sosial təsiri müstəqil bir funksiya kimi dəyərləndirən universitetlərdə fərdlərin mənsubluq hiss etdiyi kollektivlə əlaqəsi sadəcə universitetlə təmas qurduğu dövrlə məhdudlaşmır, məzun olduğu, cəmiyyət üçün faydalı işlər gördüyü müddət də davam edəcəkdir. Son nəticədə universitetin cəmiyyətlə daha sıx əlaqələr qurması da məhz bu məqsədlə düşünülür.

**NƏTİCƏ**

Tarixən cəmiyyətin transformasiyasında sistemyaradıcı həlqə rolunu oynayan universitet, həm forma, həm də məzmun baxımından biliklər cəmiyyətində də bu statusunu qoruyur.

Universitetlərin yaratdığı status kvo yeni keyfiyyət prizması yaradır, müxtəlif sahələrdə çalışan insanlar üçün biliyi əlçatan edir, həm də biliklərin təsnifatı ilə bağlı baş verən dəyişikliklərdə miqyası müəyyən edir. Daha vacib məqam isə bu proses nəticəsində biliklərin koomersiyalaşmasıdır. Müasir dövrdə geniş kütlələrə xitab edən və fəaliyyət modelini dəyişən universitet bilik istehsalına hakim olmağa başlaması ilə yüksələn bir xətlə sosiumun ortaq dəyərinə çevrilir. Bu keyfiyyət dəyişikliyi nəticəsində yeni universitet strukturunun formalaşması labüddir.

-Bilik dövriyyəsinin getdikcə artan nisbətdə universitetdən gözlənilən ictimai faydanın dəyərləndirilməsi tam yerinə düşür.

-Biliklər cəmiyyətinin formalaşdırdığı yeni trend vacib və aşkar bir transformasiya kimi başa düşülməlidir.

## İstifadə edilmiş ədəbiyyat

1. Towards the third generation University Managing the University in transition, J. G. Wissema, 2009.

2. Коллини С. Зачем нужны университеты? Издательский дом ВШЕ, М:2016.

3. A History of the University in Europe. Vol.III:Universities in the Nineteenth and Early Twentieth Centuries (1800-1945)/ ed.by W.Rüegg.Cambridge: Cambridge University Press, 2004.P.ii.

4. Daron Acemoğlu James A. Robinson, Ulusların Düşüşü Güc, Zenginlik ve Yoksulluğun kökenleri, çeviren: Faruk Rasim Velioğlu, 2013.

5. İmanov K. Biliklər və texnologiyalar+İnvestisiyalar və Əqli mülkiyyət =Universitetlərin və Sənayenin insan kapitalının ekosistemi (ÜƏMT-nin Universitet və elmi-tədqiqat institutları üçün ƏM siyasəti modelinin uyğunlaşdırılması təcrübəsindən)”. Bakı, 2017.

6. Global Innovation Index/ https://www.globalinnovationindex.org/gii-2017 report#pdfopener.

7. Brennan, J., King, R. and Lebeau, Y. (2004) The Role of Universities in the Transformation of Societies - An International Research Project: Synthesis Report, London: Association of Commonwealth Universities/Centre for Higher Education Research and Information.

8. Хоффман Р., Касноча В. Жизнь как СТАРТАП. Строй карьеру по законам Кремниевой долины. Альпина паблишер, М: 2017.

9. Startupblink /http://www.startupblink.com.

10. Drucker P.F.. Geleceğin toplumunda yönətim. İstanbul, Promat basın, 2003.

11. Дерек Бок, Университеты в условиях рынка. Коммерциализация высшего образования. Пер. Сергея Карпа. ВШЕ, М: 2012.

**J.Valehov**

### Integration goals of higher education: Reality of emergence of new generation universities

### Summary

Modern anatomy of development is tied to each society`s progress, well-being and competitiveness immunity, contribution this society can make to knowledge economy and its mastering of new technologies. In this context, the establishment of higher education institutions capable of preparing internationally-competitive specialists and applying knowledge in fulfilling main commitments of society is one of the key priorities. At the modern stage, universities are primary institutions producing quality human resources, conducting research activity and reflecting main algorithms of society`s development.

Like everywhere else, universities in Azerbaijan face major challenges of

a) whether their graduates can address the constantly changing requirements of the labour market

b) whether they can set the algorithm of service in quality and quantity.

In the past 20-30 years, developed countries have been conducting reforms to ensure transformation to new generation universities (3.0 concept). The primary philosophical essence of these reforms has been to meet society`s growing and assorted requirements towards higher education on the one hand, and use the advantages and tackle the threats of globalization on the other. This article provides a brief insight into the historical development of universities and analyzes main targets faced by new generation universities (including Azerbai-jan`s experience).



# MÜƏLLİMİN TƏLİM-TƏHSİL FƏALİYYƏTİ VƏ ONUN TƏŞKİLİ TEXNOLOGİYALARI

**Müseyib İlyasov,**
***pedaqogika üzrə elmlər doktoru, professor***
***ADPU-nun kafedra müdiri***

***Açar sözlər:*** *müəllim, təlim, təhsil, dərs, pedaqoji proses, pedaqoji texnika.*
***Ключевые слова:*** *учитель, обучение, образование, педагогический процесс, педагогическая технология.*
***Key words:*** *teacher , training, education, pedagogical prosess, pedagogical techniques.*

Müəllimin təlim-təhsil fəaliyyəti onun başlıca vəzifəsinin, yəni təhsilverici vəzifəsinin reallaşdırılmasından ibarətdir. Bu fəaliyyət gənc nəslin bəşəriyyətin min illər boyu toplamış olduğu maddi və mənəvi dəyərlərə yiyələnməsi məqsədilə təşkil edilən xüsusi fəaliyyət və idrak prosesidir. Bu prosesin nəticəsində böyüyən nəsil elmi biliklər sisteminə, həyati bacarıq və vərdişlərə, davranış mədəniyyətinə, müxtəlif fəaliyyət növlərinə yiyələnir və böyük həyata hazırlanırlar. Məqsədyönlü və məzmunlu təşkil edilən təlim-təhsil prosesi təhsilalanlara əqli, əxlaqi, emosional, iradi, əmək, iqtisadi və s. keyfiyyətlər aşılamaqla yanaşı, onlarda dünyanı dərk etmək, həyatı dəyərləndirə bilmək bacarıqları formalaşdırır və gələcək həyat üçün bir sıra keyfiyyətlər aşılayır. Bu prosesdə həlledici rol isə dərsə məxsusdur.

Dərs məqsədyönlü təşkil edilmiş təhsilin əsas təşkili forması kimi şagirdlərin bir şəxsiyyət kimi formalaşmasında mühüm yer tutur. Dərs öyrədir, tərbiyə edir, inkişaf etdirir.

Dərsin əsas xüsusiyyəti ondan ibarətdir ki, o, şagirdlərdə müəyyən bilik, bacarıq, səriştə, intellektual inkişaf, elmi düşüncə tərzi, dərketmə bacarıqları formalaşdıra bilir. Bu baxımdan müəllimin bütün təlim-tərbiyə işini özündə birləşdirməklə təhsil-təlim fəaliyyəti elə təşkil edilməlidir ki, o, şagirdlərdə bilik, bacarıq vərdişlər formalaşdırmaqla yanaşı, onlara düşünməyi öyrətsin və şəxsiyyətin inkişafına təsir göstərmək funksiyasını reallaşdıra bilsin.

Müəllimin təhsil-təlim fəaliyyətinə bir sıra amillər təsir edir. Bu amillər sırasında şagirdlərin dərs zamanı hansı mövqedə olmaları mühüm əhəmiyyət kəsb edir. Qeyd edək ki, çox vaxt dərsin səmərəliliyi və nəticəyönümlülüyü də şagirdlərin bu prosesdə hansı mövqedə olmalarından çox asılı olur: a) verilən informasiyalar şagirdlərin yalnız dinləyici kimi iştirakı ilə mənimsənilir (ənənəvi təlim forması); b) şagirdlərin fəallığı şəklində informasiyalar axtarılır, tapılır və ondan istifadə edilir (fəal təlim).

Birinci halda təhsilalanların daha çox

informasiyalarla tanış edilməsi, onlara maksimum səviyyədə biliklər verilməsi, izahat, anlatma, məlumatlandırma üstünlük təşkil edir. Bu zaman müəllim informasiya ötürücüsü, tranformator rolunda çıxış edərək şagirdlərə daha çox bilik aşılamağa çalışır. İkinci halda isə şagirdlərdə təlimə maraq yaradılması, motivləşdirmə, stimullaşdırma, şagirdlərin özlərinin axtarışa cəlb edilməsi, onların pedaqoji prosesin əsl tərəf - müqabili kimi iştirakı, nitq və təfəkkürün inkişafı, müzakirə, fikir mübadiləsi önə çəkilir. Müəllim bu prosesdə bələdçi, fasilitator rolunda çıxış edərək daha çox şagirdlərin işləmələrinə şərait yaradır.

Əlbəttə hər iki halda müəllimin səriştəsi, peşəkarlığı, mövqeyi, tədris etdiyi fənnin mahiyyət və məzmununu dərindən bilməsi, öyrədəcəyi mövzunun şagirdlərdə nələri – elmi dünyagörüşü, yaradıcı axtarışları, məntiqi təfəkkürü, şəxsiyyətə xas olan bir sıra keyfiyyətləri aşılaya bilmək imkanlarının olmasını dərk etməsi əsas yer tutur. Buna görə də müəllimin öz fənninin təkcə məzmununu yaxşı bilməsi və onu şagirdlərə çatdırması kifayət deyildir. Müəllim şagirdlərə biliyə yiyələnməyin optimal yollarını, onları ümumiləşdirməyi və sistemləşdirməyi, bu biliklərdən istifadə edə bilməyi, şagirdlərin təfəkkür müstəqilliyinə yiyələnməsini nəzərdən qaçırmamaqla təlim-təhsil fəaliyyətinin tamlığına nail olmağı bacarmalıdır. Bu zaman şagirdlər öyrəndikləri fənnin məqsədini də dərindən dərk edərlər.

N.V.Kuzmina göstərir ki, müəllimin öz fənninin imkanlarına inamı onun pedaqoji hətəkətinin səmərəsinin hüdudunu – kəmiyyətini təyin edir. Son nəticədə bu, müəllimin fənni vasitəsilə şagirdlərdə elmi dünyagörüş, məntiqi-idrak, yaradıcı təsəvvür və bacarıq, sistemli biliklər, səriştə və s. formalaşdırma imkanının olub-olmadığını təyin edir. Şagirdlərin təhsil-təlim fəaliyyətinin müvəffəqiyyətinin mühüm şərti öyrəndikləri fənnin məqsədini, ondakı bu və ya digər dərsin yeri və rolunu dərk etmələridir. Müəllim öz fənninin təkcə məzmununu tədris etməklə kifayətlənməyib, onun haqqında informasiya toplama metodlarını, onları sistemləşdirmə yollarını, məlumatlar sistemində təssəvvür etmə bacarığını, əyani vəsaitlərə istiqamətləndirmək imkanlarını aşılayırsa, bu zaman öyrənilən fənnin məqsədini dərk etmək o qədər də çətin olmur.

Şagirdlərin təlim-təhsil fəaliyyətinin təşkilində və aparılması prosesində müəllim fəaliyyətinə daxil olan pedaqoji işlərin texnologiyasının nəzərə alınması olduqca vacibdir. Əvvəla müəllim bu texnologiyaları, qarşıda duran məsələlərin necə, hansı formada və şəraitdə həll edilməsini yaxşı bilməlidir. İkincisi də məqsəddən nəticəyə qədər olan 45 dəqiqəlik "məsafənin" və proseslərin necə, hansı şəkildə keçilməsini aydın şəkildə dərk etməlidir. Bu zaman problemin konkret həllinə istiqamətlənmiş başlıca arqumenti nəzərə almaq və bütün təlim-təhsil prosesini bu arqument əsasında formalaşdırmaq əsas yer tutur. Təhsilin humanist istiqamətliliyi prinsipinə əsaslanmaqla aparılan pedaqoji proses burada şagirdlərin öz fikirlərini sərbəst şəkildə ifadə etmək, yaradıcılıq prosesinə qoşulmaq, axtarmaq, tapmaq, nəticə çıxarmaq, məlumat mübadiləsi aparmaq və s. kimi məsələlərə geniş imkan yaratdığından müəllimin şagirdlərlə sıx əməkdaşlıq şəraitində işləməsi xüsusi xarakter alır.

Məktəb təcrübəsi göstərir ki, səriştəli və peşəkar müəllimlərin dərsləri digər bir sıra müəllimlərin dərslərindən daha çox onunla fərqlənir ki, bu dərslərdə şagirdlər müəllimlərlə birlikdə müəyyən fəaliyyətə qoşulmuşlar; şagirdlərə "sən düz demədin", "düz deyil", "filan şagird səndən daha məzmunlu cavab verdi", "bunu sən bacar-

mazsan" və s. kimi ifadələr işlədilmir; tənqid yox, təlqin, həvəsləndirmə, stimullaşdırma daha çoxdur; pedaqoji prosesdə nəzarətlə yanaşı, özününəzarətə geniş yer verilir və s. Belə hallar təlimin daha məhsuldar olmasına, həll edilən problemin şagirdlər tərəfindən daha aydın, daha məzmunlu və daha dərindən mənimsənilməsinə səbəb olur. Şagirdlər müəyyən bilik, bacarıq və vərdişlərə yiyələnməklə yanaşı, onlarda təfəkkür inkişaf etdirilir.

Yüksək səriştəyə və peşəkarlığa malik olan müəllimlər şagirdlərə proqram mövzusunu mənimsətməklə kifayətlənməyərək, onlara öyrənməyin yollarını öyrətməyə, müəyyən situasiyaları həll etmək üçün onları axtarışa, yollar tapmağa, problemi həll etmək səriştəsinə yiyələnməyə istiqamətləndirirlər. Çalışırlar ki, qarşıya qoyulmuş problem şagirdlərin fəal iştirakı, müdaxiləsi ilə həll edilə bilsin. Lakin bunlar heç də plansız, sistemsiz şəkildə deyil, müəllimin əvvəlcədən müəyyənləşdirdiyi texnoloji proseslərin hesabına baş verir ki, bunlar həm keçmiş biliklərlə əlaqələndirilir, həm də yeni biliklərə yol aça bilir.

Yaxşı müəllimlər şagirdlərə bələdçilik etməklə onlarda qarşıda duran problemin həlli üçün daha əlverişli, daha optimal yolların axtarışına onları sövq edir. Şagirdlər alternativ yollardan daha əlverişlisini seçə bilmək imkanı əldə edə bilirlər. Müəllimin səriştəli mövqeyi elə bir şərait yaradılmasına səbəb olur ki, burada şagirdlər həm seçim, həm də inkişaf imkanı əldə edirlər. Belə dərslərdə məşhur bir kəlamda deyildiyi kimi, şagirdlərə "hazır balıq verilmir, onlara balıq tutmağın yolları öyrədilir". Burada sadədən-mürəkkəbə, asandan-çətinə prinsipinə riayət etməklə şagirdlərin biliyi müstəqil mənimsəmələrinə şərait yaradılır ki, bu da onların arasında qarşılıqlı əlaqə, əməkdaşlıq, müəyyən məsələni birgə həll etmək təşəbbüskarlığını gücləndirir. Nəticədə isə bunlar şagirdlərin zehni fəaliyyətinin fəallaşdırılmasına mühüm təsir göstərmiş olur.

Beləliklə, müəllimin təlim-təhsil fəaliyyətinin texnoloji əsasında dayanan başlıca prinsip şagirdlərin daha çox biliklərlə "yüklənməsi" deyil, qarşıda duran problemin həlli üçün optimal yollar axtarıb tapmağı onlara öyrətməkdən ibarətdir. Pedaqoji prosesin əsası olan dərs bu istiqamətdə təşkil edilməklə şagirdlərin inkişafında həlledici əhəmiyyət kəsb edir.

Təlim və tərbiyənin əsas təşkili forması olan dərs məktəbin bütün fəaliyyətinin mərkəzində dayanır. O, bütün pedaqoji prosesi zəncir kimi bir-birinə bağlayaraq müəllimin yaradıcılığının başlıca aləti kimi özünü göstərir. Müəllimin bütün biliyi, bacarığı, qabiliyyəti, yaradıcı fəaliyyəti məhz dərs prosesində reallaşır və özünü göstərir. Hər bir dərs özünün məzmunu, məqsədi və xarakteri ilə şagird şəxsiyyətinin formalaşmasında müəyyən yer tutur. Dərs öyrədir, tərbiyə edir, inkişaf etdirir. Müasir, yeni dövrün tələblərinə cavab verən dərs müstəqil və məsuliyyətli bir iş kimi müəllimin pedaqoji ustalığına əsaslanır. Pedaqoji ustalığa gedən yol isə olduqca gərgin iş, yeni pedaqoji təfəkkür, yeniliyə meyil etmə, təlim prosesinə novator yanaşma tərzi tələb edir. "Pedaqoji innovasiya" adı ilə pedaqogikaya daxil olan yeniliklər pedaqoji prosesin gedişini və nəticəsini yaxşılaşdırmaq, keyfiyyətini yüksəltmək məqsədilə həyata keçirilən yenilik kimi məktəbin və müəllimlərin qarşısında durur.

Şagirdləri daha çox informasiyalarla tanış etməyə, lazım olmayan, ikinci dərəcəli materiallarla yükləməyə məcbur edən, hafizə və yaddaşa əsaslanan təlimdən fərqli olaraq, şagirdlərin mücərrəd təfəkkürünü, mühakimə qabiliyyətini, düşüncəsini inkişaf etdirən, məntiqi, yaradıcı və tənqidi təfəkkürünün bir-biri ilə qarşılıqlı əlaqələn-

dirilməsinə yönəldilən müasir təlim metodlarından istifadə edilməsi müəllimlə-rin ustalıq səviyyəsinin yüksəldilməsinə geniş imkanlar yaradır. Öyrənməklə yanaşı, tədqiqatçılıq, düşünmək, axtarmaq, tapmaq imkanlarının genişləndiriləsinə yönəldilən belə fəaliyyətlə məşğul olmaq müəllimi əsl novator müəllimə çevirir.

Dərs bir sıra elementlərdən yığılaraq formalaşır və üzə çıxır. Burada əsas yeri dövlət standartına müvafiq proqramının müəyyənləşdirdiyi dərs materialı tutur. Adətən təcrübəli müəllimlər tədris proqramının əsas istiqamətlərini, vəzifə və strukturunu yaxşı bilir və onu təhlil etməyi bacarırlar. Lakin usta müəllimlər həmişə keçəcəkləri dərsin yaxşı, maraqlı dərs olması üzərində daha çox düşünür və ona çalışırlar.

Hər şeydən əvvəl müəllim dərsə hazırlaşarkən proqramı nəzərdən keçirməli, öyrəniləcək materialın məzmununu təhlil etməli, dərsin didaktik məqsədini və didaktik vəzifəsini müəyyənləşdirməlidir.

Adətən, müəllim hər bir dərsə hazırlaşarkən onu necə keçəcəyi üzərində düşünür, fikirləşir və onu planlaşdırır. Bunlar aşağıdakı problemlərin həllinə istiqamətləndirildikdə alınan nəticələr daha səmərəli olur:

1) dövlət tərəfindən müəyyənləşdirilən proqram və dərs materialının dərk edilməsi;

2) bu materialların müasirliklə və uşaqların inkişafı ilə qarşılıqlı əlaqəsi;

3) keçmişdə öyrənilən materiallarla hazırda öyrənilməsi zəruri olan materialların qarşılıqlı əlaqəsi;

4) hazırkı materialın konkret siniflə və konkret şagirdlərin psixoloji xüsusiyyətləri ilə qarşılıqlı əlaqəsi;

5) şagirdlərin müstəqil yaradıcı fəaliyyətlərinin təşkili və yaradıcı düşüncələrinin inkişafı;

6) dərsin məqsədinin reallaşdırılması və ona nail olunması və s.

Yaradıcı fəaliyyət göstərən müəllim öz pedaqoji yaradıcılığını müntəzəm olaraq pedaqogika, psixologiya və metodikanın vacib müddəaları ilə əlaqələndirməli, yeniliklərlə zənginləşdirməlidir. Təcrübə və tədqiqatlar göstərir ki, dərsi qabaqcıl pedaqoji təcrübə ilə əlaqələndirməklə, onlardan bəhrələnməklə yaxşı dərs kimi qurmaq olar.

Müəllimin pedaqoji fəaliyyətində başlıca amillərdən biri onun pedaqoji prosesi lahiyələşdirmə bacarığına malik olmasıdır. Bunun üçün ilk növbədə pedaqoji məqsəd dərk olunmalıdır. Müəllim dərs prosesinə birdən-birə mövzunun, məsələnin həllindən deyil, pedaqoji məqsədin dərk olunmasından başlayır ki, bu da pedaqoji prosesin həllində əsas şərt hesab olunur. N.V.Kuzmina bu münasibətlə yazır ki, bəzi müəllimlər pedaqoji situasiyanı təhlil edib, lazımi qərarlar qəbul etmək əvəzinə, sadəcə dərs deyir, şagirdləri fəallaşdırır, əyanilik tətbiq edir, dərs soruşur, lazım gəldikə şagirdlərin davranışına “reaksiya” verirlər. Lakin bütün bunların ümumi məqsədə nə dərəcədə müvafiq olduğunu dərk etmirlər. Bir çox müəllimlər isə əsl pedaqoji məqsədi fuksional, keçici vəzifələrdə – dərs demək, yaxud dərslər silsiləsi təşkil etmək, tədbir keçirmək, şagird haqqında hər hansı bir təsirli ölçü götürməkdə və s. görürlər. Bunlar paradoksal hallardır və onlar əsl pedaqoji məqsədin dərk olunmasına səbəb deyildir.

Unutmaq olmaz ki, tədris zamanı əsl pedaqoji məqsədin dərk olunması bu prosesi nizamlayan, onu düzgün istiqamətləndirən amil kimi ilkin məlumatların təhlili və diaqnozun qoyulmasını əvvəlcədən təyin edir və pedaqoji prosesi yönəldir. Qeyd edək ki, buradakı diaqnoz – pedaqoji prosesin ümumi vəziyyətinin qiymətləndirilməsi və ya ayrı-ayrı komponentlərinin bu və ya digər fəaliyyət dövründəki vəziyyətinin hərtərəfli, tam tədqiqi deməkdir.

Təlim prosesinin qurulması texnologi-

yasının məntiqi yekunu pedaqoji fəaliyyətin layihəsinin plan, plan-konspekt (icmal), yaxud konspekt formasında yazılmasıdır. Bu baxımdan müəllim keçəcəyi hər bir dərsə, mövzuya ciddi surətdə hazırlaşmalıdır. Fənninə yaradıcı yanaşmağı bacarmalı, dərsin daha da maraqlı, canlı keçməsi üçün lazımi tədris vəsaitlərindən və metodik vasitələrdən istifadə etməyi bacarmalıdır.

Dərsin yüksək səviyyədə qurulmasında və aparılmasında onun planının yazılı surətdə tərtib edilməsi mühüm əhəmiyyət kəsb edir. Bəzən müəllimlər bu işə əlavə bir yük, yersiz bir iş kimi baxırlar. Əslində isə bunun faydalı cəhətləri olduqca çoxdur. Müəllim dərs planı (gündəlik) hazırlayarkən təkcə dərsin mətninə yenidən baxmır. O, dərsi hansı metodla keçəcəyini, dərsdə hansı təlim vasitələrindən istifadə edəcəyini, şagirdlərin fəallaşdırılması üçün nələri və necə tətbiq edəcəyini müəyyənləşdirir. Dərsin başlıca funksiyalarını yerinə yetirmək üçün düşünür, yollar, vasitələr axtarır və dərsi planlaşdırır. Bu baxımdan dərsin yazılı planlaşdırılmasına əlavə yük kimi baxılması düzgün deyildir.

Başlıca məsələlərdən biri yazılı dərs planının hansı formada tərtib edilməsidir ki, buna da standart və şablon yanaşılmamalıdır. Hər bir müəllimin fərdi üslubu, yaradıcılıq və yanaşma tərzi burada mühüm rol oynayır.

Təlim-təhsil prosesinin təşkili texnologiyası bilik, bacarıq və vərdişlərin mənimsənilməsinin psixoloji və idrakı əsasları ilə, yəni qavrama, anlama, dərk etmə, ümumiləşdirmə, möhkəmləndirmə və tətbiqetmə mərhələləri sıx bağlı olan bir prosesdir. Lakin təcrübə göstərir ki. bir çox hallarda bunların hamısını bir dərs müddətində reallaşdırmaq imkan xaricində olur. Buna görə də dərsin texnoloji tərəflərini proqnozlaşdırarkən elə etmək lazım gəlir ki, mövzunun mənimsənilməsi mərhələsi həyata keçirilən mərhələlər arasında “itib-batmasın”, şagirdlər sinif otağını tərk edərkən bu dərsdə nələri öyrəndilkərini aydın dərk etmiş olsunlar.

Ənənəvi dərs forması ilə aparılan dərslərlə fəal təlim metodları ilə tədris edilən dəslərin müqayisəli təhlili göstərir ki, belə bir imkan fəal dərslərdə daha genişdir. Bu şərtlə ki, həmin dərsdə forma xatirinə bir neçə metodların qarışığından istifadə edilməklə dərsin əsas məqsədi, məzmun xətti və standartı unudulmasın. Lakin orta və ali məktəblərdə müşahidə etdiyimiz bəzi dərslər göstərir ki, müəllimlərin bir qismi fəal təlim metodlarından istifadə zamanı daha çox prosesin xarici tərəfinə aludə olurlar ki, bunlar da başlıca məqsədin reallaşdırılmasını kölgədə qoyur: bir neçə fəal təlim metodu tətbiq olunur, şagirdləri fəallaşdırmaq üçün müəyyən formalardan istifadə edilir, lakin başlıca məsələ - mövzu üzrə tələb olunan standart mənimsənilməmiş qalır. Buna görə də hər bir müəllimin dərsi planlaşdırarkən aşağıdakı bir sıra məsələlərin reallaşdırılmasına xüsusi diqqət yetirməsini zəruri hesab edirik:

- tələb olunan təhsil standartının mahiyyətinə dərindən nüfuz edilməsi;
- məzmun xəttinin bütün dərs boyu nəzarətdə saxlanılması;
- şagirdlərin informasiyanı qəbuletmə və ondan istifadə bacarıqları üzərində nəzarət edilməsi;
- mövzu üçün daha çox vacib olan arqumentin müəyyənləşdirilməsi və prosesin onun əsasında alqoritmləşdirilməsi;
- dərsin mərhələləri arasında məntiqi əlaqənin gözlənilməsi və prosesin nəticəyönümlülüyünün təmin edilməsi;
- metodların seçilməsində mövzunun tələblərinə və mahiyyətinə uyğunluluğunun təmin edilməsi;
- ayrı-ayrı mərhələlərdə həll ediləcək məsələlərin mövzunun mənimsənilməsilə bilavasitə bağlılığının təmin edilməsi;

- mövzunun öyrənilməsi zamanı şagirdlərdə elmi dünyagörüşün, mənəvi keyfiyyətlərin formalaşmasına yönəlmiş situasiyaların həllinə nail olunması;

- dərs materialının şagirdlər tərəfindən yüksək səviyyədə mənimsənilməsinə əminliyin yaranması;

- mənimsəmə prosesinin nəticələri üzərində korreksiyaedici işlərin aparılması və s.

Müəllimin təlim-təhsil fəaliyyəti çoxsahəli bir fəaliyyətdir. Ona standart ölçülərlə yanaşmaq çətindir. Peşəkarlıq, səriştə, ustalıq, pedaqoji düşüncə tərzi, yaradıcı axtarış, əməkdaşlığa meyllilik, peşəsinə və işinə sevgi kimi amillər burada mühüm yer tutur. Başlıca məsələ onlara yiyələnməyə maraq və həvəsin olması, müəllimin öz vətəndaşlıq, peşə vəzifəsini və borcunu yerinə yetirməsini dərindən dərk etməsidir.

***Rəyçi*: *prof. F.Rüstəmov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. Bakı: “Azərbaycan məktəbi”. 2013, № 5.

2. Кан-Калик В.А., Никандров Н.Д. Педагогическое творчество. Москва: Педагогика, 1990.

3. Кузмина Н.В. Очерки психологии труда учителя. Ленинград: ЛТУ, 1967.

4. Ч .Куписевич. Основы общей дидактики. /Перевод с польск. О.В.Долженко. – М: Высш. шк., 1986.

**М.Ильясов**

**Обучающая и образовательная деятельность учителя, и технологии ее организации**

**Резюме**

Современная эпоха, ставит очень важные и ответственные задачи перед педагогическим процессом и учителями, являющимися его основными носителями. Правильная организация обучающей и образовательной деятельности учителя и ее осуществление оптимальными методами являются основными факторами в решении этих задач. Особое место здесь занимают такие факторы, как правильное определение цели обучения, объективное отношение учителя к современным методам, применение на уроке новых педагогических технологий, достижение реализации стандартов образования.

Содержание этих показателей всесторонне раскрыто и представлено в статье.

**M.Ilyasov**

**Education-training activity of teacher and its technique of organizing**

**Summary**

Modern period poses important duties on pedagogical processes and its main carrier- teachers. Correct organiation and realization of education activity of teacher in straight methods are main factors of execution of these duties. Setting the aim of the training, objective approach of teachers to modern methods, application of new pedagogical techniques in the class, achieving realization of education standards in every single class are some of the most important factors.

Those factors occupy main part in this article, and content of all of them was described.



# NEYROLİNQVİSTİK PROQRAMLAŞDIRMA: TƏXƏYYÜL MƏKTƏBİNƏ KEÇİD



**Elxan Bəylərov,**
***Psixologiya üzrə elmlər doktoru***

**Raziyə Quliyeva,**
***Azərbaycan Respublikasının Təhsil İnstitutunun psixologiya və yaş fiziologiyası şöbəsinin doktorantı***

Bu məqalədə NLP texnikaları təfəkkür məktəbindən təxəyyül məktəbinə keçidin vasitəsi kimi araşdırılmışdır. Bu texnikaların müxtəlif təhsil strategiyalarında tətbiq imkanları araşdırılmış, səmərəli istifadə istiqamətləri müəyyən edilmişdir. Eyni zamanda təhsil mühitində öyrənənlərin mövcud problemlərinin aradan qaldırılması baxımından NLP texnikaların imkanları tədqiq edilmiş və müvafiq nümunələr göstərilmişdir.

***Açar sözlər:*** *neyrolinqvistik proqramlaşdırma, təxəyyül, təhsil, texnika, davranış, ünsiyyət.*

***Ключевые слова:*** *нейролингвистическое программирование, воображение, образование, техника, поведение, общение.*

***Key words:*** *neuro-linguistic programming, imagination, education, technique, behavior, communication.*

Müasir dövrdə Azərbaycan təhsil sisteminin yenidən qurulması, müasirləşdirilməsi və bu prosesdə yeni texnoloji innovasiyalardan istifadə olunması vacib məsələlərdən biridir.

Təhsil sisteminin inkişaf tendensiyası innovativ və interaktiv metodlardan istifadə edən novator müəllimlərin iş üsullarına dair toplanmış faydalı təcrübələrin, pedaqoji-psixoloji tədqiqatların nəticələrinin daima sistemləşdirilməsi, ümumiləşdirilməsi və təlim-tərbiyə prosesinin məzmununun yeniləşdirilməsini tələb edir. Bu problemlərin həlli təhsil sferasına, pedaqoji prosesə, interaktiv metodlar anlayışının elmi əsaslarla gətirilməsini vacib bir problem kimi qarşıya qoyur və bütövlükdə təhsildə müasir texnoloji yanaşmaların tətbiqini aktuallaşdırır.

Müasir təhsilin inkişaf indikatorlarından biri də təhsil işçilərinin və bütünlükdə təhsil sisteminin ictimai həyatın tələblərindən irəli gələn yeni ideyalara, texnoloji innovasiyalara çevik və adekvat reaksiyasıdır. Başqa sözlə, sosial-ictimai həyat, əmək bazarı, İKT və digər sferalarda baş verən yeniliklərin təhsildə çevik inikası təhsilin inkişafından xəbər verir, bu inkişafı şərtləndirir. Təhsilin inkişafı istənilən sosial-ictimai, texnoloji inkişaf ilə uyğun tempdə və üzvi vəhdətdə cərəyan etməlidir ki, onun yetişdirdiyi şəxsiyyətlər cəmiyyətdə, ictimai-sosial həyatda baş verən yeniliklərdən xəbərdar olsunlar və bu yeniləşmə prosesinə öz töhfələrini versinlər.

Digər tərəfdən, təhsil sistemi sürətli, intensiv dəyişikliklər mühitinə, informasiya çoxluğuna, ictimai-sosial həyatdakı gərgin-

lik faktorlarına, böyüməkdə olan gənc nəslin yeniləşməkdə olan həyat fəlsəfələrinə adekvat olan öyrənmə, öyrətmə metodları, ünsiyyət-davranış modelləri təklif etməli və formalaşdırmalıdır. Başqa sözlə, didaktik arsenal tədricən yenilənməli və zənginləşdirilməlidir.

Müasir təhsil yanaşmalarında pedaqoji fəaliyyət yaradıcılığın növlərindən biri kimi dəyərləndirilir. Bu fəaliyyətin icrasını şərtləndirən amillər, mexanizmlər, üsul və vasitələr əvvəlcədən planlaşdırılmalıdır. İnkişaf etmiş müasir təhsil sistemlərində yeni nəslin müəllimlərindən, konkret öyrətdikləri fənnin struktur məzmununa və məqsədinə uyğun olaraq, uşaqların fərdi xüsusiyyətlərini nəzərə almaq, şagirdlərin harmonik inkişafını mümkün edən texnologiyalar seçib, tətbiq etmək tələb olunur.

Neyrolinqvistik proqramlaşdırma (NLP) texnikalarının təhsil modelinə əlavə edilməsi tədris prosesini fərdi proqram üzrə təşkil etməyə, şagirdin dərsə marağını stimullaşdırmağa imkan verir. NLP texnikalarının istifadə olunduğu dərslər uşaqlar üçün çox cəlbedici və maraqlı olur.

NLP zehin və dil arasındakı qarşılıqlı əlaqənin davranışımıza təsirini ifadə edir. İlk olaraq NLP anlayışına qısaca şərh verək.

Neyro - hiss üzvlərimizdən gələn informasiyadan istifadə edərək, xarici dünya haqqındakı təcrübələrimizi şüurlu və şüuraltı düşüncələrə çevirən nevroloji prosseslərlə əlaqədardır. NLP bədənimizdə fizioloji və psixoloji proseslərin bir vəhdətdə işləməsinə əsaslanır. NLP nevroloji prosesi canlandıraraq onu idarə etmək bacarığını qazandırır.

Linqvistika - dil vasitəsi ilə təcrübələrimizə məna qazandırmaq, onları başqalarına çatdırmaq üçün ən səmərəli vasitədir. Dil düşüncələrimiz, təcrübələrimiz və görüşlərimizin xaricə təzahür vasitəsidir.

Proqramlaşdırma - məqsədə çatmaqda təcrübələrimizi uyğunlaşdıraraq və tənzimləyərək modelləşdirməkdir. Əldə etdiyimiz nəticələr, onların başqalarına və özümüzə təsiri fərdi proqramlaşdırma fəaliyyətimizin nəticəsidir.

NLP-in müasir anlamda əsası 1974-cü ildə Kaliforniyada, dilçi Con Qrinder ilə riyaziyyatçı Riçard Bendler tərəfindən qoyulmuşdur. Onların ortaq fəaliyyəti nəticəsində ailə psixoterapevti Virginia Satir, geştalt terapiyasının banisi Fritz Perls və hipnoterapevt Milton Eriksonun istifadə etdikləri nitq və davranış nümunələrinin modelləri təhlil edilmiş və bunun nəticəsində NLP texnikalarının təməli qoyulmuşdur. Böyük uğur qazanan insanlarda ortaq əlamətlərin olması və az uğurlu insanlarda da oxşar xüsusiyyətlərinin müşahidə edilməsi NLP texnikalarının yaranmasına və inkişafına təkan vermişdir.

Qeyd edək ki, dünya təcrübəsində NLP insan fəaliyyətinin bir çox sahələrində təhsil, peşəkar fəaliyyət, idman, şəxsi inkişaf, liderlik, sağlamlıq, ünsiyyət və s.-də uğurla tətbiq edilir. Qeyd etmək lazımdır ki, müasir dövrün tələblərinə uyğun olaraq təhsil sistemi əsaslı şəkildə yenilənməkdədir. Bu prosesdə təfəkkür məktəbindən təxəyyül məktəbinə keçid prioritet məsələlərdən biridir. Bu isə yeni metodların təlim prosesinə tətbiqi zamanı təxəyyüldən istifadəni zəruri edir. Belə ki, innovativ yanaşma kimi NLP-nin təhsildə tətbiqi aşağıdakı faydaları təmin edir: öyrənməni asanlaşdırır; yaddaşı gücləndirir; özünəinam hissini yüksəldir; fobiyalardan qurtulmanı asanlaşdırır; zəruri dəyişikliklər tez və səmərəli olur; duyğu və düşüncəni inkişaf etdirir; stresli hallar idarə olunur; qətiyyəti və inamlılığı artırır; motivasiyanı yüksəldir və fərdi performansı artırır.

NLP-nin bir çox texnikalarında təxəyyüldən geniş istifadə olunur. Təxəyyül xəyalların yaranmasında, nəticələrin əvvəlcədən təsəvvür edilməsində və həmin nəticələrin davamlı olaraq həyatımıza verəcək səmərəsini əvvəlcədən proqnozlaşdırmaqda kömək edir. Filosof Bertran Rasselin dediyi kimi “insan ancaq təxəyyül vasitəsi ilə dünyanın necə olacağını bilər”. Təxəyyüldə yaradılan obrazlar nevroloji prosesləri müəyyən bir istiqamət üzrə stimullaşdırır. Bu zaman avtomatik nevroloji prosesə şüuraltı sahə də qoşulur və

təxəyyüldəki obrazların gerçəkləşməsinə müvafiq zəmin yaranır. Bir məsəldə deyildiyi kimi, enerji diqqətin mərkəzləşdiyi sahəyə yönəlir.

Deməli, NLP texnikaları vasitəsi ilə duyğu və düşüncələrimizi yönləndirərək daxili dünyamızın sahibi və gələcəyimizin memarı ola bilərik. NLP texnikaları təxəyyül vasitəsi ilə düşünmə, nitq və davranış proseslərinə təsir edərək hədəfə çatmaq üçün ən səmərəli vasitələr kimi çıxış edir. Bu texnikalar insanın bir məqsədə çatması ilə bağlı davranışlarında dörd əsas qaydaya əməl etməsini təşviq edir:

1) Əvvəlcə nə istədiyini dəqiq, aydın və qəti şəkildə müəyyən etməlidir. Əldə etmək istədiyi nəticəni birmənalı olaraq təyin etməlidir.

2) Fəaliyyətə başlamalıdır. Bir şeyə nail olmaq üçün niyyətlə bağlı məqsədyönlü fəaliyyət olmalıdır. Hədəfə çatmaq üçün mütləq yola çıxılmalıdır.

3) Nəticələrin fərqində olmalı, diqqətli və həssas olmalıdır. Hər bir fəaliyyətlə bağlı hədəfə yaxınlaşdığını və ya uzaqlaşdığını düzgün dəyərləndirmək üçün özünə, onu maraqlandıran subyektlərə, psixoloji mühitə və qarşılıqlı münasibətlərə qarşı yetərincə həssas olmalıdır.

4) Kifayət qədər mütəhərrik (elastik) və çevik olmalıdır. İstədiyini əldə edənə qədər münasibət və davranışında məqsədyönlü dəyişikliklər etməlidir (2).

Bu gün həyatımızın müxtəlif sahələrində istifadəsi aktual olan NLP texnikalarının mahiyyətinin nə olduğunu və onların cəmiyyətə nə kimi faydalar verə biləcəyi sualı çoxlarını düşündürməkdədir. NLP texnikaları insanın uğur qazanması, özündə liderlik bacarıqlarını formalaşdırması və uğurlu ünsiyyət qurması üçün səmərəli bir vasitədir. Bu bacarıqları formalaşdırmaq üçün əvvəlcə psixoloji maneələr dəf edilməli sonra təxəyyüldə bu nailiyyətlərin obrazları yaradılmalıdır. Uğur qazanmış insanların əldə etdikləri nailiyyətlərin obrazlarını əvvəlcədən təxəyyüldə canlandırdıqlarını etiraf etmələri bu fikri bir daha təsdiqləyir. NLP texnikaları insanın şəxsi potensialını, resurslarını aşkar etməyə və ondan daha səmərəli şəkildə istifadəyə imkan verir. Onun digər tətbiq edildiyi sahə insanın yaradıcılıq fəaliyyətini təkmilləşdirmək, yeni öyrənmə strategiyalarını inteqrasiya etmək, neqativ halları aradan qaldırmaq, özünəinamı artırmaq, şəxsiyyət keyfiyyətlərini yüksəltməkdir. Bu aspektdən yanaşsaq, yaradıcılıq fəaliyyətini şərtləndirən amil kimi təxəyyül prosesinin rolu olduqca əhəmiyyətlidir.

Təxəyyül, həmçinin simvolları, metaforları yaratmaq və anlamaq, cari fəaliyyətlərdə motivasiya formalaşdıraraq onun mahiyyətini anlamaq üçün çox əhəmiyyətlidir. Görkəmli alim Albert Eynşteyn də təxəyyül haqqında belə bir fikir söyləmişdir “Təxəyyül elmdən daha əhəmiyyətlidir” (3). Eynşteyn köhnə və yeni bilikləri “ölü” hesab edir və yalnız təxəyyül bu bilikləri canlandıraraq onları praktik əhəmiyyətli edə biləcəyini qeyd etmişdir. Bu isə NLP texnikaları ilə reallaşdırıla bilər.

Məlumdur ki, beynin sol yarımkürəsi: sözlər, saylar, sıra, nizam, düzgünlük, məntiq, növlərə ayırmaq, müqayisə etmək, hesablamaq, və s. kimi anlayış və fəaliyyətlərə, sağ beyin yarımkürəsi isə rəng, ritm, xəyal qurmaq, həyat, gözəllik, yaradıcılıq, bütövlük, kosmos, emosiyalar, ölçü və s. kimi anlayış və fəaliyyətlərə “bağlıdır”. Buradan görünür ki, gündəlik həyatımız, təhsil və peşə fəaliyyətimiz əsasən sol beyin yarımkürəsinin inkişafını dəstəkləyir. NLP texnikalarının təlim prosesinə tətbiqinin verəcəyi üstünlüklərdən biri də odur ki, bu texnikalar eyni zamanda sağ və sol yarımkürələrdə gedən prosesləri fəallaşdıraraq onların əlaqəli və harmonik inkişafını təmin edir. Bu isə onların yaradıcılıq uğurları üçün ciddi zəmin yaradır.

Təxəyyül mürəkkəb psixi prosesdir və beynin sağ yarımkürəsinin məhsuludur. Lakin təəssüflər olsun ki, hal-hazırda təhsil sistemi beynin sol yarımkürəsinin inkişafına istiqamətlənmişdir. Beyinin hər iki yarımkürəsinin birlikdə çalışması, təxəyyü-

lün təsirli bir şəkildə ortaya çıxmasına zəmin yarada bilər. Bu isə NLP texnikaları vasitəsi ilə reallaşdırıla bilər. Əgər cəmiyyət beyinin sağ yarımkürəsinin işləməsinə əhəmiyyət verməzsə, eyni zamanda təhsil sistemi də yalnız sol yarımkürənin çalışdırılmasına istiqamətli proqramlar tərtib etməyə davam edərsə, bu vəziyyət şagirdlərin təxəyyülünün inkişafdan qalmasına səbəb olur. Lakin təxəyyülə istinad edən NLP texnikalarının təhsildə planlı və sistemli şəkildə tətrbiqi bu problemin həllinə təkan verə bilər.

NLP texnikaları təhsilin keyfiyyətinin yüksəlməsinə ciddi töhfələr verə bilər. Belə ki, xarici dilin öyrənilməsində bu texnikaların geniş imkanlara malik olduğu bir çox tədqiqatlarda artıq öz təsdiqini tapmışdır. Ümumuiyyətlə, NLP texnikalarının təlim mühitində səmərəliliyini təsdiqləyən çoxsaylı tədqiqatlar mövcuddur. Nümunə olaraq, tələbələrin lüğət ehtiyatının zənginləşdirilməsi üçün eksperimental qrupda NLP texnikalarından, nəzarət qrupunda isə ənənəvi təlim üsullarından istifadə edilən təcrübəni göstərmək olar. Eksperiment nəticəsində məlum olmuşdur ki, NLP texnikalarının istifadə olunduğu qrupda lüğət ehtiyatının zənginləşməsi, sözlərin daha çevik şəkildə yadda saxlanılması və yeri gəldikdə xatırlanması nəzarət qrupuna nisbətən daha sürətli və uğurlu olmuşdur.

NLP-nin təhsilə tətbiq edilməsinə dair aparılmış tədqiqatlar göstərmişdir ki, müvafiq texnikaların tətbiqi şagirdlərin nəzəri-metodoloji biliklərini, praktik bacarıq və təcrübələrini inteqrasiya etməklə, tədris prosesini xeyli canlandırır və şagirdlər üçün maraqlı edir. Bu texnikalar uşaqlarda məntiqi, tənqidi, yaradıcı və çevik düşünməni, təşəbbüskarlıq, tədris materialını dərindən dərk etmək kimi qabiliyyətləri inkişaf etdirir.

NLP vasitəsilə təhsildə effektiv öyrənmə və öyrətmə strategiyaları inkişaf etdirilir. Təhsil sahəsində NLP ənənəvi təlim metodlarından fərqli xüsusiyyətlərə malikdir. NLP texnikaları təlim prosesində yaranan mövcud problemlərin müəyyən edilməsinə və onların aradan qaldırılmasına yönəlmir, bu texnikalar problemlərin yaranmaması üçün şagirdlərə ən uyğun performansın yaradılmasına yönəlir. Başqa sözlə, problemlərin profilaktikasına, yaranmamasına xidmət edir. Burada “problem” dedikdə “problem situasiya” deyil, şagirdin öyrənməsi ilə bağlı problemlər nəzərdə tutulur. NLP müvəffəqiyyətsizliyin aradan qaldırılması üçün strategiyalar təklif etmir, müvəffəqiyyət üçün strategiyalar müəyyən edir. NLP də "ən yaxşı metod” və ya “universal metod" anlayışları yoxdur. O, hər bir insanın qüsursuzluğundan çıxış edərək, hər kəsin öz potensial imkanına uyğun inkişaf etməsi üçün bir çərçivə təqdim edir. Beləliklə, insanın öz inkişaf strategiyaları olur və o, onları müxtəlif fəaliyyət sahələrində tətbiq edə bilir.

Təhsil alanların ən çox şikayət etdikləri problem lazımi məlumatların çətin yadda saxlanılması və tez unudulmasıdır. Əslində problem informasiyanın unudulmasında deyil, onun xatırlanmasının çətinləşməsindədir. NLP-nin hafizə texnikaları şagirdləri izafi təkrarlamadan azad edir, öyrənmə prosesində beynin bəzi passiv mərkəzlərini fəallaşdıraraq məlumatların sistemləşdirilməsini, uzun müddət yadda saxlanılmasını və asanlıqla xatırlanmasını təmin edir. Beləliklə, bu texnikalar qısa müddətdə asan və sürətli öyrənməni təmin edir, tələbələrin “vaxt çatışmazlığı” problemini aradan qaldırır. Hafizə texnikaları kimi “bağlama texnikası”, “hafizə mismarları”, “akrostiş” və İSOAT texnikalarından geniş şəkildə istifadə olunur. Bundan əlavə, “neqativ xatirələrin silinməsi”, “pis vərdişlərdən azad olmaq”, “fobiyaların aradan qaldırılması” və s. kimi NLP texnikaları təxəyyül prosesinə əsaslanır (1).

Müəyyən bir sahədə insanın uğur qazanması üçün onun mövcud potensialı çox zaman kifayyət etmir. Uğur üçün yüksək bacarıq potensialı ilə yanaşı insanlarla pozitiv qarşılıqlı münasibətlərin qurulması, səmimi ünsiyyət, empatiya, bədən dilini anlama və bu dildə ifadə etmə bacarığı da

lazımdır. NLP texnikaları bu sahədə də faydalı vasitələrdəndir. NLP terminologiyasında "Kalibrasiya" anlayışı başqalarının ruhi hallarını düzgün anlaya bilmək bacarığını ifadə edir. Kalibrasiya - sözlərin arxasında gizlədilmiş fikirləri anlamaq, sətiraltı mənaları başa düşmək, yalnız deyilənləri deyil, deyilməyənləri də duymaq, eşidə bilmək, deyilənlərin məzmunu ilə yanaşı onları müşayiət edən duyğu və düşüncələri də hiss etməkdir.

NLP texnikaları istedadlı, çətin tərbiyə olunan və xüsusi qayğıya ehtiyacı olan uşaqların təliminin təşkilində şagirdlərin, müəllim, psixoloq və valideynlərin səmərəli alətlərinə çevrilə bilər və yaradıcılıq potensialının inkişafına təkan verər.

Beləliklə, bir çox sahədə geniş tətbiq imkanlarına malik olan NLP texnikaları insan fəaliyyətinin ünsiyyət və münasibətlərinin olduğu hər bir yerdə məqsədyönlü şəkildə istifadə edilə bilər. NLP texnikaları əvvəlcə insanın özünü dərk etməsinə, daha sonra münasibət quracağı insanları tanımasına və onlarla uğurlu ünsiyyət qurmasına əlverişli zəmin yaradır. Bu bacarıqlara yiyələnmiş şagird həm məktəb, həm də gələcək həyatında bir çox nailiyyətlər qazanmaq imkanı əldə edir. Beləliklə, şagird nailiyyətlərinin formalaşması məqsədi ilə təhsildə təxəyyülə istinad edən NLP texnikalarından istifadəyə geniş yer verilməlidir. Bunun üçün ailədə və məktəbdə uşaqların yaradıcı fəaliyyətinə qayğı ilə yanaşmaq, ona düzgün istiqamət vermək zəruridir. Nəticədə NLP texnikaları insanın harmonik inkişafını şərtləndirir və cəmiyyətə faydalı olan şəxsiyyətlərin formalaşmasına xidmət edir. Bu texnikaların təhsildə tətbiqinin geniş imkanları var və bu sahədə tədqiqatlar davam etdirilməlidir.

***Rəyçi: prof. A.Abbasov***

## İstifadə edilmiş ədəbiyyat

1. Bülent Şenyürek - Z.Müge Kasaroğlu. NLP ile Hafıza Teknikleri Hafıza Geliştirmenin Pratik Yolları.

2. Cemal Kondu. Her kes için NLP. İstanbul, 2010.

3. İlkten Çetin – Hayal Kurma ve Yaratıcılık. Nisan, 2012.

4. http://babekbayramov.com

5. www.nlpat.com/nlp/nlpkaynak/akademik_nlp.html

6. http://www.dslib.net/obwpedagogika/vozmozhnosti-ispolzovanija-nejro-lingvisticheskogo-programmirovanija-kak-sredstva.html

**Э.Бейлеров,**
**Р.Кулиева**

**Нейролингвистическое программирование: переход к школе воображения**

**Резюме**

В данной статье рассматриваются вопросы перехода от школы мышления к школе воображения, с помощью использования техник НЛП. Исследуя прикладные возможности данных техник в различных образовательных стратегиях, были определены направления их рационального использования. В то же время, были исследованы возможности и показаны примеры использования техники НЛП, в деле устранения существующих проблем у учащихся в образовательном процессе.

**E.Baylarov,**
**R.Guliyeva**

**Neurological programming: transition to imagination school**

**Summary**

The article considers the problems of transition from the school of thought to the school of imagination through NLP techniques. Studying the applied capabilities of NLP in different educational strategies, rational use of this technique was defined. At the same time there were studied capabilities and given the examples of NLP techniques use in terms of elimination of existing problems among schoolchildren.



# HUMANİTAR TƏHSİLİN PROBLEMLƏRİ

**Vidadi Orucov,**
*pedaqoji elmlər doktoru*

Məqalədə humanitar təhsilin problemləri araşdırılır. Qloballaşma ilə bağlı humanist siyasətin “Modern layihəsi”nə təsir göstərən məsələlər açıqlanır. Humanist fəlsəfəyə söykənən təhsilin məqsədləri göstərilir. Müstəqil humanist fərdlərin yetişdirilməsində şəxsiyyətyönlü təhsilin məqsədləri açıqlanır. Humanist prinsiplər əsasında inteqrasiya olunmuş bilik və bacarıqlar sisteminə yiyələnməyin yolları göstərilir. Eyni zamanda inteqrasiyalı təlimin reallaşdırılması ilə bağlı bir sıra problemlərin həlli yolları ilə bağlı təkliflər verilir.

***Açar sözləri:*** *təhsil, humanitar siyasət, qloballaşma, inteqrasiyalı bilik və bacarıqların sistemi.*
***Ключевые слова:*** *образование, гуманитарная политика, глобализация, система интегрированных знаний и умения.*
***Key words:*** *education, humanitarian policy, globalization, a system of integrated knowledge and skills.*

Ötən əsrin axırlarında Sovetlər İttifaqının daxilində baş verən özbaşınalıqlar, xaotik proseslər onun dağılmasına gətirib çıxardı. Dağılan bu dövlətlə birgə illərlə özünəməxsus formalaşmış güclü, sosial-iqtisadi, hüquqi strukturları da dağıldı. Dağılmadan sonra yaranan müstəqil dövlətlər yenidən özünütəşkilində Sovetlər Birliyindən qalanlara nə qədər ikrah hissi ilə yanaşsalar da, bir çox məsələləri miras olaraq nisbətən də olsa qəbul etməli oldular. Zaman keçdikcə bu məsələləri milli məqsədlərə müvafiq şəkildə ya təkmilləşdirməyə, ya da yenidən qurmağa çalışdılar. Milli dövlətlərin qurulmasında sosial-iqtisadi problemlərlə yanaşı humanitar sahələrdəki yoxsulluqlar özünü daha qabarıq şəkildə göstərdi.Yaranmış müstəqil dövlətlərin bir-birinin ərazisini, tarix və mədəniyyətini özününküləşdirmək sevdaları bir çox dövlətlər arasında qarşıdurmalara, müharibəyə gətirib çıxardı. Bədnam qonşularımızın qədim Azərbaycan torpaqlarını işğal etməsi, Krımın işğalı, Gürcüstanda Osetiya və buna sonsuz sayda misallar göstərmək olar. Belə olan halda aralarında konflikt olan ölkələrin vətəndaşlarının bir-birinə qarşı nifrət hissi dövlət siyasəti səviyyəsinə yüksəldi. Ermənistan dövlətinin bütün türk dövlətlərinə qarşı tutduğu qərəzli mövqeyinin onun apardığı daxili və xarici siyasətdə ana xətt olaraq, vətəndaşlarının da düşünmə tərzində bir alayarımçıqlıq yaratmışdır. Bunlara dinlərarası mübarizəni-hansı dinə mənsub insanların daha üstün olması, bir-birinə qarşı münasibətlərin açıq və gizli şəkildə dövlət siyasəti səviyyəsinə qaldırılması, xüsusilə xristian dünyasının müsəlman ölkələrinə qarşı tutduğu qərəzli mövqeni də əlavə etmək olar. Xristian dünyasının

"Müsəlman fundamentalizmi", "İslamofobi" adlanan kinli siyasətinə tuş gələn, dağılan müsəlman ölkələrinin vətəndaşlarının həm ölkələrində, həm də köçkün kimi üz tutduqları "Sivil Avropa" ölkələrində alçaldılması, insanlıq, eləcə də humanitar elmlərlə heç bir əlaqəsi yoxdur.

Burada əsas çətinliklərindən biri də müxtəlif siyasi sistemlərə aid olan dövlətlərin insanlarının dünyagörüşünün fərqli olmasıdır. Bu özünü əsasən bu dövlətlərin apardığı siyasətə uyğun təhsil proqramlarının müxtəlif tipli olması ilə yanaşı, həm o "soyuq müharibə"dən miras qalmış bir sıra stereotiplərin, həm də milli, mədəni, dini və irqi mənsubluqdan doğan "doğma" və "yad" münasibətlərinin insanlararası təmasda ilk addımda özünü göstərməsidir. Bunlar arasında daha acınacaqlı hal bəşəriyyət üçün qorxulu olan bu adamların yüksək ali təhsilə, peşəyə, vəzifəyə sahib olmalarıdır. Bunlara məişət zorakılıqlarını də əlavə etsək görərik ki, dünyada eləcə də respublikamızda "humanist insan" yetişdirilməsi məsələsi daha önəmli, təxirə salınmaz məsələdir. 21-ci əsrdə humanitar paradiqma bütün elmlər üçün əsas amilə çevrilir.

Dövlət müstəqilliyi əldə etdikdən sonra Respublikamızın siyasi mənzərəsinin dəyişməsi, iqtisadiyyatımızın bazar münasibətlərinə keçməsi, dünyada aparıcı dövlətlərlə inteqrasiyası və s. kimi dövlət maraqları köklü islahatların aparılmasını tələb edirdi. Aparılan islahatlarda əsas məqsəd kimi, iqtisadiyyatımızın bütün sahələrinin milli dövlət quruculuğuna yönəldirilməsinin zəruriliyini qeyd edən Azərbaycan dövlətinin qurucusu, xalqımızın ümummilli lideri Heydər Əliyev 31 avqust 1994-cü ildə Bakı şəhərinin təhsil işçiləri ilə görüşündə demişdir: "İndi Azərbaycan müstəqil dövlətdir. Respublikamız müstəqil dövlət kimi Azərbaycanın öz milli ideologiya konsepsiyasını yaradaraq, inkişaf etdirərək, şübhəsiz ki, təhsil sahəsini də milli məqsədlər, mənafelər əsasında qurmalıdır".

Təhsilin, əsasən də humanitar elmlərin istiqamətini milli dövlətçilik ənənələrinə yönəltmədən müstəqil dövlət quruculuğunun inkişafını təmin etmək mümkün deyildi. "Sovet hakimiyyəti illərində Azərbaycanda təhsilin inkişafı bütövlükdə Sovet İttifaqının qəbul edilmiş təhsil strategiyasının ruhuna və tələblərinə uyğun olaraq mərkəzləşdirilmiş qaydada həyata keçirilirdi. Müəyyən edilmiş strategiyadan kənara çıxmaq, milli xüsusiyyətlərə cavab verən təhsil konsepsiyası hazırlamaq, təbii ki, inzibati-amirlik idarəetmə metodlarını əldə rəhbər tutan bir cəmiyyətdə qeyri-mümkün idi".

Milli dövlət quruculuğunun inkişafını təmin edən humanitar siyasətin formalaşdırılması, milli və bəşəri xüsusiyyətlərə cavab verən təhsil, eləcədə humanitar elmlərin konsepsiyasının yenidən hazırlanması daha mürəkkəb bir proses olmasına baxmayaraq, Respublikamız müstəqillik dövründə, qısa bir zaman kəsiyində xeyli uğurlar əldə etdi.

İqtisadiyyatımızın sürətli inkişaf tempi, təhsilmizin Avropa və dünya məkanına inteqrasiyası, yeni tipli müasir məktəb şəbəkələrinin yaranması, yeni təhsil modellərinin tədris prosesinə gətirilməsini ön plana çəkir. Bu modellərin əsasını dünya təcrübəsi, təhsilin dinamik inkişafı və birdəfəlik təhsildən fasiləsiz təhsil prinsipinə keçid ideyaları təşkil edir. Ənənəvi təhsil formaları yeni təhsil modellərinə inteqrasiya olunur və vahid təhsil məkanının yaranmasına-qloballaşmaya, informasiyalı cəmiyyətin yaranmasına geniş imkanlar açılır. "Boloniya prosesi Azəbaycan üçün milli ali təhsil sistemini müasirləşdirməkdən və onu bizim cəmiyyətin yeniləşmiş simasına daha da uyğunlaşdırmaq üçün vaxtında meydana çıxmış imkandır" (6).

"Təhsil ilə qloballaşma arasında paralel

əlaqə mövcuddur. Qloballaşma dünyanın təhsil sistemini yeniləşməyə vadar edərkən, təhsil sistemindəki inkişaf da qloballaşma prosesini istiqamətləndirir və sürətləndirir. Bundan əlavə, gələcək cəmiyyət formalarının təhsil sisteminin yetişdirdiyi insan tipinə görə formalaşacağını düşündükdə, hər bir ölkənin öz təhsil sistemini nəyə görə qloballaşma prosesinə uyğunlaşdırmağa çalışdığını və qloballaşan dünyanın universal dəyərlərinə uyğun təhsil vermə istəklərini daha yaxşı başa düşmək olar”.

Humanitar siyasət özlüyündə cəmiyyətin bütün təbəqələrini əhatə etdiyindən özünəməxsus mürəkkəb bir konfiqurasiyaya, sistemə malik olmaqla yanaşı, həm də bu sistemin içərisində aparıcı - əsas sayılan və xüsusi çəkiyə malik olan sahələri-parametrləri vardır. Bu sahələrin ölçüləri aid olduğu cəmiyyətin bütövlükdə ümumi xüsusiyyətlərinin öyrənilməsinə, onun daxilin-də baş verən proseslərin axarının müəyyənləşdirilməsinə və ya ona təsir göstərməklə istiqamətinin dəyişdirilməsinə imkan verir. Qloballaşan dünyada hərtərəfli inkişaf yolunu seçmiş hər hansı dövlətin humanitar siyasətinin formalaşdırılmasının “modern layihə”sində əsasən qloballaşma ilə bağlı bir sıra məsələləri ön plana çəkirlər:

– Mövcud reallıqların vahid elmi düşüncəyə gətirməsilə, dünyanın universal mənzərəsinin yaradılması və bununla bağlı yetərli biliklərin formalaşdırılması.

– Bu biliklərin həyata tətbiqindən insanların xoşbəxtliyinin artmasına əmin olunması.

– İnsanlığın tərəqqisinə, müasirliyin keçmiş, gələcəyin isə müasirlik üzərində üstünlüyünə inamın artması.

Müasir təhsil sistemi, yeni texnologiyalar yaratmadan, humanitar siyasətə, multikultural mədəniyyətə söykənən intellektual potensialı formalaşdırmadan, heç bir dövlət beynəlxalq standartlara əsaslanan, gələcəyə istiqamətlənmiş, informasiyalı cəmiyyət qura bilməz. Bu vəziyyəti nəzərə alan Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev demişdir: “İnsan kapitalı inkişaf etmiş ölkələrin indiki durumunu müəyyən edən amildir. Həmin ölkələr təbii resurslar hesabına yox, intellektual potensiala, yeni texnologiyaların icad olunmasına, tətbiqinə görə inkişaf edirlər. Biz də bu yolu seçməliyik. Azərbaycan hökumətinin apardığı siyasətin başlıca məqsədi nefti- “qara qızıl”ı insan kapitalına çevirməkdən ibarətdir” (4).

Bu gün informasiyalı cəmiyyətin yaradılması yolunda inamla addımlayan Azərbaycan təhsil sistemi H.Əliyevin “Təhsil millətin gələcəyidir” çağırışını rəhbər tutaraq Azərbaycan dövlətini gələcəyə aparmağa qadir olan “keyfiyyətli, humanist təhsilin yaradılması” istiqamətində uğurlu addımlar atır.

ABŞ-ın görkəmli təhsil nəzəriyyəçisi Hovard Qardnez yazır: “İnsanların bir-birini başa düşməsi səviyyəsinin yüksəldilməsi baxımından nə olursa olsun təhsil öz məxsusi təsdiqini tapmalıdır. Bütün elmlərin əsas obyekti insan olmalıdır” [10].

Müasir dövrdə təhsil sistemi insanlarda daha önəmli olan bir sıra dəyərləri formalaşdırmaqla yanaşı, həm də onlarda bu dəyərləri qorumaq üçün bir məsuliyyət hissi də formalaşdırmalıdır. “İnsan millət, bəşəriyyət həyat dərslərinin təhlili, dərki əsasında əldə etdiyi biliklərdən faydalanmağı, intiqam hissindən daim uzaq olmağı bacardıqca, insanlığın zənginləşməsinə kömək göstərmək imkanını artırmış olacaqdır” [5].

Fransız filosofu və etnoqrafı Levi Striossanın fikrincə isə “XXI əsr humanitar elmlər əsri olacaq, ya da o olmayacaqdır”[9].

Təbiət elmləri sahəsində son dövrlərdə əldə olunan yüksək nailiyyətlərə baxmaya-

raq, humanitar elmlərə olan tələbat daha da qabarıq özünü göstərir. Müasir dövrdə təhsil alanların humanist olması təkcə hər hansı bir fərdin şəxsi keyfiyyətləri ilə bağlı məsələləri həll etmir, həm də onların sürətlə dəyişən sosial mühitə uyğunlaşmalarının və bir sıra uğurlar qazanmalarının açarıdır. Humanist təhsil eyni zamanda hər bir mütəxəssisin inkişaf perspektivlərini – fərdin kreativlik potensialını formalaşdırır. Təbiət elmləri, eləcə də onun məhsulu olan texnikanın istifadəsində bir xəttilik, ardıcıllıq mövcuddur. İnsanlar hər hansı bir texnika ilə təlimat üzrə daha rahat, mədəni davranırlar, nəinki bir-birləri ilə. Humanitar təhsil isə texniki təmayüllü təhsildən daha mürəkkəb quruluşa malik olması ilə yanaşı, həm də qarşılıqlı anlaşma, ehtimad da tələb edir. İnsanlar ünsiyyət zamanı daha geniş aspektə malik münasibətləri vahid müstəvidə tənzimləməli olurlar. Bu da özlüyündə humanist təhsilin əsas məqsədinin, şəxsiyyətyönlü və nəticəyönlü olması ilə yanaşı, təhsilalanların real həyata hazırlanmasında, ixtisas seçimlərində, yaradıcılıq qabiliyyətlərinin üzə çıxarılması və inkişaf etdirilməsində onlara əsas yardımçı olmasından ibarətdir.

Təhsil fəlsəfəsi dar mənada təhsillə əlaqəli düşüncələri analiz edərək onu şərh edən və bu şərhlərə uyğun olaraq təhsili yenidən sistemləşdirməyə çalışan fəlsəfi bir qaydadır. Lakin geniş mənada təhsil fəlsəfəsi insan və insanlığın tarixi, sosial və mədəni varlıq problemlərini araşdıran, buradan əldə olunan məlumatlarla insanı xüsusi dəyər və ölçülərlə ehtimal olaraq təyin edən, nəticə etibarı ilə bu formaya uyğun olaraq humanist bir təhsil anlayışı təklif edən elm sahəsidir.

İnsan zehininin insana yönəlməsi, yəni insanın insana, özünə münasibəti haqqında düşünməsinin tarixi kökləri məlum olmayan çox qədim zamanlara söykənməkdədir. Hələ qədim zamanlarda insanın özünə bir dəyər olaraq müraciətini sofistlərdə, xüsusilə də yunan filosofu Sokratın məşhur “özünü dərk et!” fəlsəfəsində də görmək olar. Sokrat fəlsəfəsindəki fikri cəhdin məqsədi insanın yenidən kəşfedilməsidir. İnsana ən böyük dəyər verilərək, o kainatın mərkəzində yerləşdirilir. İnsana bu dönüş sonrakı fəlsəfə məktəblərində də davam etdirilmiş və “özünü dərk et!” fəlsəfəsi günümüzə qədər gələrək inkişaf edərək, təkmilləşərək yeni mahiyyət kəsb etmişdir.

Təhsil fəlsəfəsinin təməlini insanları heyvanlardan ayıran xüsusiyyətlər təşkil edir. Bu xüsusiyyətlər, insanın tam quruluşunun cəmi olan fərdi biopsixi və biososial durumlarıdır. İnsani dəyərlər və əlamətlər bioloji varlıq olaraq təbiətdən, sosial varlıq kimi isə cəmiyyətdə baş verən ictimai-siyasi hadisələr-proseslərdən doğur. Daha doğrusu, insanı insan edən xüsusiyyətləri; fiziki, zehni, sosial özünü dərketməsi ilə yanaşı onu heyvandan fərqləndirən əsas əlamətlərindən biri də yaradıcı fəaliyyətə qadir olmasıdır. Nəticə olaraq təhsil fəlsəfəsi insanın yuxarıda saydığımız fərdi xüsusiyyətlərini, mədəni və fiziki ətrafını və bunlar aralarındakı əlaqələri araşdıran və bu araşdırmaların nəticələrinə uyğun olaraq müəyyən bir təhsil düşüncəsi-konsepsiyası formalaşdıran və bundan gənc nəslin tərbiyəsində istifadə olunmasını öyrənən bir elm sahəsidir.

Müasir dünyamızda sosial proseslərin xaotik axarı, sürətli texniki–tərəqqi, cəmiyyət və təbiətdə baş verən katakilizmalar, qloballaşma, maddi-mənəvi ehtiyaclar və bir sıra çətinliklər insana və onun dünyasına öz mənfi təsirini göstərməkdədir. Bu təsirlərə tab gətirməyən insan özünə nəzarəti zaman–zaman itirir. Nəticə etibari ilə o idarə olumaz olur, xoşagəlməz hadisələrə yol verir.

Son dövürlərdə dünyanın siyasi, sosial və iqtisadi mənzərəsi humanist insan

problemini daha mühüm tədqiqatlar obyektinə çevrilmişdir. Humanist fəlsəfə insanlıq sevgisini, ucalığı və yetkinliyini əsas tutaraq, insanın maraq, dəyər və ehtiyaclarını öyrənən bir təlimdir. Humanist fəlsəfəyə görə, insanlar digər canlılar kimi mexaniki davranışlar göstərməzlər, onlar "yer üzünün əşrəfidir". Humanist fəlsəfəyə sökənən təhsil qarşısına bir sıra məqsədlər qoyur:

1. Fərdə görə istiqamətlənmə və müstəqilliyə sövqetmə, öyrənməyi öyrətmək;
2. Öyrənənlərə nələrin öyrənilməsinə seçmə məsuliyyətini vermək;
3. Yaradıcılıq qabiliyyətinin üzə çıxarılmasında və inkişaf etdirilməsində yardımçı olmaq;
4. Fərqli düşünmə tərzi formalaşdırmaq.
5. Peşə seçimində yardımçı olmaq.

Respublikamızda humanist prinsiplərə söykənən, hərtərəfli inkişaf etmiş sosialyönümlü insanın formalaşdırılmasında təhsilin aparıcı funksiyaya malik olması bir daha əsas şərt kimi müəyyənləşdirildi. Şəxsiyyətin formalaşmasında təkcə bilik, bacarıq, vərdiş, müəyyən fəaliyyətlə bağlı funksional hazırlıq deyil, həm də onun şəxsi keyfiyyətləri: ictimai fəallığı, yaradıcılıq qabiliyyəti, bacarığı və s. xüsusiyyətlərə malik "bəşəri insan" kimi yetişdirilməsi əsas tələblərdən birinə çevrildi. Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda da "Birinci strateji istiqamət səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılmasına yönəlmişdir..." [2]. Şəxsiyyətyönlü təhsil qarşısına tam müstəqil, humanist fərd yetişdirmək məqsədi qoyulur;

Təhsil alana sıradan birisi kimi deyil, ona şəxsiyyət kimi baxılır. Ona əmr, məcbur etmək, eləmək olmaz, dəyər və hörmət vermək lazımdır.

Şəxsiyyətyönlü təlim prosesində təhsil alanlar ruhlandırılır, daha aktiv olmaları tövsiyə olunur, və özlərinin sərbəst seçim etməsi üçün həvəsləndirilir, öyrənmək istədikləri və ehtiyac duyduqları şeyləri ən yaxşı yüksək səviyyədə öyrənirlər.

Düşüncə tərzində çoxvariantlılıq, müxtəliflilik mükafatlandırılır.

Necə öyrəniləcəyini bilmək çox miqdarda məlumatları öyrənməkdən daha qiymətlidir. Öyrənmə qaydalarını, mənbələri və tətbiq sahələrini təhsil alanların özləri təyin etməlidirlər.

Müəllimlər bu işdə Karl Rocersin "Mən tələbələrə etibar eləməyə başladığım andan, müəllim və ekspertdən biliklərin alınması işində yardımçıya çevrildim" prinsipinə əməl edirlər.

Humanist nəzəriyyə ilə təhsil qanunu arasındakı mərkəzdə təhsilalan olmalıdır. Təhsil təhsil alanın maraq, qabiliyyət və ehtiyaclarının ödənilməsinə yönəlməklə, təlim prosesində sosial bir şəxsiyyət kimi təhsilalanın inkişafı əsas olmalı, özünəinam formalaşmalı, test və imtahan ağırlıqlı təhsil anlayışına qarşı olmamalı, duyğu və fərdi seçimlərinə hörmət edilməsi önplana çıxarılmalıdır. Dünyanın inkişaf etmiş bir çox ölkələrində humanist təhsil anlayışı üç əsas xüsusiyyəti özündə birləşdirir:

1. Tədris planının məzmunu baxımından: Təhsil proqramlarının məzmun etibarı ilə təhsilalanların gerçək həyatıyla birbaşa əlaqəli olan mövzulardan ibarət olması.
2. Tədris planının işlənməsi baxımından: İdraki, hissi mənada bütün təhsilalanların hər birinin fərd olması, tədris prosesinin şəxsiyyətyönümlü olması.
3. Tədris prosesinin təşkili və qrup quruluşu baxımından: Təhsil müəssisəsində humanist təhsili, fərd və qrupları dəstəkləyəcək işgüzar mühitin təmin edilməsi.

Humanist təhsil anlayışında yarışma yoxdur, qarşılıqlı əməkdaşlıq vardır, tədris planı məhdudluğu yoxdur, təhsil şəxsiyyətyönümlüdür, zamanla bağlı bir məhdudiyyət yoxdur.

Humanitar təhsil sahəsində çatışmazlıqlardan biri də təhsil sistemində aparılan islahatların həddindən çox olması və eyni zamanda bir-biri ilə əlaqələndirilməməsidir. Azərbaycan təhsili də müstəqillik dövründən sonra fasiləsiz islahatlara uğrayır. İslahatlar nəinki peşə hazırlığının məzmun və quruluşuna, eləcə də humanitar təhsil xarakterinə öz mənfi təsirini göstərməkdədir. Aparılan islahatlar və onların nəticələri təhlil olunmalı, daha uzun ömürlü, müasir, hərtərəfli, humanist prinsipləri özündə əks etdirən təhsil proqramlarının hazırlığında nəzərə alınmalıdır. Humanitar təhsil günün reallıqlarını özündə əks etdirməklə, yaradıcı, sərbəst, qeyri-standart təfəkkürə yönəlməli, təhsil alanların, mütəxəssis hazırlığı proqramlarında ümumilikdə deyil, ayrı-ayrı fənlərin məzmununda öz yerini tapmalıdır.

Dünyada təhsilin paradiqmalarının dəyişdirilməsi müşahidə olunur. Müasir təhsil sisteminin əsas ziddiyyətləri bir yandan sürətlə artan biliklərin həcmi, digər tərəfdən təhsil alanın bu bilikləri öyrənmə imkanlarının məhdudluğu arasındadır. Orta ümumtəhsil məktəblərində icbari tədris olunan fənlərin sayının çox olmasından şagirdlər hədsiz dərəcədə ağır tədris yükü ilə yüklənmişlər. Fənlərin böyük əksəriyyətinin bir-biri ilə əlaqəsi əsaslandırılmamışdır. Əlaqəsiz bilik çoxluğu isə həyat üçün zəruri olan, məktəb məzununun fəaliyyətinə, yaşayış tərzinə kömək göstərə bilən faydalı bilik və bacarıqlara çevrilə bilmir. Hazırda təkcə fizika üzrə 100, kimya, biologiya, iqtisadiyyat üzrə isə 50-dən çox elm sahəsi mövcuddur. Rusiya Federasiyasında 29 elmi istiqamətdə 3223 ali peşə proqramları üzrə kadr hazırlığı, təkcə Russiyanın Yer Quruluşu Universitetində iqtisadiyyatın idarə olunması ilə bağlı isə 379 istiqamətdə elmi tədqiqat işləri aparılır.

Qloballaşan dünya insanların inkişafına, yaşayış tərzinin yaxşılaşmasına xidmət göstərə biləcək, humanizm prinsipləri əsasında inteqrasiya olunmuş bilik və bacarıqlar sisteminə yiyələnməyi tələb edir. Bunları bir neçə yolla həyata keçirmək olar;

1. Təhsil proqramlarına peşə fəaliyyətində gərəkli olan, elmin son nailiyyətlərini özündə əks etdirən ən önəmli fənlərin daxil edilməsi.

2. Fənn proqramlarının inteqrasiyalı olması, dərs yükünün azaldılması və humanist-ləşdiriməsi.

3. Təlim metodlarının şəxsiyyətyönümlü olması.

“Müasir dövrdə təhsilin əsas vəzifəsi vətəndaş cəmiyyətində yaşayacaq insanın formalaşmasının vasitə və yollarını müəyyənləşdirməyə, onun yüksək mənəvi ideallara və dəyərlərə yiyələnməyə, insan həyatının mənasını anlamağa və dərk etməyə, öz şəxsi həyatında daim nailiyyətlər əldə etməsi üçün səy göstərməyə hazırlamaqdır ”.

Pedaqoji elmlərin böyük toplu şəklində inteqrasiya olunma halları mövcuddur. Eyni zamanda inteqrasiyalı təlimin reallaşdırılması ilə bağlı bir sıra problemlər də öz həllini gözləyir:

- ayrı-ayrı elmlərin əlaqəsini, eləcə də bu elmlərin vahid humanist məqsəd ətrafında (dünyagörüşü şəklində) inteqrasiya olunmasına, vahid elmi düşüncəyə gətirməsinə xidmət göstərən elmi-pedaqoji tədqiqat işlərinin aparılması;
- yetərli biliklər, inteqrasiyalı təlim ilə bağlı elmi-metodik ədəbiyyatın qıtlığının aradan qaldırılması və bu sahədə aparılan elmi-tədqiqat işlərinin nəticələrinin çap olunub bu sahədə çalışan mütəxəssislərə vaxtında çatdırılması;

- inteqrasiyalı təlimin keyfiyyətli mənimsənilməsinin təminində əvəzsiz rolu olan informasiya texnologiyalarından düzgün istifadə olunması sahəsində qabaqcıl təcrübənin öyrənilməsi və yayılması.

Humanitar təhsil günün reallıqlarını özündə əks etdirməklə, yaradıcı, sərbəst, qeyri-standart təfəkkürə yönəlməli, təhsil alanların, mütəxəssis hazırlığı proqramlarında ümumilikdə deyil, ayrı-ayrı fənlərin məzmununda öz yerini tapmalıdır.

***Rəyçi: p.e.d. İ.İsmayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. “Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı”nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 15 iyun 1999-cu il tarixli № 168 saylı sərancamı, Bakı şəhəri.
2. Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli Sərəncamı.
3. Əliyev H. Təhsil millətin gələcəyidir, Bakı: Təhsil, 2002.
4. Əliyev İ. Təhsil Azərbaycanın davamlı inkişaf strategiyasının ən öncül istiqamətlərindən biridir. Bakı: “Xalq” qəzeti, 2006, 16 sentyabr № 210.
5. Qaralov Z.İ. İdeologiya və mənəviyyat. Bakı: Hüquq ədəbiyyatı, 2014.
6. Mahmudov M.C. Dünyada təhsil sistemləri. Bakı: Mütərcim, 2014.
7. Mehrabov A.O. Müasir təhsilin konseptual problemləri. Bakı: Mütərcim, 2010.
8. Eğitim bilimine giriş. Pegem Akademi. 2012.
9. Нейманов Я.М. Образование в XXI века тенденции и прогнозы. М.: Алгоритм, 2002.
10. Пятьдесят современных мыслителей об образовании. От Пиаже до наших дней. М.: Изд. дом Высшей школы экономики, 2012.
11. http://www.xn-80adcqployo.xn--p1ai/asp- üzrə4.phtml
12. https://moeobrazovanie.ru/reiting_otraslei_nauki

**В.Оруджев**

**Проблемы гуманитарного образования**

**Резюме**

В статье рассматриваются вопросы гуманитарного образования. Изучаются проблемы, влияющие на «Модерн-проект» гуманитарной политики. В деле о воспитании независимых, гуманных личностей, с целью образования упирающихся на гуманитарную философию, также рассматривается роль личностно-ориентированного образования. Рассматриваются пути приобретения системы интегрированных знаний и умений, одновременно предлагается ряд предложений в решении проблем интегрированного образования.

**V.Orujov**

**Problems of humanitarian education**

**Summary**

Article deals with problems of humanitarian education. Issues of humanistic policy regarding globalization influencing to “Modern project” is enlightened. Besides, purposes of education leaning humanistic philosophy in growing independent, humanistic individuals, role of individual education are explained. Methods of mastering integrated skills and knowledge basing on humanistic principles are shown , as well as, some purposes regarding methods of settlement of problems on realization of integrated training is given.

*İslam həmrəyliyi*



# İSLAMİ DƏYƏRLƏR: MÜASİR DƏRKİ VƏ TƏDRİSİ PROBLEMLƏRİ

**Təyyar Salamoğlu,**
***filologiya üzrə elmlər doktoru, professor***

Məqalədə C.Məmmədquluzadənin “Danabaş kəndinin əhvalatları” əsəri “ədəbiyyatda islami dəyərlər: müasir dərki və tədrisi problemləri” kontekstində şərh olunur. Sovet ədəbiyyatşünaslığında dini inanc sisteminə tənqidi yanaşmanın bədii mətnin təhlilində çoxlu təhriflərə yol açdığı göstərilir. İslami dəyərlərə inamın C.Məmmədquluzadə qəhrəmanlarının, o cümlədən Məhəmmədhəsən əminin xarakterində yüksək insani keyfiyyətlər formalaşdırdığı məntiqi dəlillər və bədii mətn materialı əsasında sübut olunur. Ədəbiyyatda islami dəyərlərin bədii ifadəsinin müstəqillik dövrünün ədəbiyyatşünaslıq düşüncəsi ilə yenidən araşdırılmasına ehtiyac olduğu, əldə olunan nəticələrin tədris prosesinə gətirilməsi zərurəti önə çəkilir və konkret bir əsərin təhlili təcrübəsində bunun nümunəsi verilir.

***Açar sözlər:*** *ideologiya, siyasi rejim, ədəbiyyatşünaslıq, surət konsepsiyası.*
***Ключевые слова:*** *идеология, политический режим, литературоведение, концепция образа.*
***Key words:*** *ideology, political regime, literary criticism, concept of copy.*

Sovet ideologiyası və siyasi rejimin bu ideologiyaya söykənən ədəbiyyat siyasəti ədəbiyyatşünaslıq və tənqiddə bədii mətn haqqında həqiqəti heç vaxt axıra qədər demək imkanı verməyib. Bu mənada islami dəyərlər, müəllifin və qəhrəmanın dini dünyagörüşü bir qayda olaraq ya tənqid, ya təhrif, ya da tamam əks mövqedən təfsir olunub. Sovet tənqid və ədəbiyyatşünaslığının bu “ənənə”si indi də davam etməkdədir. Ədəbiyyat tarixlərində, ali məktəb dərsliklərində, xüsusən XX əsr Azərbaycan ədəbiyyatına münasibətdə islami dəyərlərə, qəhrəmanların dini inancına yanlış yanaşmalar hələ də qalmaqdadır. Qəhrəmanın dini inancına tənqidi münasibət və bu münasibəti müəllif mövqeyi kimi təqdim etmək üsulu bədii mətnlərin elmi cəhətdən obyektiv təhlilinə imkan vermir, bədii mətn həqiqətlərini, nəticə olaraq isə müəllif mövqeyini təhrif edir. Həmin təhriflərin tam orta və ali məktəb dərsliklərində yer alması tələbələrin və şagirdlərin, başqa sözlə, oxucuların onlara təqdim olunan əsərləri düzgün qavramasına mane olur, dini dünyagörüşlərinin formalaşmasına mənfi təsir göstərir, mənsub olduğu dinin dəyərlərinə inamını zədələyir. Bu mənada bədii əsərlərdə islami dəyərlərin ifadəsinin həqiqi mahiyyətini meydana çıxarmaq onların dərki və tədrisi istiqamətindəki problemlərin həllinə əsaslı kömək edə bilər. Ədəbiyyatda islami dəyərlər: müasir dərki və tədrisi problemləri baxımından Cəlil Məmmədquluzadənin “Danabaş kəndinin əhvalatları” əsəri xüsusi dəyər kəsb edir.

Ümumtəhsil məktəblərinin 10-cu sinif dərsliyində (Bakı: Maarif, 2001) əsərə

verilən təhlildən aşağıdakı hissə xüsusilə diqqəti çəkir: "Danabaş kəndinin əhvalatları" povestində köməksiz insanların faciəsinə səbəb olan güclü bir ictimai qüvvə var. Bu qüvvə müsəlman şəriəti və onun hökmlərini həyata keçirən ruhanilərdir. Hakimlər zor göstərərkən şəriətə arxalanırlar. Kimsəsizlər isə ona heç bir müqavimət göstərə bilmirlər. Xudayar bəy Zeynəbə şəriət yolu ilə sahib çıxır; qlava, molla Zeynəbi onun evinə getməyə məcbur edərkən şəriətin hökmünü yerinə yetirirlər; Zeynəb isə şəriət qarşısında məğlub olur" (1).

Qəhrəmanların taleyində şəriətin roluna verilən bu mənfi xarakteristika ümumtəhsil məktəblərinin "Ədəbiyyat" dərsliklərinə ədəbiyyat tarixi istiqamətində aparılmış çoxillik elmi tədqiqatların ümumiləşdirilmiş nəticəsi kimi daxil olur. Bununla belə, müasir elmi düşüncə islami dəyərlərin bu istiqamətli şərhləri ilə razılaşa bilməz. Problemə verilən bu cür elmi həll, yuxarıda qeyd etdiyimiz kimi, sovet ədəbiyyatşünaslıq düşüncəsindən gəlir və inersiyal şəkildə indiki ədəbiyyatşünaslıq təhlillərində də əsaslı yer alır. Halbuki bədii mətn həqiqətləri islami dəyərlərə, şəriət hökmlərinə bu tipli yanaşmaları rədd edir. Bədii mətn materialı ilə ədəbiyyatşünaslıq təfsirlərini qarşılaşdırsaq, əsl həqiqətə gedən yolu tapmaq mümkündür. Məhz bu həqiqətin tapılması "Danabaş kəndinin əhvalatları" əsərinin ümumtəhsil məktəblərində tədris olunmaq hüququnu özünə qaytara (2001-ci ildən sonra əsər ümumtəhsil məktəblərinin tədris proqramlarından çıxarılmışdır) və onun tam orta və ali məktəblərdə, eləcə də geniş oxucu kütləsi arasında həqiqi ideya-estetik dərkinə yol aça bilər.

Ədəbiyyatşünaslıqda Məhəmmədhəsən əmilərin "nəçərniyin divanxanası"na yox, Kərbəlaya və Allah divanına üz tutması vətəndaş düşüncəsindəki "məzar laqeydliyi"nin (Y.Qarayev) təzahürü kimi mənalandırılır. Məhəmmədhəsən əmini ictimai düşüncədən tamamilə məhrum hesab etmək, onun vətəndaş xarakterini "məzar laqeydliyi" ilə xarakterizə etməyin özü məntiqi düşüncənin müqaviməti ilə qarşılaşır. Biz Məhəmmədhəsən əminin boynuna qoyuruq ki, o, maddi dünyadan tamam əlini üzüb, ancaq və ancaq axirət dünyası və Kərbəla ziyarəti haqqında düşünsün və bu tip düşüncə onu dünyanın gəlişindən-gedişindən tamam xəbərsiz qoymuşdur. "Danabaş kəndinin əhvalatları"nın aparıcı qəhrəmanına münasibətdə bu nəzər nöqtəsi ədəbiyyatşünaslıqda indiyə qədər qüvvəsində qalır. Qəribədir ki, müstəqillik dövrününün ədəbiyyatşünaslıq düşüncəsində - ədəbiyyat tarixi və ali məktəb dərsliklərində, ayrı-ayrı tədqiqatlarda məsələ bəzən bir qədər də qatılaşdırılaraq təqdim edilir: "Yazıçının təsvir etdiyi cəmiyyət iki yerə bölünüb: kəndliləri despotcasına idarə edərək əlindəkini müxtəlif yollarla özününkü edənlər və son dərəcə kasıb, yoxsul yaşamalarına rəğmən hələ də islam zehniyyəti ilə yaşayaraq Xudayar bəylərə itaət edənlər. Əslində Xudayar bəyləri allahlıq iddiasına salan, onu əlidəyənəkli qoçuya çevirən də ikincilərin şəriət qanunlarına əməl etməsi, müti və qul vəziyyətində olmasıdır" (2). Ədəbiyyatşünaslıqda Məhəmmədhəsən əminin dini inancına bəzi hallarda kinayəli münasibət yer alsa da (Y.Qarayev yazır: "Həzrət Abbasın uzaq Kərbəladakı nəşi isə heç bir kömək əli uzatmır". Başa düşürük ki, bu cür münasibət sovet rejiminin ardıcıl ateist təbliğatı ilə birbaşa bağlı idi), elmi ədəbiyyatlarda ümumən Məhəmmədhəsən əminin dindarlığına ciddi yanaşılır. Lakin, eyni zamanda, onun avamlığının kökündə bu dindarlığın dayanmasına da işarə edilir: "Bütün bu və bu kimi bir çox başqa insani keyfiyyətlərə malik olan Məhəmmədhəsən əmi, eyni zamanda, avam və dindardır. Uşaqlıqdan dindar mühitdə böyüyüb,

"Allahu-əkbər" sədası eşidən Məhəmməd-həsən əmi "dünya malına əsla və qəti talıb deyil". Onun bu dünyada yeganə bir arzusu var: Kərbəla ziyarətinə gedib, "cəhardəh məsumu tamam eləmək" (3).

Sovet ədəbiyyatşünaslığı Məhəm-mədhəsən əmini avam, hərəkətsiz, vətəndaşlıq düşüncəsindən məhrum bir adam hesab edəndə bunun əsas səbəbini onun dini inancında axtarır. Məhəmmədhəsən əmi "şəriətin onsuz da artığa, canlı cənazəyə, mənəvi şikəstə çevirdiyi" (4). adam kimi xarakterizə olunur. Bəli, "Danabaş kəndinin əhvalatları"nın mətni də təsdiq edir ki, "bu kişi artıq dindar adamdır". Mətn bizə onu da deyir ki, "üç-dörd ildi Məhəmmədhəsən əmi Kərbəla ziyarətini qəsd edibdi". Bu da həqiqətdir ki, ziyarət ərəfəsində (son üç-dörd ayda) "ziyarət şövqü Məhəmmədhəsən əmini dünya işlərindən lap kənar eləyibdi". Bütün bunlar hamısı doğrudur, lakin bütün bunlar şəriətin Məhəmmədhəsən əmini "canlı cənazəyə, mənəvi şikəstə" çevirməsi demək deyil. Məhəmmədhəsən əminin "artıq dindar adam" olması onun nə mənliyini, nə şəxsiyyətini, nə sosial səviyyədə düşünmək qabiliyyətini əlindən almışdır. Əksinə, onun saflığı, təmizliyi, əliaçıqlığı, gözütoxluğu, insanlara hər vaxt yaxşılıq etmək istəyi, ailəcanlılığı milli xarakterin təbiəti ilə birbaşa bağlı olsa da, İslam dininə ürəkdən bağlılığının da burada ciddi rolu var. Məhəmmədhəsən əminin dünya işlərindən ayrı düşməsi müvəqqəti xarakter daşıyır. Psixoloji cəhətdən ziyarətə getməyə köklənməsi ilə bağlıdır.

Məsələ burasındadır ki, sovet ədəbiyyatşünaslığı məsələlərə ateist baxışla yanaşır. Professor F.Hüseynov yazır: "Danabaşlıları mənəvi cəhətdən şikəst edən, mənəvi azadlığını əlindən alan din, Allah, imam, peyğəmbər məhəbbəti uşaqlara ana südü ilə təlqin olunmuşdur" (5). Məhz ateist düşüncə sağlam dini inanca fanatizm damğası vurur. Ədəbiyyatşünaslıq İslam dini, Quran ayələri və şəriət hökmləri adından alver edənlərin hərəkətini dinin ictimai həyatda oynadığı mənfi rol kimi qələmə verir və məsələnin məhz bu tərəfində kifayət qədər maraqlı görünür. Elmi təfsirdə dinlə cəhalət və xurafat bilərəkdən eyniləşdirilir. C.Məmmədquluzadənin cəhalətə və xurafata qarşı mübarizəsi, həm də dinə qarşı mübarizəsi kimi mənalandırılır. Onun avamlıq və geriliyinin səbəbi, əsasən, din, cəhalət və xurafatda gördüyü estetik həqiqət kimi təqdim olunur. İctimai bəlaların səbəbini dini ehkamlarda, "şəriət qanunlarının saxtalığı"nda axtardığı yazıçının boynuna qoyulur. Halbuki "əhvalatlar"da şəriətlə şəriət adından alver edənlər arasındakı fərqin bədii əksi müəllifin estetik konsepsiyasının tərkib hissəsi kimi çıxış edir. Əslində müəllifin tənqidinin din, şəriət adından alver edənlərə qarşı çevrildiyi əsərdə bütün təfsilatı ilə əks olunur. Elmi ədəbiyyatda bir qayda olaraq, Zeynəbin faciəsində şəriətin həlledici rolu önə çəkilir; Xudayar bəyin də, qlavanın da, kənd mollasının da bilavasitə şəriət hökmü ilə Zeynəbi faciəyə sürüklədikləri əsas gətirilir. Halbuki bədii mətndə qazının şəriət hökmlərini saxtalaşdırdığı təfsilatı ilə əks olunur. Həqiqi şəriət qanunlarında qadının hüququnun qorunması, onun istəyinin əsas şərt olması bədii mətndə qazının öz dilindən çıxan sözlərdə əksini tapır. Qazının kəbin məsələsini saxta yolla və yalançı şahidlərlə reallaşdırmasına müəllifin xüsusi yer ayırması təsadüfi deyil.

Qazının sözləri müəllif mövqeyində şəriətlə şəriət adından alver edənlərin fərqləndirilməsi zərurətini önə çəkir. Bu zaman artıq qazı sözün birbaşa mənasında dinin və şəriətin təmsilçisi rolundan çıxır. O, qazılıq kürsüsündə oturdulmuş məmur kimi siyasi rejimi təmsil edir. Onun "hökm"ünün bütün hökumət məmurlarının yanında keçərliliyi də bunu sübut edir. Məsələnin

məhz bu tərəfinə görə, cəmiyyətdə baş verən sosial bəlaların (povestdə konkret olaraq üşçevdə qurulan matəmin) səbəbkarı kimi şəriətin ittiham edilməsi nə obyektiv tarixi, nə də estetik həqiqətə uyğun gəlir.

Sovet rejimindən bizi ayıran zamanın hüdudları genişləndikcə, “bədii tərəq-qidə idrakın və inikasın şərq, islam, azəri-türk modeli əvvəlki hüdudunda bərpa olun-duq”ca ədəbiyyatşünaslıqda “Məmməd-quluzadə özü də müsəlman idi və üstəlik özü də molla idi” etirafı yer almağa başlayır. Məhz bu “etiraf” işığında etiraf olunur ki, “Məmmədquluzadə ruhaninin saxtasını, mərsiyəxanın lotusunu, dərvişin hoqqabazı-nı, seyidin dələduzunu təsvir edirdi” (6). “Əhvalatlar”da ruhaniliyin baş təmsilçisi-qazı da bu “saxtakarlar”dan biri kimi təsvir edilmişdi.

Sovet ədəbiyyatşünaslığında bir çox hal-larda estetik həqiqətlərlə elmi həqi-qətlərin üst-üstə düşməməsinin, bir-birini tamamla-mamasının səbəbi obrazın (və həm də yazı-çının) dünyagörüşü ilə tədqiqatçının dünya-görüşü arasındakı fərqlə bağlıdır. Sovet ədəbiyyatşünası dünyagörüşü etibarilə mate-rialist, onun təhlil predmetinə çevirdiyi əsərlərin qəhrəmanları (burada Mirzə Cəlilin qəhrəmanları) isə idealistdir. Materialist dünyagörüşünün sahibi meymunun insana çevrilməsi həqiqətinə inanır. O, dünyanın Allah tərəfindən yaradılması və Allah iradəsi ilə idarə olunmasını qəbul etmir. Onun baxışlarına görə, idealizm heç bir elmi əsası olmayan çürük bir nəzəriyyədir.

Bu isə o deməkdir ki, Məhəmmədhəsən əminin qəzavü-qədərə, alın yazısına inamın-da qeyri-adi heç nə yoxdur. Ancaq prinsipial məsələ bu deyil. Prinsipial məsələ nədir? Kimin məntiqi daha həyatidir: ədəbiyyat-şünaslığın, yoxsa Məhəmmədhəsən əminin? Məsələ burasındadır ki, “əhvalatlar”ın qəhrəmanı haqqında mülahizə yürüdərkən onun düşüncələri, həyati qənaətləri axıra qədər elmi təhlil müstəvi-sinə gətirilmir. Halbuki Məhəmmədhəsən əminin gördüyü haqsızlıqlara, düşdüyü müsibətli vəziyyətə açıq etiraz edə bilməməsi son dərəcə həyati bir məntiqlə bağlıdır. Məhəmmədhəsən əmi haqsızlıqlara qarşı müqavimətini öz içində boğanda həmin bu həyati məntiqdən, gerçəkliyin öz mənti-qindən çıxış edir. Bu məntiq kifayət qədər əsaslıdır. O, özünün də, Xudayar bəyin də gücünü bilir. Özünün arxasızlığını, Xudayar bəyin arxasında daya-nanların kimliyini dəqiq təsəvvür edir. Məhəmmədhəsən əmi əlacsız qalıb “nəçər-nik divanxanası”na üz tutanda şikayət edib-etməmək onun düşüncəsini bütün varlığı ilə məşğul edir. Son nəticədə özünün də, Xudayar bəyin də gücünü düşüncə tərəzisinə qoyub çəkir. Xudayar bəyin gücü qat-qat ağır gəlir. O, “şikayət etməmək” qənaətində haqlı olduğuna bizi inandırır. Yazıçının Məmmədhəsən əminin düşüncə - monoloqu kimi təqdim etdiyi aşağıdakı parça tənqidi realizmin “kiçik” qəhrəmanının həqiqətən düşünmək, öz vəziyyətini, reallığı dürüst qiymətləndirmək bacarığına malik olduğunu göstərir: “Axırda üz qoydu nəçərnik divan-xanasına səmt. Məhəmmədhəsən əmi o səbəbə nəçərnik divanxanasına gəlmir ki, şikayət eləsin Xudayar bəydən, ya karvansa-raçıdan. Xeyr, Allah eləməsin. Məhəmməd-həsən əmi dinc adamdı. Şər ilə, şıltaq ilə arası yoxdu. Və bir də ki, indiki əsrdə şikayət eləməkliyin özü elə bir çətin işdi. Ondan ötrü ki, şikayətçi gərək yəqin eləyə ki, şikayəti möhkəm eləyə biləcək. Şikayət də şahidnən möhkəm olur. Amma Məhəm-mədhəsən əminin şahidi yoxdu. Ondan ötrü ki, pulu yoxdu. Söz yox, Xudayar bəyin də pulu yoxdu. Söz orasındadır ki, Xudayar bəyin əlində yekə dəyənək var. Nə vaxt kefi istəyir qaldırır, nə vaxt kefi istəyir yendirir.

Danabaş kəndində bu yekəlikdə zoğal dəyənəyinin hörməti heç pulun hörmətindən az deyil. O ixtiyar ki dəyənəkdə var, bəlkə

pulda yoxdu. Bu səbəblərin hamısı və bir də o səbəbə görə ki, Məhəmmədhəsən əmi əslində fəqir adamdı, bu səbəblərin hamısına görə Məhəmmədhəsən əmi heç vaxt Xudayar bəydən şikayət eləməzdi".

Ədəbiyyatşünaslıq "əhvalatlar"ın baş verdiyi mühitdə dəyənəyin qeyri-adi bir funksiya daşıdığını, qeyri-adi güc olduğunu etiraf edir: "Feodal dəyənəyi burada artıq kapitalist bir məqsədə xidmət edir: mümkün qədər çox var-dövlət, kapital, sərvət toplamaq! Bu faktda kənddə gedən maraqlı ictimai proses öz əksini tapır: kəndlilikdə təbəqələşmənin, kənd "kulakı"nın əmələ gəlməsi! Kapitalistləşməyə doğru meyil" (4). Lakin ədəbiyyatşünaslıq çox vaxt "dəyənək"in simvollaşdırdığı ictimai-siyasi prosesləri müəllif müşahidəsinin məhsulu kimi təqdim edir. "Dəyənək"lə simvollaşan "güc"ün, sosial münasibətlərdə oynadığı rolun Məhəmmədhəsən əmi tərəfindən bütün dərinliyi ilə başa düşülməsi nəzərə alınmır. Çünki bu halda Məhəmmədhəsən əmilər ədəbiyyatşünaslığın tənqidi realizmdəki "xırda adam" üçün müəyyənləşdirdiyi resept-qəlibdən çıxır. Halbuki bədii mətndə Xudayar bəyin gücü və gerçəklikdə "dəyənək"in oynadığı rolla bağlı əsərdə əksini tapan mülahizələr açıq-aydın Məhəmmədhəsən əminin daxili monoloqu, düşdüyü ağır vəziyyətlə bağlı öz-özünə vərə-vürdü kimi təqdim edilir. Hətta bu mülahizələri müəllif mövqeyinin ifadəsi kimi qəbul etsək belə, yenə də Məhəmmədhəsən əminin "bu səbəblərin hamısına görə" şikayət etməkdən vaz keçməsi ilə bağlı əsərdə özünə yer alan informasiya müəllifin bu qənaətləri Məhəmmədhəsən əminin başından keçən düşüncələr kimi təhkiyə etdiyini sübut edir. Əslində Məhəmmədhəsən əminin reallığı düzgün qiymətləndirmək bacarığı, şikayət etməməyin səbəbi ilə bağlı gətirilən məntiqi dəlillərin Məhəmmədhəsən əminin öz düşüncəsinin məhsulu olması vaxtı ilə bir tezis kimi ədəbiyyatşünaslıqdan keçmişdir. Professor M.Məmmədov 60-cı illərdə yazırdı: "Divan-xanaya gələn Məhəmmədhəsən əmini naçalnik öz yanına çağırır. Onun nə mətləbə gəldiyini soruşur. Ancaq Məhəmmədhəsən əmi təcrübəli olduğundan Xudayar bəydən şikayət etsə də, bunun bir nəticə verməyəcəyini, əksinə, bu işin özü üçün baha oturacağını bildiyindən naçalnikə heç bir açıq söz demir, Xudayar bəyin "adını çəkmir" və bununla da xatadan yayınmağa çalışır. Məhəmmədhəsən əmi yaxşı bilir ki, "pulu", yaxud "zoğal ağacı" olmayanın naçalnikdən kömək gözləməsi nahaqdır" (3).

Lakin professor M.Məmmədovun Məhəmmədhəsən əmi obrazı ilə bağlı orijinal müşahidələri "əhvalatlar"ın qəhrəmanını tədqiqatçının özündən əvvəlki araşdırmalardakından fərqli konsepsiya mövqeyindən dəyərləndirməyə gətirib çıxarmır. Son nəticədə o da Məhəmmədhəsən əmi obrazını avamlıq və qəzavü-qədərə inam müstəvisində dəyərləndirir. Halbuki professor M.Məmmədovun müşahidələri Məhəmmədhəsən əmi obrazını avam, düşünməyən və fəaliyyətsiz qəhrəman müstəvisindən çıxarıb tamamilə yeni bir müstəvidə təqdim etmək üçün əsaslı açar-başlanğıc rolu oynaya bilərdi. Buna görə də hesab edirik ki, müstəqillik dövrünün ədəbiyyatşünaslığında belə bəzən obraza stereotip və ideoloji əsaslı dəyərləndirmə ənənəsinin davam etdirilməsi elmi təhlildə müstəqillik dövrünün tələblərinə uyğun yeni konsepsiya mövqeyindən çıxış edə bilməməyin nəticəsidir: "Yazıçı Məhəmmədhəsən əmilərin faciəsinin faktorlarını açmağa çalışır: nəsibi yoxsulluq olan bu insanların yazıqlığının əsas səbəbi saf, təmiz və sadə olmaları və bir də şəriətə qapanıb qalmalarıdır" (2).

Mirzə Cəlilin qəhrəmanlarına yeni elmi mövqedən yanaşmanın bəzi cəhətləri İ.Həbibbəylinin tədqiqatlarının əsas istiqamətini təşkil edir. Görkəmli akademik sovet ədə-

biyyatşünaslığında “xırda adam” obrazlarının faciəsini onların dini inancı ilə bağlayan, dinə inamla nəinki fanatizmi eyniləşdirən, hətta dinə inamı avamlığın, fəaliyyətsizliyin əsası kimi təqdim edən konsepsiyaya tənqidi yanaşır. Məhz bu tənqidi yanaşma zəminində o, sovet ədəbiyyatşünaslığında Mirzə Cəlilin demokratik dünyagörüşünün dini dünyagörüşünə qarşı qoyulmasına, böyük sənətkarın “ateist” kimi qələmə verilməsinə etiraz edir. İ.Həbibbəyli yazır: “Uzun bir dövr ərzində, xüsusən sovet hakimiyyəti illərində Cəlil Məmmədquluzadə yanlış olaraq ateist, dinsiz bir şəxsiyyət və yazıçı kimi təqdim olunmuşdur. Əslində isə heç də belə deyildir” (7).

C.Məmmədquluzadənin sənət konsepsiyasında İslam dinini bu dini alver vasitəsinə çevirənlərədən qorumağın əsas yer tutduğunu, onun Allaha, peyğəmbərə, on iki imama qeyd-şərtsiz inamı və dini dünyagörüşünün əsasında da onlara inamın dayandığını akademik sənətkarın sözlərinə istinadla əsaslandırır: “Cəlil Məmmədquluzadənin özünün bu barədə yazdıqları hər şeyi açıq-aşkar ortaya qoyur, əlavə izahata heç bir ehtiyac qalmır. Böyük ədibin 1906-cı ildə “Molla Nəsrəddin” jurnalında dərc olunmuş “Niyə məni döyürsünüz?” adlı felyetonunda deyilir: “Əvvələn, mən ola-ola müsəlman qardaşlarıma vəz edən vaxt deyirəm: bir Allaha şitayiş edin, bir də peyğəmbərə və imamlara itaət edin” (7). Elə isə, stereotip düşüncədən uzaqlaşmağın, yeni yola çıxmağın vaxtı deyilmi? Akademik İ.Həbibbəylinin sənətkarın ateist olmadığını, dini inancında bütöv olduğunu aktuallaşdırmasının və bunu təkzibedilməz dəlillərlə əsaslandırmasının məntiqi ona gətirib çıxarır ki, Mirzə Cəlil onunla eyni dini görüşləri paylaşan qəhrəmanlarının dini inancına tənqid və kinayəli baxış ifadə edə bilməzdi. Bu məntiqlə akademik Mirzə Cəlilin qəhrəmanlarını təhlil müstəvisinə gətirərkən islam zehniyyətinin onların düşüncəsini kütləşdirməsini yox, daha çox bu qəhrəmanlarda dinə inamın formalaşdırdığı müsbət əxlaqi keyfiyyətləri önə çəkir: “...İnsan kimi Novruzəlinin, Usta Zeynalın xarakterindəki işığı, sədaqəti, mənəvi saflığı, daxili paklığı, halallığı Mirzə Cəlilin böyük sevgi ilə, ürək yanğısı ilə qələmə aldığını duymamaq, görməmək mümkün deyildir” (7). Bu mənada ədəbiyyatşünas alim tamamilə haqlı yazır ki, “böyük ədibin və ümumən mollanəsrəddinçilərin əsərlərindəki tənqidin xarakteri də bir çox hallarda düzgün dərk olunmur” (7). Bu qənaət olduqca əsaslıdır və vaxtında ədəbi dövriyyəyə buraxılmışdır. Çünki tənqidi realistlərin, o cümlədən Mirzə Cəlilin əsərlərindəki “tənqidin xarakteri”nin “bir çox hallarda düzgün dərk olunmaması” öz başlanğıcını sovet ədəbiyyatşünaslığının bu əsərlərə verdiyi təhlillərdən götürür. Tənqidi realistlərdə milli varlığa istiqamətlənmiş və “tənqid, yaxud gülüş yolu ilə islah etməklə dirçəlişə və mənəvi oyanışa nail olmağ”a (İ.Həbibbəyli) hesablanmış tənqid sosrealist tənqidi düşüncədə milli varlığın tarixi xarakterinə inkaredici münasibətlə əvəz edilirdi.

Buna görə də müstəqillik dövrünün ədəbiyyatşünaslıq düşüncəsinin təmsilçisi kimi İ.Həbibbəylinin C.Məmmədquluzadə yaradıcılığına yanaşmada sənətkarın “milli oyanış və dirçəliş” konsepsiyasını bütün reallığı ilə elmi təhlilin mərkəzinə çəkməsi, tənqidi realizmin estetikasında “müsəlman cəmiyyətini islah etməkdən ibarət olan məqsədi”ni (F.Köçərli) qabartması, “kiçik adam” obrazlarının təhlilində onların xarakterindəki xoş, işıqlı cəhətləri inadlı axtarışı məsələlərə tam yeni konsepsiya mövqeyindən yanaşmanın göstəriciləri kimi mənalanır. Bu konsepsiyada klassik irsi qorumaq stixiyası ilə birlikdə onun həqiqi məzmununu, bir çox cəhətdən geniş oxucu kütləsindən gizlədilmiş məzmununu açmaq

baş məqsədlərdən birinə çevrilir. Məhz bu cəhət çağdaş ədəbiyyatşünaslıq axtarışlarının müasirliyini şərtləndirir və bu "axtarış"ların tam orta və ali məktəb dərsliklərində, ədəbiyyat tarixlərində ehtiva olunması zərurətini önə çəkir.

***Rəyçi: prof. A.Bayramoğlu***

## İstifadə edilmiş ədəbiyyat


1. Mirəhmədov Ə., Əsgərli Z. Ədəbiyyat (10-cu sinif. Ümumtəhsil məktəbləri üçün dərslik). Bakı: Maarif, 2001.
2. Əhmədov B. XX əsr Azərbaycan ədəbiyyatı tarixi. I cild. Bakı: Elm və təhsil, 2011.
3. Məmmədov M. Cəlil Məmmədquluzadənin bədii nəsri. Bakı: Azərb. SSR EA nəşr., 1963.
4. Qarayev Y. Realizm: sənət və həqiqət. Bakı: Elm, 1980.
5. Hüseynov F. Adi əhvalatlarda böyük həqiqətlər. Bakı: Gənclik, 1977
6. Qarayev Y. Tarix: yaxından və uzaqdan. Bakı: Sabah, 1995.
7. Həbibbəyli İ. Ədəbi-tarixi yaddaş və müasirlik. Bakı: Nurlan, 2007.
8. Həbibbəyli İ. Cəlil Məmmədquluzadə: mühiti və müasirləri. Bakı: Azərnəşr, 1997.


**Т.Саламоглы**

**Исламские ценности: современное понимание и проблемы преподавания**

**Резюме**

В статье произведения Дж.Мамедкулузаде комментируются в контексте "Исламские ценности в литературе: современное понимание и проблемы преподавания". В советском литературоведении религиозная вера выражалась - как отрицательное явление. Поэтому моральные качества героев Дж.Мамедкулузаде невозможно было замечать с реального аспекта.

С начала периода независимости, после того, как религия была вопринита в качестве духовный ценности, эти вопросы стали требовать нового подхода к себе в литературоведении.

**T.Salamoglu**

**Islamic values: the problems in its contemprorary understanding and teaching**

**Summary**

The article interprets "Danabash kendinin ehvalatlari" (Stories of Danabash village) by Jalil Mammadkuluzade in the context of "islamic values in literature: the problems in its contemporary understanding and teaching". It specifies that the critical approach in the Soviet literary theory to religious belief system has led to a number of misinterpretations in the analysis of the literary work. Through logical evidence and literary text it is proved that belief in Islamic values formulate valuable humanistic features in the characters of J.Mammadkuluzade's heroes, including uncle Mahammadhassan.

The article underlines the necessity to re-study the literary reflection in literature of Islamic values with the literary understanding of the independence period and to bring the achieved results to the teaching process and includes an example based on the analysis of a definite literary work.

# “AÇIQ DƏRS” VƏ “USTAD DƏRSİ” MÜASİR



# TƏHSİL STRATEGİYASI KİMİ



**Vaqif Qurbanov,**
***pedaqogika üzrə elmlər doktoru***

**Ənvər İmanov,**
***pedaqogika üzrə fəlsəfə doktoru***



***Açar sözlər:*** *açıq dərslər, ustad dərsləri, müasir tələblər, dərsin təşkili formaları, yeni üsullar, gözlənilən nəticələr, son nəticələr, təqdimatlar, ümumiləşdirmələr, qiymətləndirmə normaları.*

***Ключевые слова:*** *открытые уроки, мастер класс, современные требования, формы организации, новые методы, ожидаемые результаты, окончательные результаты, презентации, обобщения, нормы оценки.*

***Key words:*** *open lessons, master lessons, modern requirements, organizational forms, new methods, expected results, final results, presentations, generalizations, evaluation norms.*

Çox hörmətli oxucu həmkarlara bildirmək istəyirik ki, bu mövzuda biz “Azərbaycan məktəbi”, “Ana sözü”, “Azərbaycan dili və ədəbiyyatı tədrisi” jurnallarında çıxışlar etmişik. Son məqalə “Azərbaycan dili və ədəbiyyatı tədrisi” jurnalının 2016-cı il 4-cü nömrəsində dərc olunmuşdur. Həmin yazı “Azərbaycan dili fənnindən açıq dərslərin təşkilinə verilən tələblər” adlanır. Bununla belə, bu mövzunun aktuallığını nəzərə alıb, ona yeni məzmunda bir daha qayıtmağı vacib bilib, aşağıdakı məsələləri xüsusi olaraq vurğulamağı məqsədəuyğun sayırıq.

Əvvəla, məlum məsələdir ki, hansı təhsil müəssisəsində işləməsindən asılı olmayaraq, müəllimin pedaqoji məharəti, ilk növbədə onun mütəxəssislər qarşısında nümayiş etdirdiyi dərslə müəyyənləşir. Pedaqoji ensiklopediyalarda bu barədə tərif və açıqlama, təxminən, belədir: Açıq dərslər tarixi ənənəyə çevrilərək davam edir və ancaq aktuallığı, müasirlik ruhu ilə xarakterizə olunur.

“Ustad dərsləri” də innovasiyalarla zəngin dərslərə deyilir. Bunların hər ikisini nəzəri cəhətdən hazırlıqlı, praktik cəhətdən səriştəli müəllimlər keçirirlər. Belə dərsləri respublikamızda ilin qabaqcıl müəllimi müsabiqəsi görmüş, ölkədə və xaricdə treninqlərdən çıxmış və sertifikatlar qazanmış müəllimlər uğurla nümayiş etdirə bilirlər. Respublikamızda İKT-dən istifadə sahəsində dövlət və özəl lisey və ümumtəhsil məktəblərində çalışan müəllimlər ustad dərsləri pedaqoji təcrübə keçən tələbələr qarşısında, ali pedaqoji məktəblərdə, konfranslarda, həm də təkmilləşdirmə kurslarında nümayiş etdirirlər.

Yuxarıda qeyd etdiyimiz kimi, belə dərslərin başlıca cəhəti müasir təlim texnologiyalarından səmərəli istifadə ilə zəruri bilik, bacarıq və vərdişlər formalaşdırmaqdan ibarətdir.

Əgər məsələnin tarixinə nəzər salsaq, onu deyə bilərik ki, bu məsələ həmişə aktual

olmuşdur.

"Müasir dərs" islahatı Aristotel dövründən bəri işlədilməkdədir. Müasirlik ruhu belə dərsə verilən birinci tələb hesab edilmişdir. Keçən əsrin ortalarında da bu məsələ aktuallığı ilə xeyli qabardılmışdı. Dərs prosesinin intensivliyi, rəngarəng formalarda qurulması, nəticələrin optimallığı alimlər tərəfindən nəzəri cəhətdən təhlil olunar və təcrübi cəhətdən ümumiləşdirilərdi. Pedaqogika tariximizdə belə dərslərin memarları sırasında Zərbəli Səmədov, Məhər Quliyev, İsrafil Şükürov, Mustafa Salamov, Məsmə Atakişiyeva, Abuzər Ağayev, Sayad Rüstəmova, Sona Tağıyeva, Rima Hənifəyeva, Məsmə Atakişiyeva, Aliyə Təhmasib, Davud Orucov, İmamverdi Əbilov, Nurpaşa Hümmətov, Rəfiqə Mustafayeva, Ofeliya Babayeva və başqa müqtədir müəllimlərimizin adları var. Təlim prosesində intensiv metodlardan istifadə sahəsində onların təcrübələri dövlət və hökumət tərəfindən də yüksək qiymətləndirilmişdir.

İyirmi birinci əsrin təhsil quruculuğundakı başlıca ideya fəal təlim metodologiyasında strateji xətlərin artmasından ibarətdir. Bugünkü müasir dərs necə qurulmalıdır sualına cavabı, ilk növbədə, görkəmli tarixi ənənələri olan pedaqoji universitetin metodist alimləri verməlidirlər.

Bizim anlamımızda təhsilin inkişafı elmi, elmin inkişafı təhsili doğurması dialektik prosesdir. Lakin bunlar ilin fəsilləri kimi baş verən təbii proses deyil. Çünki təbii proses insanların iradəsindən asılı olmur.

Müasir dərs ictimai şüurun ictimai inkişafa çatmaq istəyidir. Onda cəmiyyətin abhavası duyulmalıdır. Filosofların yazdıqları kimi, Aristotel zamanının renessansını doğuran o dövrün məktəbləri, dərsləri, təlim üsulları, müəllimləri olmuşdur. İndiki zamanda ixtiralar, kəşflər, açıqlamalar, kəşfə bərabər yeniliklər əsri olduğundan bu məsələ xeyli aktuallıq kəsb etmişdir. Pedaqoji prosesə müəllim təcrübəsinin nümunəvi göstəricisi olan dərsi layihələşdirmək, onun sadə və mürəkkəb planlarda qurmaq məharəti, şagird və ya tələbələri fəallaşdırmaq səriştəsi, prosesi optimal idarəetmə qabiliyyəti, xüsusən də, təhsilləndiricilik, tərbiyəedicilik və inkişafetdiricilik əmsallarının yüksək olması məsələləri daxildir. Dərs təlimin əsas təşkilat forması, həmçinin saat mexanizmi kimi qurulmuş mürəkkəb bir sistemdir. Onun da başlanğıcı, əsas hissəsi və əqli nəticələri var. Mərhum akademik Mehdi Mehdizadə bu barədə çox qiymətli fikirləri ilə tarixə düşmüşdür. Həmçinin də professor Əjdər Ağayev "Təlim prosesi: Ənənə və müasirlik" əsərində həmin ideyanı daha da dərinləşdirmiş və müasir tələblərlə zənginləşdirmişdir.

Müasir tələblər deyəndə başlıca olaraq bunlar nəzərdə tutulur: təlim prosesi tədqiqat prosesidir, şagird və ya tələbələr elmi mənbələri araşdırır, nəticələri müzakirə edirlər. Nəticələr summativ qiymətləndirilir. Bütün bunlar qarşılıqlı fəallıq və əməkdaşlıq şəraitində baş verirsə, yeni elmi ideyaların tətbiqi istiqamətində qurulursa, buna həm müasir dərs və həm də ustad dərsi demək mümkündür. Bunlar da nəticə etibarilə nitq və təfəkkürün qarşılıqlı şəkildə inkişaf etdirilməsindən və bir ümumidə inteqrasiyasından ibarət olur.

Məlum məsələdir ki, açıq və ya ustad dərsləri gündəlik və yaxud da kütləvi dərslərdən onunla fərqlənir ki, belə dərslərdə metodistlər, habelə öz təcrübəsini artırmaq istəyən gənc müəllimlər müşahidəçi qismində iştirak edirlər. Ancaq belə dərsləri öz fəaliyyətə çevirmək olmaz. Çünki belə dərs prosesləri kütləviləşdirməyin öz problemləri də var. Belə ki, bu tipli pedaqoji prosesin yuxarıda qeyd olunan prinsipial tələblər əsasında qurulmasının müşahidəçi-lər tərəfindən izlənməsi, müzakirə olunması, qiymətləndirilməsi fənn müəllimində psixo-

loji sıxıntı yaratmamalıdır. Eyni zamanda müşahidəçilər də bilməlidir ki, pedaqogikada dərs dinləmələrə verilən tələblər əxlaqi-etik tələblərdir. Odur ki, müəllim məhşər ayağına çəkmək yolverilməzdir. Deməli, dərsdə müşahidəçilər passiv dinləyici funksiyasını yerinə yetirməlidir. Mərhum professor Zahid Qaralovun yazdığı kimi, onların təlim prosesinə və yaxud müəllimin səlahiyyətinə hər hansı bir şəkildə müdaxilə etməsinə yol verilmir. Çünki pedaqoji prosesin yeganə səlahiyyət sahibi müəllimdir. Onun sinifdə sərbəst hərəkət etmək və qərarlar qəbul etmək səlahiyyətləri var. Odur ki, dərs dinləmələrə verilən bu tələblər müşahidəçiyə gün kimi aydın olmalıdır….

Uzun illik tarixi təcrübələrə, o cümlədən, nəzəri mülahizələrə istinad edərək demək olar ki, nümunəvi “açıq dərs”lər və ya “ustad dərsləri” qabaqcıl müəllimin pedaqoji fəaliyyətini əks etdirən güzgüdür. Makedoniyalı İsgəndərin döyüş güzgüsü düşmən ordusunu uzaqdan əks etdirərmiş. Deməli, açıq dərslər və ya ustad dərslərində pedaqoji fəaliyyətin geniş təhsilləndirici, tərbiyəedici və inkişafetdirici aspektləri əks olunmalıdır. Bu, bizim deyəcəyimiz birinci məqamdır.

İkinci məqam ondan ibarətdir ki, bu vasitədən kütləvi şəkildə istifadə olunması pedaqoji qaydalara uyğun gəlmir. Pedaqoji taktlara görə, 2-3 il stajı olanlardan açıq və ya ustad dərslər tələb olunmaz; bunlar yalnız qabaqcıl müəllim təcrübəsini ümumiləşdirmək və qiymətləndirmək vasitəsidir.

Müəllim adı cəmiyyətimizdə Azərbaycan bayrağı kimi rəmzə çevrilərək yüksəklərdə dalğalanır. Ümummilli liderimiz H.Əliyevin qeyd etdiyi kimi, “dünyada müəllim adından yüksək ad yoxdur”. Əlbəttə, bu ixtisası seçən adam da gərək o yüksək adı qorusun. Dərs onların pedaqoji fəaliyyətinin, həqiqətən də, aynası ola bilər. Belə bir güzgünün qarşısında dayanmaqla özümüzə başqalarının gözü ilə, müəllim-müşahidəçilərin gözü ilə, xüsusən də xeyirxah insanların gözü ilə baxmağa ehtiyac yarandığını nəzərə alıb bu prosesi də uğurla keçmək lazımdır. Çalışmalıyıq ki, hazırladığımız belə dərslər, əslində sınaq dərsləri kimi bu və ya digər dərəcədə aşağıdakı tələblərə cavab versin. Həmin didaktik tələblər bunlardır:

• Dərsliklərə dair metodik vəsaitlərdə yazılanlar nəzərə alınmaqla mövzu üzrə maraqlı və orijinal formada sövqedici qüvvədən istifadə edilməsi;

• Mövzu ilə əlaqədar problemin müəyyənləşdirilməsinə və həlli prosesinə şagirdlərin fəal cəlb olunması;

• Şagirdlər arasında ünsiyyət və əməkdaşlıq yaradılması;

• İnteraktiv təlim metodlarından məqsədyönlü istifadə edilməsi;

• Mövzunu dərs prosesində mənimsətməyin təmin olunması;

• Şagirdlərin idrak fəallığının açıq-aydın hiss edilməsi;

• Şagirdlərin bütünlüklə qiymətləndirilməsi üçün çevik formalardan istifadə olunması;

• Dərsin təhsilləndirici, tərbiyə edici və inkişafetdirici xarakterdə keçməsinin təmin edilməsi;

• Şagirdlərə fərdi və ya diferensial yanaşılması;

• Dərs vaxtını optimal bölüşdürməyin diqqət mərkəzində saxlanılması;

• Əyaniliyin kompleks təmin edilməsi, təlim texnologiyalarından və texniki vasitələrdən optimal istifadə edilməsi;

• Nitq rejiminə nəzarət edilməsi;

• Elmiliyin gözlənilməsi;

• Dərsin pedaqoji-psixoloji ovqata görə nikbinlik əhvali-ruhiyyəsində qurulması, müəllim-tələbə münasibətlərinin mənəvi-etik normalara cavab verməsi;

• Dərsin interaktivliyinə yüksək təminat verilməsi, elmi biliklərin və axtarışların nəticəsi kimi qazanılması;

• Müəllimin öyrədicilik bacarığı və ya səriştəsinin hiss olunması;

• Müəllimin nitqinin ədəbi tələffüz normalarına uyğunluğu ilə tələbələrə nümunə göstərə bilmək qabiliyyətinin ön plana çəkilməsi;

• Tələbələrin nitqinə nəzarətin özləri tərəfindən aparılmasının təmin edilməsi;

• İnteraktivliyi fəndaxili və fənlərarası əlaqələrdə qurmağın başlıca şərt sayılması;

• Tələbələrə ideyalar vermək, subyektiv mülahizə söyləməkdə və təkliflər irəli sürmək imkanlarının yaradılması.

Başqa bir neçə məqamı da burada qeyd etmək əhəmiyyətsiz olmaz. Əvvəla, qeyd olunan tələblər yalnız yuxarıdakılardan ibarət ola bilməz. Bu da təbiidir. Belə ki, müasir dərsə saat mexanizminin sayı qədər tələblər verilir ki, dərs mexanizmi saat kimi dəqiq işləsin. Bununla belə, ilin qabaqcıl müəlliminin keçirdiyi açıq dərslər də 12 prinsip üzrə müəyyən edildiyindən biz burada şərtləri çox göstərmədik. Əlbəttə, bizim açıq və ya ustad dərsləri ilə seçim etməyimiz qabaqcıl müəllimin yoxlanılması deyil, dərsliklərin ekspertizası deyil, yüksək vəzifəyə seçim məqsədi daşımır, sadəcə müsabiqə yolu ilə ən yaxşı müəllimləri üzə çıxarıb, onların əməyini layiq olduğu səviyyədə qiymətləndirməkdir.

Yeri gəlmişkən, müsabiqə yolu ilə müəllim seçimi tarixi ənənənin, yəni məktəbə, müəllimə yüksək tələbkarlıqla yanaşmanın bugünkü aktual formasıdır. Nə zaman ki bu formadan istifadə olunub, tarixi əhəmiyyəti ilə də yadda qalıb. Vaxtilə Əli bəy Hüseynzadənin müdir olduğu Bakı "Səadət" məktəbinə müəllimlər müsabiqə ilə seçilib və Üzeyir Hacıbəyli həmin məktəbə bu yolla qəbul olunub [2]

"Açıq dərslər" və ya "Ustad dərsləri" üçün hər hansı bir mövzunu seçmək məsləhət görülür, yəni didaktik əhəmiyyətliliyindən asılı olaraq inteqral mövzular seçilir və inkişafetdiriciliyi ilə tərbiyəediciliyi də nəzərə alınır.

Biz ADPU-da keçirilən müsabiqədə Azərbaycan dilinin tədrisi metodikası fənni üzrə inteqrasiya edicilik əmsalı yüksək olan mövzular kimi VI sinif "Azərbaycan dili" dərsliyində "Yusif Məmmədəliyev", "Əlif Hacıyev" və "Albert Eynşteyn" [3,4] mövzularının çox geniş didaktik imkanlarını müşahidə etdik.

Həmin dərslərdən başlıca məqsəd 4 məzmun xətti üzrə standartların reallaşdırılmasından ibarət idi. Dərsdə publisistik üslubda olan mətnlərin düzgün oxunması, dərk olunması və təhlil edilməsi bacarıqlarının nümayişi gözlənilən nəticələr idi.

Təlim prosesində hərəki slaydlardan istifadə olundu. Obyektlərin dəyişilməsi tələbələrin fikir dağınıqlığına səbəb olmadı; əksinə, ifadə mətninin yeni məzmuna-inşalara çevrilməsi ilə nəticələndi. Təlim prosesində İKT-nin tətbiqinə, interaktivlik yaradan məsələlərə və üsullara tərbiyəvi və inkişafetdirici müsahibə priyomları da əlavə edilmiş oldu ki, bunlar da ümumiləşdirmələr zamanı öz didaktik əhəmiyyətliliyini göstərdi.

"Ustad dərsləri"ni səciyyələndirən əsas məqamlardan biri də müəllimlərin metodik arsenalının zənginliyə malik olması ilə müəyyənləşir. Ədəbi tələffüz normaları ilə müşayiət olunan nitq və təfəkkür əməliyyatları müasir dərslərdə bir şeyin on tərəfli öyrənilməsini (Pestalotsi) təmin etdi. Ona görə də dərsin təhlili zamanı təsadüfən deyilmədi ki, ustad dərslərini memar müəllimlər qururlar.

Bugünkü ustad dərsləri 15 il bundan qabaqkı ustad dərslərindən daha yüksək məziyyətləri ilə seçilir. İndi belə dərslərdə həm bütün sinif üçün inteqral və ya hər bir şagird üçün diferensial tapşırıqlar qoyulur. Dərsin formasında ciddi irəliləyişlər yaradan qrupların liderləri olur. Liderlərin təlim prosesində fəallıqları cəmiyyətdə parlamentlərilər modelinə uyğundur: ayrı-ayrı fikirləri dinləyib, ümumiləşmiş nəticələrlə çıxışlar etmək.

Müasir dərsdən həyatın nəfəsi duyulmalıdır deyənlər bunu nəzərdə tuturlar.

Nəticədə tələbələr Yusif Məmmədəliyev - ixtiraçı alim, Əlif Hacıyevin - Azərbaycanın Milli Qəhrəmanı, Albert Eynşteynin - ideyalar generatoru kimi fəaliyyəti haqqında düşünmək və danışmaq bacarıqlarına yiyələnmiş olurlar. Yeri düşmüşkən, bu üç mətni xüsusi vurğulamağın bir səbəbi də ondan ibarətdir ki, müasir kurikulum təlimi ənənəvidən 180 dərəcə mətn üzrə işə geniş meydan verilməsi ilə, mətnin ifadə yazı hesab olunması, inşaya çevrilməsi və qiymətləndirilməsi ilə xarakterizə olunur.

Deməli, dil dərsləri əslində nitq (o da prosesdə olan dilə deyilir) dərsləri kimi anlaşılmalı və dil qaydaları məzmun xətti də dilçilik deyil, dilə yiyələnmək vasitəsi olan dil normaları kimi anlaşılmalıdır. Hazırda ali məktəblərə qəbul dil qaydalarına görə biliklə qiymətləndirilirsə də, 2-3 ilə 4 məzmun xətti üzrə (dinləyib-anlama və danışma, oxu, yazı və dil qaydaları) ölçüləcəyi qaçılmazdır. Bu vaxtacan Azərbaycan dilinin məzmunu deyəndə onun haqqında Azərbaycan dilçiliyi kimi düşünmüşük (və çox məntiqsiz bir səhv etmişik). İndi haqq-ədalət öz yerini tutmaqdadır.

Nəhayət, qayıdaq bilavasitə konkret mövzumuza. Azərbaycan Dövlət Pedaqoji Universitetində keçirilən "Ustad dərsləri" əhəmiyyətli bir tədbirin başlanğıcı olduğunu göstərdi və təkliflərimiz ondan ibarətdir ki, açıq və ustad dərslərin ADPU-nun filiallarında da keçirilməsi qabaqcıl təcrübənin yayılması və bu layihənin ənənəyə çevrilməsi demək olardı. Görünür Cəlilabad, Ağcabədi,Quba Şamaxı və Şəki filiallarımızda da belə dərsləri təşkil etməyin vaxtı çatmışdır. Biz bu tədbirə strateji istiqamətlər verməyi də öz üzərimizə götürür və alimlərimizi bu təşəbbüsə qoşulmağa çağırırıq.

***Rəyçi: prof. A.Zamanov***

## İstifadə edilmiş ədəbiyyat


1. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirlik. Bakı: Adiloğlu, 2006.
2. Quliyev Ə. Türk dünyasının dahi fikir və söz adamı. Azərbaycan dili və ədəbiyyatı tədrisi. Bakı, 2014, № 1.
3. Azərbaycan dili (6-cı sinif üçün dərslik). Bakı: Altun kitab, 2015.
4. Azərbaycan dili (6-cı sinif). Müəllim üçün metodik vəsait. Bakı: Altun kitab, 2013.


**В.Курбанов,**
**Э.Иманов**

**"Открытый урок" и "мастер-класс", как современная стратегия в образовании**

**Резюме**

"Открытые уроки" и "мастер класс" составляют две самых актуальных существенных стратегических линий современного образования в подготовке учителя. Существуют много проектированных и осуществляемых мероприятий в АГПУ; среди них «открытые уроки» и "мастер класс", показали свои преимущества в текущем учебном году в подготовке учителя. Необходимо предусмотреть и сейчас проведение таких занятий в филиалах и повышение результатов.

**V.Gurbanov,**
**A.İmanov**

**"Open lesson" and "Master lesson" like modern educational strategy**

**Summary**

"Open lessons" and "master lessons" are the most urgent two main strategic lines of modern education in the teacher's training. There are a lot of projecting and realizing measures in ASPU; "Open lessons" and "master lessons" showed their advantages in the training of teachers in the current academic year, and it is still necessary to foresee the conduct of such lessons in the branches and the enhancement of results.



# TƏHSİLİN KEYFİYYƏTİNİ DAİM DİQQƏT MƏRKƏZİNDƏ SAXLAYIRIQ

**Rəsmiyyə Məmmədova,**
***Şuşa Rayon Təhsil Şöbəsi, metodiki kabinetin direktoru***

Məqalədə qaçqın və məcburi köçkünlərə göstərilən qayğıdan, bu sahədə son vaxtlar görülən tədbirlərdən danışılır. Şuşanın işğalı, Xocalı soyqırımı yad edilir. Müəllimlərə göstərilən qayğıdan, rayon məktəbindəki şagirdlərin uğurlarından, Şuşaya qayıtmaq arzularından bəhs edilir.

***Açar sözlər:*** *təhsil sistemi, qaçqın və məcburi köçkünlər, müsabiqə, müasir tələblər.*

***Ключевые слова:*** *система образования, беженцы и вынужденные переселенцы, конкурс, современные требования.*

***Key words:*** *education system, refugees and internally displaced persons, competition, modern requirements.*

Azərbaycan Respublikası Prezidentinin apardığı sosial tədbirlər çərçivəsində məcburi köçkünlərin mənzil problemləri ilə yanaşı təhsil müəssisələrinin günün tələbləri səviyyəsində qaldırılması Şuşa müəllimlərinin də şansını artırmış, onları daha səylə işləməyə həvəsləndirmişdir. Cocuq-Mərcanlıda yaradılan şərait istiqamətin hara olduğunu bir daha müəyyənləşdirmişdir. Hamı bilir ki, vəziyyət belə qalmayacaqdır. Bu qayğıya cavab olaraq, hər kəs öz vəzifəsini və məsuliyyətini yaxşı dərk edir.

Bu gün Azərbaycan təhsili özünün uğurlu inkişaf mərhələsini yaşayır. Son illərdə təhsil sahəsində aparılan köklü islahatlar öz nəticələrini verməkdədir. Bu inkişaf təhsilin bütün pillələrində özünü göstərir. Milli təhsilimizə dövlət qayğısının ildən-ilə artması onun Avropa standartlarına yaxınlaşmasını təmin edir.

Şuşa rayonunun pedaqoji kollektivləri də təhsilin inkişafını daim diqqət mərkəzində saxlayır. Hal–hazırda Şuşa rayonunda 21 ümumi təhsil məktəbi fəaliyyət göstərir. Həmin məktəblərdə çalışan 480 nəfərə yaxın pedaqoji işçi 4000-dən artıq şagirdin təlim-tərbiyəsi ilə məşğul olur. Müəllimlərin böyük hissəsi ali təhsillidir. Təhsil sisteminə daxil olan məktəblərin 14-ü Bakıda, 7-si respublikanın müxtəlif bölgələrində fəaliyyət göstərir. Son illərdə rayon üzrə 7 nəfər “Əməkdar müəllim” fəxri adına, 7 nəfər isə “Tərəqqi” medalına layiq görülüb. 1 nömrəli tam orta məktəbin fizika müəllimi Aidə Süleymanova “İlin ən yaxşı müəllimi” müsabiqəsinin qalibi olmuşdur.

Qədim Şuşa indi düşmən əlində olsa da onun səhiyyəsi, təhsili daim dövlətimizin diqqət mərkəzindədir.

2010-cu ildə cənab Prezidentin Sərəncamı ilə Cənubi Qafqazda birinci dünyəvi məktəb olan Şuşa şəhər 1 nömrəli tam orta məktəbin 180 illik yubileyi dövlət səviyyəsində qeyd olunmuş, yeni məktəb binasının tikintisi üçün maliyyə vəsaiti ayrılmışdır. 2015-ci ilin sentyabrında Yasamal rayonunda ən müasir tələblərə cavab verən yeni məktəb binası tikilərək müəllim və şagirdlərin istifadəsinə verilmişdir. Hal-hazırda həmin binada 500

nəfərdən artıq şagird təhsil alır.

Sanatoriyalarda , pansionatlarda uyğunlaşdırılmış binalarda yerləşən və çətin şəraitdə fəaliyyət göstərən məktəblərimizin pedaqoji kollektivi var qüvvə ilə çalışır, səy göstərir, vətənimiz, dövlətimiz üçün savadlı , bilikli gənclər hazırlayır. Bunun nəticəsidir ki, ali məktəblərə qəbul olan məzunların sayında son illərdə artım müşahidə olunur. Rayonun ümumi təhsil məktəblərinin şagirdləri respublika üzrə keçirilən müsabiqələrdə də fəal iştirak edirlər. Belə ki, Azərbaycan xalqının Ümummilli lideri Heydər Əliyevin anadan olmasının 94 – cü ildönümünə həsr olunmuş “Ən yaxşı təqdimat” müsabiqəsində rayonun ümumtəhsil məktəblərinin IX – XI sinif şagirdləri iştirak etmişdir. Müsabiqənin məktəb mərhələsinin qalibi olmuş 18 şagird rayon turunda iştirak etmək hüququ qazanmışdır. 7 nömrəli tam orta məktəbin X sinif şagirdi Könül Ələkbərli rayon turunda da uğurla iştirak edərək I yerə layiq görülmüş və müsabiqənin respublika mərhələsində rayonumuzu təmsil edərək III yeri tutmuşdur.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin tapşırığı ilə keçirilən “Ölkəmizi Tanıyaq” layihəsi çərçivəsində rayonumuzun məktəbliləri respublikanın müxtəlif bölgələrində olmuş, ölkəmiz haqqında biliklərini genişləndirmiş, doğma vətənimizi daha dərindən tanımaq imkanı qazanmışlar.

Xocalı soyqırımının 25-ci ildönümü ərəfəsində tarixi həqiqətlərin daha yaxından öyrənilməsi, mənfur qonşularımız və onların havadarları tərəfindən törədilən fəlakətlərin faktlarla gənclərə çatdırılması məqsədilə rayonun ümumtəhsil məktəblərinin yuxarı sinif şagirdlərinin Azərbaycan Respublikası Hərbi Prokurorluğunun inzibati binasında yaradılmış Memorial Soyqırım Muzeyinə ekskursiyaları təşkil olunmuşdur.

“Fövqəladə hallar uşaqların gözü ilə” respublika müsabiqəsində rayonun ümumi təhsil məktəbləri üzrə 10 nəfər şagird iştirak etmiş, onlardan 1 nəfər – 3 nömrəli tam orta məktəbin VIII sinif şagirdi Fərhadova Südabə Fərhad qızı respublika mərhələsində həvəsləndirici yerə layiq görülmüşdür.

IV İslam oyunlarının təbliğinə həsr olunmuş respublika rəsm müsabiqəsində 12 nömrəli tam orta məktəbin IX sinif şagirdi Bayramlı Anar Emil oğlu zona mərhələsində II yerə layiq görülmüşdür.

Fevral ayında rayonun ümumi təhsil məktəblərinin IX siniflərində oxuyan şagirdlərin buraxılış imtahanlarına hazırlıq məqsədilə “Azərbaycan dili” və “Riyaziyyat” fənlərindən sınaq test imtahanları təşkil edilmişdir. İmtahanların keçirilməsinin əsas məqsədi şagirdlərin real biliyinin üzə çıxarılması, eyni zamanda onların sual kitabçaları, cavab kartları ilə işləmək vərdişlərinin daha da zənginləşdirilməsi olmuşdur. Buraxılış imtahanlarına hazırlığın vəziyyəti və sınaq imtahanlarının nəticələri Təhsil Şurasında müzakirə olunmuşdur.

Şuşanın işğalının ildönümü ilə əlaqədar rayonun ümumtəhsil məktəblərində “Doğma Şuşamıza qayıdacağımız günü səbirsizliklə gözləyirəm” mövzusunda inşa yazı və rəsm müsabiqələri keçirilmişdir. İl ərzində keçirilən müsabiqələrdə fərqlənən şagirdlər təhsil şöbəsinin Fəxri fərmanı ilə təltif olunmuşdur.

Gənclərimiz, yeniyetmələrimiz arasında Şuşa haqqında, onun tarixi keçmişi, bu günü və Şuşa uğrunda qəhrəmancasına həlak olan insanlar barədə, erməni təcavüzü və erməniliyin nə olduğu ilə əlaqədar daim maarifləndirmə işləri aparılır.

Bütün bunlarla yanaşı “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın həyata keçirilməsindən irəli gələn vəzifələrin həlli də Şuşa rayonunun ümumi təhsil məktəb müəllimləri

qarşısında duran ən mühüm məsələlərdəndir. “Dövlət Strategiyası”nın əsas istiqamətlərinin həyata keçirilməsi ilə bağlı son dövrlər bir sıra qərarlar qəbul olunmuşdur ki, bunların da içərisində möhtərəm Prezidentimiz İlham Əliyev cənablarının “Dövlət ümumi təhsil müəssisələrində çalışan bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin dərs yükünün və əməkhaqqının artırılması haqqında” 16 yanvar 2015-ci il tarixli Sərəncamı xüsusi əhəmiyyət kəsb edir.

Dünyada baş verən proseslər nəticəsində yaranmış əlverişsiz şəraitdə belə bir Sərəncamın imzalanması dövlət başçısının müəllimlərə göstərdiyi diqqət və qayğının, daim sadə insanların rifahı haqqında düşünməsinin bariz nümunəsidir. Bununla yanaşı, Sərəncam həm də müəllimlərin biliyinə və səriştəsinə görə əməkhaqqı sisteminin müəyyənləşdirilməsi ilə bağlı “Dövlət Strategiyası”nda yer almış hədəflərdən birinin həyata keçirilməsi istiqamətində atılan mühüm bir addımdır. Müəllimlərin maddi şəraitini yaxşılaşdırmaq məqsədi ilə verilən bu Sərəncama müvafiq olaraq rayon üzrə diaqnostik qiymətləndirmədən keçmiş 365 təhsil işçisinin də əmək haqqı 2017-ci ilin yanvar ayından artırılmışdır ki, bu da ümumtəhsil məktəblərində təhsilin keyfiy-yətinin yüksəldilməsinə şərait yaratmışdır.

Prezidentimiz cənab İlham Əliyev ümumilikdə qaçqın və məcburi köçkünlərin həyat şəraitinin yaxşılaşdırılması, onların məskunlaşdıqları ərazilərdə maksimum rahatlığın yaradılması ilə bağlı sərəncamlar imzalamışdır. Məcburi köçkün məktəblərinə daha həssaslıqla yanaşılması, bütün məktəblərin maddi-texniki səviyyəsinin yüksəldilməsi birmənalı olaraq dövlət başçısının diqqət mərkəzindədir. Əminik ki, tezliklə tarixi yurdumuz olan doğma Şuşamıza qayıdacaq və daha yaraşıqlı məktəb binalarının sinif otaqlarında Azərbaycanımız üçün müasir gənclər yetişdirəcəyik.

***Rəyçi: dos. R.Qəndilov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası.// Azərbaycan məktəbi, 2013, № 5.
2. Yeni Təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.
3. Təhsilin konseptual problemləri. Bakı, 2008.
4. Azərbaycan Respublikası Ümumi Təhsilin Milli Kuikulumu. Bakı, 2006.
5. Ağayev Ə. Seçilmiş pedaqoji əsərləri. 2 cilddə, I cild. Bakı, 2011.

**Р.Мамедова**

**Качество образования все время в центре внимания**

**Резюме**

В статье повествуется о заботе, уделённой беженцам и вынужденным переселенцам, а также о мероприятиях проведенных в этой области в последнее время. Упоминаются - оккупация Шушы, Ходжалинский геноцид. Рассказывается об оказанной заботе учителям, об удачах школьников в районной школе и, о желаниях возвращения в Шушу.

**R.Mamedova**

**We keep the quality of education in the center of attention**

**Summary**

The article talks about care for refugees and internally displaced persons, and recent events in this area. The occupation of Shusha, Khojaly genocide are remembered. It is mentioned about the care shown to the teachers, the successes of the students of the district school, the desire to return to Shusha.



# TEXNOLOGİYA FƏNNİNİN TƏDRİSİNDƏ İNTEQRATİV ƏLAQƏLƏRİN İDARƏ OLUNMASI

**Məmməd Kazımov,**
***ATİ-nin aparıcı elmi işçisi, p.f.d.dosent, elmlər doktoru proqramı üzrə doktorant***

***Açar sözlər:*** *inteqrasiya, təbiət fənləri, əlaqəli təlim, idarəetmə, yaradıcı təfəkkür, müasir texnologiyalar, ağac materialları, qida məhsulları, yeni yanaşmalar.*

***Ключевые слова:*** *интеграция, предметы природоведении, управление, творческое мышление, современные технологии ,древесные материалы, продукты питания, новые подходы*

***Key words:*** *integration, science, integrative learning, managing, creative thinking, modern technologies, wooden materials, food products, new approaches*

Ölkəmizdə fəaliyyət göstərən orta ixtisas təhsili sistemində digər təhsil sistemlərində olduğu kimi təhsil siyasətinin uğurla həyata keçirməsində əsas rol oynayır. Hazırda orta ixtisas təhsili müəssisələrində təlim prosesinin idarə olunmasında ən vacib məsələlərdən biri kredit sisteminin tələblərini yerinə yetirməsi, müasir təlim texnologiyalarının tətbiqinə nail olunması, təlimdə inteqrasiya metodlarından geniş istifadə etməklə təlimin keyfiyyətini yüksəltmək və yüksəkixtisaslı mütəxəssis hazırlığında nəticəyönümlülük prinsipinə riayət edilməsi və səriştəlilik qabiliyyətinin inkişaf etdirilməsinə nail olunmasıdır. Bu göstərilənləri tədris prosesində həyata keçirmək üçün təhsil standartlarının və kurikulum tələblərinin yerinə yetirilməsinə xüsusi diqqət ayırmaqdır. Belə bir tədris tələblərinin yerinə yetirilməsi nəticəyönümlü təhsilin inkişafına müsbət təsir göstərər, şəxsiyyətin formalaşmasına, öz ixtisasına dərindən yiyələnə bilən mütəxəssis hazırlığının inkişafına zəmin yaradar və fənlərin əlaqəli şəkildə öyrənilməsinin zəruri olması ön plana çəkilər (1, 3).

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2013-cü il oktyabrında 24-də respublika təhsil sisteminin inkişafına müsbət təsir göstərə bilən və mütərəqqi təhsil islahatlarının həyata keçirilməsini nəzərdə tutan "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nı müəyyən edən sərəncam imzalamışdır. Bu sərəncamla təhsil islahatlarının aparılması və dövlətin təhsilin inkişafı haqqında strateji hədəfləri müəyyən olunur. Müasir orta ixtisas təhsili sistemi qarşısında qoyulan ən önəmli vəzifələrdən biri də, yüksək intellektual qabiliyyətə malik olan, yaranmış problemli vəziyyətdə məntiqi nəticə çıxarmağı bacaran və həyati bacarıqlarının inkişaf etdirilməsinə nail ola bilən mütəxəssislərin yetişdirilməsidir (3, 4). Orta ixtisas təhsili müəssisələrində fənlərin interaktiv təlim üsulu ilə əlaqəli öyrənilməsini əsas götürən, yeni təlim metodların tətbiq olunmasına üstünlük verən və müasir idarəetmə səriştəsinə malik olan mütəxəssisin yetişməsinə müsbət töhvə verəcəkdir. İnteqrativ təlim tələbələrin məntiqi təfəkkürünün inkişafında bir-birinə yaxın olan fənlərin öyrəndikləri mövzuların dərindən mənimsənilməsində, oxşar mövzuların öyrənilməsinə

kompleks yanaşma zamanı əsaslı rol oynayır. Fənlərarası əlaqələr və onların inteqrasiyası vaxt ehtiyatına qənaət edir. Bu vaxt təkcə hər hansı sahənin əsaslı şəkildə öyrənilməsi üçün deyil, həm də mənimsəmənin keyfiyyətlə yerinə yetirilməsinə, fənlərarası mövzuların öyrənilməsində əks əlaqənin qurulmasına, təlim prosesinin idarəolunmasına, müəllim tələbə dialoqunun qarşılıqlı anlaşma şəraitinin yaradılmasına şərait yaradır. Mövzuların öyrənilməsi prosesində inteqrasiyanın yaradılması nəticə etibarı ilə hər hansı bir sahəni formalaşdırır, sərbəst elmi mübadilənin yaradılmasına və təhsili inkişaf etdirən yeni konsepsiyanın əsasını qoyur.Bir neçə fənlərlə yanaşı "Texnologiya" fənninin əlaqəli şəkildə öyrənilməsi bu fənin hərtərəfli və dərindən öyrənilməsinə istiqamət verir (4, 5, 6).

Texnologiya fənninin digər fənlərlə əlaqəli öyrənilməsinin əsas məqsədi yeni sosial-iqtisadi şəraitdə tələbələrin müstəqil həyata, kütləvi və perspektivi olan peşələr üzrə hazırlanmalarını, ümuməmək bacarıq və vərdişlərinə yiyələnmələrini, yaradıcı düşüncə və aktiv fəaliyyət əsasında müxtəlif şəraitlərə asanlıqla uyğunlaşmalarını təmin etməkdir (7).

Gələcək nəslin hərtərəfli inkişaf etmiş şəxsiyyət kimi formalaşması , yüksək biliyə, savada, bacarığa, geniş dünyagörüşünə malik olması üçün texnologiya fənninin düzgün və dərindən tədris edilməsini, bunu həyata keçirmək üçün gələcəyin müəllimlərinin fənnin özünü yaxşı mənimsəmələrini, həmçinin bu fənnin məktəblərdə tədris edərkən şagirdlərə düzgün çatdırılmasını, texnologiya fənninin tədrisi metodikasının nəzəri məsələlərini dərindən mənimsəmələrini, fənnin anlaşıqlı tədris olunması qaydalarını, prinsiplərini onlara aşılamaqdan ibarətdir. Fənnin tədrisində digər fənlərlə inteqrativ əlaqələrin qurulması fənnin əhatəli və dərindən öyrənilməsinə istiqamət verir. Fənni mənimsəyən hər bir tələbə aşağıdakıları yerinə yetirməlidir: (8)

-"Texnologiya fənninin tədrisi metodikası" fənni üzrə müasir istehsalatın ümumi elmi əsasları ilə tanış olmalıdır;

- istifadəsi geniş yayılmış, müasir alət, cihaz və avadanlıqlarla təhlükəsiz iş rejiminin yaratmaq bacarığına malik olmalıdır;

- öz fəaliyyətində işgüzar vərdişlərin yaradılmasının əsasını qoymalıdır;

- tədris prosesində mənimsədiyi nəzəri biliklərin təcrübəyə tətbiq etməyi bacarmalıdır;

- materialların (ağac, dəmir, parça, ərzaq, təbii və süni lif və s.) emal texnologiyaları prosesində praktik vərdişlərə yiyələnməli, məmulatları, detalları, ərzaq məhsullarını hazırlayarkən yaradıcı fəaliyyətinin inkişaf etdirilməsinə xüsusi fikir verməlidi;

- konstruksiya etmə, modelləşdirmə, dizayn və abstrakt fantaziya qabiliyyətinin formalaşdırmasını inkişaf etdirməlidir;

- texnoloji proseslərin öyrənilməsində yaradıcı təfəkkürü inkişaf etdirməli, quraşdırma qabiliyyətini formalaşdırmalı və estetik dünyagörüşünü genişləndirməlidir;

- müasir təlim metodlarının texnoloji proseslərə tətbiq etmək bacarığına malik olmalıdır;

- nəzəri biliklərin və praktik məşğələlərə aid bacarıqların yüksəldilməsinə xüsusi fikir verməli, tədris və təcrübi məşğələləri düzgün təşkil etməyi bacarmalı, əyani təlim vəsaitlərindən və tədris resurslarından istifadə etmyi bacarmalıdır;

- texnologiya fənninin tədrisi üzrə maddi texniki baza haqqında məlumata , tədrisin planlaşdırılması, məzmunu, haqqında dəqiq təsəvvürlərə malik olmalıdır;

- məktəbdə və məktəbdənkənar məşğələlərdə şagirdlərin yaş həddini, fərdi xüsusiyyətlərini və təfəkkür qabiliyyətini nəzərə almaqla onların ictimai faydalı və

məhsuldar əməyini məqsədəuyğun təşkil etməyi bacarmalıdır (10, 15).

Texnologiya fənninin tədrisi prosesində inteqrativ əlaqələr aşağıda göstərilən bir neçə fənlə qurulsa fənnin dərindən mənimsənilməsi daha da effektli olar. Bunlara kimya, fizika, biologiya , coğrafiya, rəsmxətt, riyaziyyat və elektrotexnika fənləri daxildir.

Kimya fənnindən oduncaqdan və metalda verilən cizgilər əsasında hər hansı bir detal və hissələr hazırlayarkən onların qoruyucu maddə kimi səthinə çəkilən maddələrin kimyəvi tərkibinin öyrənilməsi məqsədilə istifadə olunur. Belə ki, hazırlanan detalın səthinə qoruyucu maddə kimi laklardan, sintetik və təbii boyalardan, dolğun materiallardan, digər qoruyucu örtüklərdən (nikelləmə, xromlama, sinkləmə və s.) istifadə edilərkən müəllim tələbələrə bu qoruyucu maddələrin kimyəvi tərkibini, kimyəvi qurluşunu, başqa maddələrlə yarada biləcək kimyəvi reaksiyaların mümkünlüyünü, ağacı və yaxud metalın səthini qoruya bilmək xüsusiyyətlərini, aşınmaya və paslanmaya qarşı mühafizə etmə qabiliyyətini öyrətməli, müəyyən fərdi tapşırıqlar verməli və onların yerinə yetirilməsini izləməli və monitorinqini aparmalıdır. Tələbələr aldıqları fərdi tapşırıqlara uyğun suallara cavab hazırlayarkən müxtəlif mənbələrdən istifadə etməyi bacarmalı və aşağıdakıların yerinə yetirilmələrinə əməl etməlidirlər (7, 16).

- tələbələr mühazirə, təcrübə, labaratoriya, seminar dərslərinə hazırlıq məqsədilə müəllim tərəfindən verilən fərdi tapşırıqları tam dərk etməlidirlər;

- tələbələr onlara verilən sərbəst işin təhsil proqramında göstərilən fənnə uyğun seçilməsini və daxili mövzuların inteqrasiya mümükünlüyünü müəyyən etməlidir;

- təcrübə üzrə fərdi tapşırığı sərbəst yerinə yetirmək üçün yaradılan şəraitlə tanış olmalıdır;

- görülmüş fərdi tapşırığı yerinə yetirilməsi barədə təqdimat hazırlamalıdır.

Texnologiya ixtisasına daxil olan “Ərzaq məhsullarının hazırlanma texnologiyası” fənnində fəndaxili mövzuların biologiya fənni ilə inteqrasiyasının mümkünlüyü öyrənilərkən tələbələrə ərzaq məhsullarını emal edərkən bioloji proseslər, fermentlənmə və qıcqırma yaradan bakteriyalar, yeyinti məhsulu kimi istifadə olunan göbələklər, onların mənşəyi, zəhərli və yeməli göbələklərin müəyyən olunması, mal əti, toyuq və balıq məhsullarının tez xarab olmasının qarşısının alınma xüsusiyyətləri tələbələrə öyrədilməlidir. Fənlərarası və mövzulararsı inteqrasiyanın yaradılmasının öyrənilməsi məqsədilə müəllim hər bir tələbəyə fərdi tapşırıqlar verir. Bu tapşırığa əsasən bir qrup tələbə (3-4 nəfər) ərzaq məhsulunun tez xarab olmasının qarşısının alınması üzrə laboratoriya təhlili aparır, bir qrup tələbə yemək hazırlamaq məqsədilə resept tərtib edir, digər qrup tələbələr ərzaq məhsulunu (toyuğu, mal ətini, balığı) emal edir və sonuncu qrup tələbələr xörəyin hazırlanmasını həyata keçirir. Beləliklə qrup tələbələri ərzaq məhsulunu emal etmək, yeyinti məhsulu (xörək) hazırlamaq, ərzaq məhsulunun tərkibini öyrənmək kimi tapşırığı alarkən onlar eyni zamanda qrup şəklində məhsulun bioloji əsaslarını öyrənir, fermentləmə və qıcqırma prosesinin yaranmasını müəyyən edir və mövzulararası inteqrativ əlaqələrinin yaranma xüsusiyyətlərini müəyyənləşdirirlər. Alınan nəticələr barədə qrup tələbələri birlikdə təqdimat hazırlayıb ayrı-ayrılıqda məlumat verirlər. Tələbələr həmin tapşırıqları yerinə yetirərkən aşağıdakılara əməl etməlidirlər (11,12).

- fənlərarası və fəndaxili mövzuları seçilərkən, inteqrasiyaya cəlb olunacaq mövzuları müəyyənləşdirərkən onların uyğunluq xüsusiyyətləri nəzərə almağı bacarmalıdır;

- təcrübələr aparılarkən qrup tələbələri yarımqruplara bölünür və hər bir qrup əldə etdiyi nəticə və inteqrasiya imkanları barədə təqdimat aparır;
- tələbələrə verilən fərdi, yaxud qrup şəklində tapşırıqlar müəllimin yaxud akademik məsləhətçinin (tyutorun) rəhbərliyi altında həyata keçirilməlidir.

“Texnologiya müəllimliyi” ixtisasına daxil olan ixtisas fənlərinin demək olar ki, hamısı fizika və elektrotexnika fənləri ilə inteqrativ əlaqələr şəklində tədris olunur. Çünki, ağac və metal emalı texnologiyasının, parça və parça ilə işlərin texnologiyanın, ərzaq məhsullarının emalı texnologiyalarının yerinə yetirilməsində elektrik mənbəyi ilə qidalanan texnoloji və qaynar təbəqəli avadanlıqlardan istifadə olunur. Bu avadanlıqların hərəkətə gətirilməsi üçün istfadə olunan elektrik mühərriklərinin iş prinsipini, avadanlıqlara birləşdirilmə işləri, onlarla davranış qaydalarını, mühərriklərin işə salma və dayandırma yollarını elektrik açarlarının quruluşu, iş prinsipi haqqında bütün məlumatlar tələbələrə öyrədilməli, onların kinematik sxemlərinin oxunması, avadanlıqlarla təhlükəsizlik qaydalarına riayət olunması yolları aydınlaşdırılmalıdır. Avadanlıqlarla iş prosesini qurarkən hansı sahələrə xüsusi diqqət yetirmələri müəyyənləşdirilməli və xüsusi qoruyucu geyimlərdən istifadə olunmasının vacibliyi aydınlaşdırılmalıdır. Tələbələrin bu sahənin necə mənimsədiklərini müəyyən etmək üçün test tapşırıqları hazırlanmalı və bu tapşırıqlar vasitəsilə onların bu sahə üzrə bilik səviyyəsi müəyyənləşdirilməlidir. Daha sonra tələ-bələr test suallarına uyğun hazırladıqları cavablara əsasən təqdimat etmələri və müqayisəli məlumat vermələri daha məqsədəuyğun hesab olunmalıdır (4, 5, 9).

Texnologiya ixtisasına daxil olan ağac emalı fənnin tədrisi prosesində oduncaq haqqında göstəricilərin öyrənilməsi ön plana çəkilməlidir. Bu zaman emala cəlb olunacaq meşə materiallarını seçərkən istifadə olunan oduncaqlar haqqında məlumatların əldə olunmasına və istifadəsinə xüsusi fikir verilməlidir. Seçilən oduncağın cinsi, mexaniki xassələri, kimyəvi tərkibi, sıxlığı, emala yararlılıq qabiliyyəti və digər xüsusiyyətləri öyrənilməlidir. Bu məqsədlə texnologiya fənninin ağac emalı bölməsinin tədrisi prosesində coğrafiya fənni ilə inteqrasiyasına xüsusi əhəmiyyət verilməlidir. Müəllim tələbələrə coğrafiya fənni üzrə oduncağın hansı ağac növündən alınması, onda istifadə effektliyi, coğrafi şəraitə görə meşə materiallarını biri-birindən fərqləndirən cəhətlər, meşə materiallarının növləri haqında ətraflı məlumat verməlidir. Tələbələr verilən tapşırığa və sxemlərə uyğun detallar hazırlayarkən oduncağın texniki göstəricilərinə aid bütün xassələri bilməli və onların seçilməsinin necə aparılması haqqında məlumatları olmalıdır. Bütün bunları öyrəndikdən sonra tələblər detalların hazırlanmasında sərbəst seçim apara bilərlər.

Texnologiya fənninin tədrisi prosesində fənnin əlaqəli və dərindən öyrənilməsinə müsbət təsir edən amillərdən biri də bu fənnin rəsmxətt fənni ilə inteqrativ təliminin təşkil olunmasıdır. Tələbələr texnologiya fənni üzrə hər hansı bir detalı tapşırığa uyğun hazırlayarkən onun sxemini öyrənməli, sxemə əsasən ölçüləri müəyyənləşdirməli, detalın hazırlanmasında istifadə olunan avadanlıqların kinematik sxemlərini oxumağı bacarmalıdırlar. Bu məqsədlə tələbələrin rəsmxətt fənnini öyrənmələri və bu fənn haqqında müəyyən biliyə malik olmaları vacibdir. Rəsmxətt fənnini öyrənərkən tələbələr xətləri, yiv birləşmələrini, çert-

yojların oxunmasını, xətlər anlayışını, miqyasla ölçmə üsullarını və s. bilməlidirlər. Rəsmxətt fənni haqqında tələbələrdə tam təsəvvürün yaranması parça ilə içlərin texnologiyasını yerinə yetirərkən ülgülərin hazırlanmasını asanlıqla yerinə yetirir və istənilən detalları ölçülərini tərtib etmək və sxemini oxumaq vərdişinə yiyələnirlər. Texnologiya fənninin tədrisi prosesində yuxarıda sadalanan fənlərlə inteqrativ əlaqələrin qurulması bu fənnin əhatəli, dərindən öyrənilməsinə şərait yaradır və istiqamətləri müəyyənləşdirir (4, 8, 10).

Fənnin tədrisi prosesində aşağıdakıların tədrisə tətbiq olunmasını məqsədəuyğun hesab edirik;

- sinif dərslərindən başqa tələbələrə əlavə fərdi ev tapşırıqlarının verilməsini;
- tələbələrə verilən tədris tapşırıqları, sərbəst işlər və fərdi təqdimatların mövzuları təhsil proqramına uyğun tədris olunan fənlərin mövzularına uyğun olmasını;
- təcrübə məşğələləri üzrə fərdi tapşırıqlar və sərbəst işlər akademik məsləhətçilərin rəhbərliyi altında yerinə yetirilməsini;
- kurs, referat və yoxlama işlərinin (layihələrinin) təqdimatını komissiya qarşısında yerinə yetirilməsini;
- semestr və buraxılış imtahanları üçün test, yaxud yazılı imtahan suallarının bir aydan az olmamaq şərtilə elan olunmasını;
- tələbələr seminarlarda, dərnəklərdə kollec tərəfindən təşkil olunmuş digər tədbirlərdə iştirak etmələrini.

Məqalənin aktuallığı. Texnologiya fənninin tədrisi prosesində onun bir neçə fənlə (kimya, fizika, biologiya, coğrafiya, rəsmxətt) inteqrasiyasının tətbiq olunması və fəndaxili mövzuların əlaqəli təlimin yerinə yetirilməsi tələbələrin bu fənn haqqında təsəvvürlərini genişləndirir, nəzəri biliklərin təcrübəyə tətbiq olunmasında əsaslı imkan yaradır və fənnin əhatəli öyrənmələrinə düzgün istiqamət verir.

Məqalənin elmi yeniliyi. Texnologiya fənninin tədrisində fənlərarası inteqrativ əlaqələrin yaradılması, fəndaxili mövzuların əlaqəli şəkildə öyrənilməsinə istiqamət verən pedaqoji imkanların tətbiqi, mövzulararası inteqrativ əlaqələrin yaradılmasına təsir edən problemlərin aradan qaldırılması yollarının müəyyənləşdirilməsi təşkil edir.

Məqalənin praktik əhəmiyyəti və tətbiqi sahələri. Məqalədə texnologiya fənninin dərindən öyrənilməsində, fənnin əhatəli mənimsənilməsində, nəzəriyyənin təcrübəyə tətbiq olunmasında, pedaqoji innovativ priyomlardan istifadə edilməsində fənlərarası inteqrativ əlaqələrin böyük əhəmiyyət kəsb etməsinin vacibliyi göstərilir. Məqalədə tədqiqat nəticəsində əldə olunan elmi, praktik yeniliklərin və əlaqəli təlim prosesinin üstünlüklərinin orta ixtisas təhsili müəssisələrində texnologiya fənninin tədrisi prosesində tətbiq olunması tövsiyə olunur.

***Rəyçi: akad. H.Əhmədov***
***prof. İ.Cəbrayılov***

## İstifadə edilmiş ədəbiyyat

1. Abbasov A. Pedaqogika: Orta ixtisas məktəbləri üçün dərs vəsaiti. Bakı: Mütərcim, 2013.

2. Abbasov A. və başqaları. Müəllim hazırlığına yeni yanaşmalar. Bakı: Mütərcim, 2012.

3. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi”, 2013, №5.

4. Axundov N., Əhmədov H., Şərifova F., Səlimova X. Texnologiya, müəllim üçün metodik vəsait. Bakı: Aspoliqraf, 2014.

5. Əhmədov H. Azərbaycan təhsilinin inkişaf strategiyası, Bakı: Elm, 2010.

6. Kərimov Y. Pedaqoji tədqiqat metodları. Bakı: "RS Proqress" MMC 2009.

7. Kazımov M. Kolleclərdə inteqrativ təlim prosesinin mahiyyəti // ARTPİ-nin Elmi əsərləri, Bakı: Mütərcim, 2015, №1.

8. Kazımov M. Fənlərarası inteqrsiyanın təlimin keyfiyyətinin yüksəldilməsinə təsiri, Respublika Elmi Konfransının materialları. Bakı,16 dekabr 2015.

9. Abbasov Ə., Cavadov İ. Kurikulum islahatı: tədqiqatlar, nəticələr. Bakı: Mütərcim, 2011.

10. Kərimova F., Əhmədova M., Varella G., Reyli Ə. İnteqrativ kurikulum:mahiyyəti və nümunələr. Bakı: Adiloğlu, 2005.

11. Məmmədov Q., Xəlilov M. Ekalogiya, ətraf mühit və insan. Bakı: Elm, 2006.

12. Mehrabov A. Müasir təhsilin konseptual problemləri. Bakı: Mütərcim, 2010.

13. Süleymanova A. Təhsilin əsasları, Bakı: Təhsil, 2014.

14. Максимова В. Интеграция в системе образования. Учебное пособие СПб.: ЛОИРО, 2002.

15. Межпредметные связи в учебном процессе (Тематический сборник). М.: Просвещение, 2004.

6. Сажина С. Технология интегрированного занятия. М,: 2008.

17. Вербицкий А., Ларионов О. Личностный и компетентностный подход в образовании: проблемы интеграции. М.: Логос, 2011.

**М.Казимов**

**Интеграция в процессе преподавания технологии**

**Резюме**

В статье говорится об интеграции технологии с другими дисциплинами, об экономии резервов времени, о формировании у студентов логического мышления и комплексном подходе в изучении междисциплинарных тем. В статье также говорится о проблемах, возникающих в процессе интеграции технологии с естественными науками и, о путях их преодоления.

В то же время в статье подчеркивается важность ознакомления студентов со свойствами материалов, оборудования и приборов, определены методы использования теоретических знаний на практике.

**M.Kazimov**

**Integration in teaching of subject of technology**

**Summary**

The article deals with time management in integration of Technology with other subjects, development of logical thinking of students, and complex approach to learning of intra-curricular topics. Moreover, the current research deals with problems arising from integration of Technology with Science, and provides suggestions on solutions of those problems. The article also indicates the importance of better acquisition of handling of devices and instruments, materials and their properties, as well as methods of application of theoretical knowledge into practice.



# YENİLƏŞƏN CƏMİYYƏTDƏ MÜƏLLİM PEŞƏSİNƏ VERİLƏN TƏLƏBLƏR VƏ MÜASİR PEDAQOQUN PORTRET CİZGİLƏRİ

**Məlahət Nuriyeva,**
***pedaqogika üzrə fəlsəfə doktoru***

Məqalədə əsasən müasir müəllimə verilən tələblərdən bəhs edilir. Müəllif pedaqoji fəaliyyəti təlim-tərbiyə prosesinin qurulması ilə əlaqələndirir, sonra müasir müəllimin portret cizgilərinə dair fikir yürüdür.

***Açar sözlər:*** *peşəkarlıq komponenti, təşkilatçılıq modeli, etik davranış, pedaqoji ustalıq.*

***Ключевые слова:*** *компонент профессионализма, организационная модель, этическое поведение, педагогическое мастерство.*

***Key words:*** *component of professionalism, organizational models, ethical behavior, pedagogical skills.*

Müstəqil Azərbaycan təhsil sisteminin beynəlxalq sistemə inteqrasiyası üçün bu sahədə çoxlu dəyişikliklər, islahatlar getməkdədir. İnkişaf etmiş ölkələrin təcrübəsi göstərir ki, yeni əsrdə cəmiyyətin və insanların inkişafı üçün yaradıcı, müstəqil düşünən və inkişaf edən şəxsiyyət formalaşmalı, yetişdirilməlidir. Azərbaycan təhsilinin qarşısında duran ən əsas məsələlərdən biri yüksək mədəniyyətli, mütərəqqi dünyagörüşlü, insan hüquqları və azadlıqlarına hörmət etməklə müstəqil və yaradıcı düşünmə qabiliyyətinə malik, vətənpərvər şəxsiyyət yetişdirməkdir. Təhsil sisteminin qarşısında duran bu məsələnin həlli üçün ilk növbədə müəllim özü keyfiyyətcə dəyişməlidir. Pedaqoji fəaliyyət mürəkkəb xüsusiyyətlərə malikdir. Onlardan əsası müəllimin pedaqoji fəaliyyətidir. Müəllimlik kütləvi peşə olsa da yadda qalan ən yaxşı müəllimlər olur. Çünki nəsilləri öyrətmək, tərbiyə etmək çox vacibdir və bu hamıya lazımdır. Müəllimlik məsuliyyətli peşədir. Çünki müəllim insanın təlim və tərbiyəsi ilə məşğul olur, şüurunu formalaşdırır və bu işdə səhvə yol vermək olmaz. Müəllimlik peşəsinin yaradıcı olması onun mürəkkəbliyini sübut edən amildir.

Cəmiyyətin, millətin gələcəyi müəllimin əlindədir. Öz işinin öhdəsindən uğurla gəlmək üçün müəllim əsl mənada şəxsiyyət olmalı, özündə müsbət keyfiyyətlər formalaşdırmalıdır. Geniş və dərin biliyə malik olmaq, elmin son nailiyyətlərini öyrənmək və onları şagirdlərə çatdırmaq kimi akademik qabiliyyətə malik olmaq müəllimin portret cizgiləri kimi diqqətçəkəndir.

Müəllimin bilikləri öyrətmə bacarığı, pedaqoji-metodik ustalığa yiyələnməyi isə didaktik qabiliyyətində özünü göstərir.

Müəllim uşaqlarla, öz həmkarları və valideynlərlə düzgün ünsiyyət yaratmaqda, demokratik ünsiyyət üslubunda, hər bir uşağa fərdi yanaşma bacarığına malik olmalıdır. O, eyni zamanda özünün və uşaqların fəaliyyətini düzgün planlaşdırmaqda, çətinlikləri əvvəlcədən duyub, onları aradan qaldırmağa hazır olmalıdır. Müəllim özünü,

hisslərini düzgün idarə etməli, mülayimlik və ciddiliyi uzlaşdırmalı, səbirli olmalıdır. Pedaqoji fəaliyyətin məqsədi bu cəmiyyət üçün yararlı, hərtərəfli, ahəngdar inkişaf etmiş vətəndaşlar tərbiyə etməkdən ibarətdir. Müəllimin səmərəli fəaliyyəti üçün başlıca amillərdən biri onun ixtisasa uyğun və ümumi biliklər sisteminə yiyələnməsidir. Bura ixtisas biliyi ilə bərabər pedaqoji, psixoloji, fəlsəfi, metodiki biliklər daxildir.

İlk tarixi dövrlərdən müəllim gənc nəslə ictimai təcrübəni mənimsədən və onu həyata keçirməyi öyrədən bir şəxsiyyət kimi qiymətləndirilmişdir. Müasir dövrdə müəllimlik anlayışı yeni-yeni keyfiyyətlər hesabına daha da zənginləşmişdir. Bizim cəmiyyətimizdə müəllim yüksək nəzəri səviyyəyə, mədəniyyətə malik yetkin bir şəxsiyyətdir. Müəllim keçmiş nəsillərin ən yaxşı həyat təcrübəsini və özünün əldə etdiyi elmi nailiyyətləri yeni nəslə verir, bu nəsli gələcəyin qurucuları ruhunda tərbiyə edir. Müəllim gənc mütəxəssislərin şəxsiyyətini formalaşdırır, dünyagörüşünün təşəkkül etməsinə və inkişafına şərait yaradır, onlarda vətənin, xalqın, millətin səadəti uğrunda mübarizə aparmaq əzmi yaradır. Müəllim məktəbdə təlim və tərbiyə proseslərini həyata keçirir, zəhmətkeşlərin övladlarına bilik verir, onları yeni-yeni bacarıq və vərdişlərlə silahlandırır. Müəllim pedaqoji kollektivin üzvü kimi onun səmərəli fəaliyyətində fəal iştirak edir, müəllimlərin metodbirləşmələrində pedaqoji prosesi təkmilləşdirməyə istiqamət verir. Müəllim elmi pedaqoji, ictimai siyasi ideyaların təbliğində yaxından iştirak edir Müəllim ictimai tədbirlərdə yaxından iştirak edərək, cəmiyyətin demokratik əsaslarla idarə olunmasına imkanı daxilində xidmət göstərir. Beləliklə, müəllim bizim cəmiyyətimizin ən qabaqcıl, ən bacarıqlı, ən hörmətli və nüfuzlu nümyəndəsidir və cəmiyyətimizdə elə bir tədbir təsəvvür etmək olmaz ki, orada müəllimin öz dəsti-xətti, öz səliqəsi hiss olunmasın. Müəllim ideyaca mətin, siyasi cəhətdən yetkin olmalıdır. O, xalqının, millətinin səadəti yolunda dönmədən mübarizə aparmaq əzminə yiyələnməli, öz millətinin ideologiyasının mübariz daşıyıcısı və davamçısı olmalıdır. Müəllim yüksək ictimai məsuliyyət hissinə malik olmalıdır. Yetişdirdiyi gələcək nəsildə elə keyfiyyətlər aşılamalıdır ki, onlar xalqın, millətin adət və ənənələrini, arzu və istəklərini mərdliklə yerinə yetirə bilsinlər. Müəllim əxlaqi cəhətdən təmiz olmalıdır, bir ziyalı kimi yetkin və kamil adam səviyyəsində fəaliyyət göstərməlidir. Cəmiyyətin tələbləri, müxtəlif yerli, məhəlli tələblər-ictimai gözləmələr, müəllimin fərdi keyfiyyətləri və bu tələblərin icrasına onun hazırlıq səviyyəsi bir tam halında pedaqoji prosesin səmərəli cərəyan etməsinə imkan yaradır. Müəllim dərs və dərsdənkənar tədbirlərin məzmun və formalarının psixoloji əsaslarının müəyyənləşdirilməsində iştirak edir. O, bu zaman seçdiyi təlim və tərbiyə formalarının şagird şəxsiyyətinin inkişafında nə dərəcədə faydalı olduğunu müəyyənləşdirməli və bu sahədə apardığı işi təkmilləşdirməlidir. Kollektiv üzvlərinin qarşılıqlı münasibətlərinin psixoloji xüsusiyyətləri aydınlaşdırılmalı və kollektivin səmərəli fəaliyyəti üçün zəruri olan təshihlər aparılmalıdır. Müəllim çalışmalıdır ki, şagirdlərdə həm mövcud olan ictimai xüsusiyyətləri möhkəmləndirsin və həm də onlarda ictimai cəhətdən faydalı olan yeni psixoloji keyfiyyətlər formalaşdırsın. Kollektivin fəaliyyəti onun üzvlərinin qarşısında duran aktual vəzifələrin müvəffəqiyyətlə icra edilməsinə imkan verən özünüdərk, özünümüəyyənləşdirmə, özünütəsdiq və özüntərbiyəyə əsaslanmalıdır. Kollektivin fəaliyyətinin təşkili formalarının şagirdləri ictimai cəhətdən necə cəlb etdiyi müəyyənləşdirilməli və bu formaların tətbiqi təkmilləşdirilməlidir. Kollektivdə aparılan

pedaqoji iş şagirdlərin dünyagörüşünü genişləndirməli, hadisələri düzgün dərk etmə qabiliyyətini inkişaf etdirməli və hər bir şagirdin öz baxışlar sistemini formalaşdırmalıdır. Şagirdlərin qarşısına ictimai problemlər qoyulmalı və həmin problemlərin həllində onların aktiv iştirakı təmin edilməlidir. Müəllimlərlə şagirdlərlə şagirdlər arasında meydana çıxan ictimai problemlərin müzakirəsi, bu sahədə aparılan mübahisələr, məruzələr tərbiyə işində faydalı rol oynayır. Bu kimi tədbirləri həyata keçirmək üçün şagirdlərə zəngin ictimai-siyasi, elmi-texniki və fəlsəfi-etik informasiyalar verilməlidir. Təlim-tərbiyə proseslərinin təşkilində müəllimlərlə şagirdlər arasında ünsiyyətin rolu böyükdür. Müəllim şagirdlərlə ünsiyyətdə olduqda, o, nəinki ictimai funksiyanın daşıyıcısı, eyni zamanda pedaqoji prosesin tərkib hissəsini təşkil edən bir şəxsiyyət kimi çıxış edir. Beləliklə müəllim şagird şəxsiyyətinin ayrı-ayrı çalarları haqqında zəngin məlumata malik olur, onun müsbət və zəif cəhətlərini müəyyənləşdirir və zəif cəhətləri islah etmək üçün zəruri tədbirlər görür. Müəllim bu fikirləri təhlil edir, ümumiləşdirir və onların qeyri-obyektiv, düzgün olmayanlarını yeniləri ilə əvəz edir: müəllim şagirdin informasiya mübadiləsi prosesini idarə edir, düzgün istiqamətləndirir. Müasir məktəbdə müəllim şagird münasibətlərinin nəinki psixopedaqoji, həm də yuridik şagird hüquqları kanonlarına əsaslanaraq köklü paradiqmaları var. Müəllim-şagird münasi-bətləri mənəvi dəyərləri ilə mədəniyyət problemi kimi ayırd edilir və mənalandırılır. Amerika psixologiyasında üç tərkibli müəllim modeli məşhurdur. Təşkilatçılıq modeli, terapevtik model, liberal model. Təşkilatçılıq modelində dərs incəsənət kimi dəyərləndirilir. Müəlliflərin qənaətinə görə, dərsin səmərəli olması müəllimin sənətkarlıq səviyyəsi ilə şərtləşir. Terapevtik modelin şərhində humanistlik psixologiyasının uğurlarından faydalanmışlar. XXI əsrin təhsil konsepsiyalarında şagirdlərin sağlamlığı probleminə xüsusi diqqət yetirilir. Psixoloji xidmətin əsas missiyasını bəzi müəlliflər, məsələn, İ.V.Dubrovina elə bu aspektdə bilavasitə humanistlik baxımdan qiymətləndirirlər. Liberal modeldə müəllimin şagirdlərə oxumağı öyrətməsi önəmli psixopedaqoji problem kimi vurğulanır, bu məsələlər inkişaf kontekstində araşdırılır, şagirdlərdə “strateji təfəkkürün” inkişafı məsələlərinə xüsusi diqqət yetirilir. Bu məsələlərin şərhində müəlliflər, bizim fikrimizcə, müasir psixologiyada öz önəmli araşdırmaları ilə seçilən, təfəkkürün inkişafını təlimin ana xətti kimi dəyərləndirilən koqnitiv psixologiyanın uğurlarına arxalanırlar. Müasir psixoloji təsəvvürlərə görə, “Müəllim-şagird münasibətləri” ikitərəfli mürəkkəb proses olsa da, onun müəyyənləşməsində müəllimin rolu önəmlidir. Müasir pedaqoji təfəkkür konsepsiyasında müəllimin bir pedaqoq kimi istedadı təkcə didaktik qabiliyyətlərinə və təşkilatçılıq qabiliyyətləri ilə açıqlanmır. Kommunikativ və ekspressiv qabiliyyətlərinə artıq yeni önəm verilir. Müasir təhsil konsepsiyası didaktik və təşkilatçılıq qabiliyyətlərinin əhəmiyyətini qətiyyən azaltmadan bu gün, təhsilin humanistləşdirilməsi şəraitində kommunikativ və perspektiv, ekspressiv və konstruktiv qabiliyyətlərinin əhəmiyyətini xüsusi vurğu ilə dəyərləndirir. Müəllim bir şəxsiyyət kimi şagirdlərin ona münasibətlərində yaşayır.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 16 may 2014-cü il tarixli əmri ilə təsdiq edilmiş "Müəllimlərin etik davranış qaydaları"nda deyilir: "Müəllimlərin etik davranış qaydaları təhsilin bütün səviyyələrində peşə fəaliyyəti zamanı təhsilverənlərin ümumi davranışını və təhsil prosesi iştirakçıları ilə qarşılıqlı münasibətlərini tənzimləyən normalar məcmusundan ibarət-

dir". Zaman dəyişdikcə müəllim əməyinin peşə mədəniyyəti, etik xüsusiyyətləri, mənəvi keyfiyyətləri də yeni məzmun dəyərləri ilə intişar tapır, sosial-mədəni həyatın başlıca etalonu olan əxlaq, davranış münasibətlərini də yeni mündəricədə tənzimləyir. Müəllim, hər şeydən əvvəl, mənəvi cəhətdən yetkin insan olmalıdır. Belə ki, pedaqoji prosesdə mənəvi münasibətlərin məzmunu cəmiyyətdə hökm sürən əxlaq qaydalarından, həm də onların müəllim şəxsiyyətində öz əksini tapan etik-mədəni davranış normalarından çox asılıdır.

Müəllimin bilik səviyyəsi, erudisiyası nə qədər zəngin və mükəmməl texnologiya ilə əhatələnsə də onun fəaliyyət manerasında müsbət keyfiyyətlər sistemi olan müəllimin sənət, peşə etikası, konkret pedaqoji proses təcrübəsində və ondan kənar yerlərdə təzahür edən etik davranış ustalığı ilə bağlı cəhətlər də önəmlidir. Bu yönümdən müəllim statusunu təkmil üsul və vasitələrlə möhkəmləndirməyin imkan və yollarına bələd olmağın ilkin ideya istiqamətləri milli və ümumbəşəri dəyərlərdən qidalanan pedaqoji etika ilə bağlıdır. "Müəllimlərin etik davranış qaydaları" bütün zaman kəsiyində pedaqoji proses təcrübəsi üçün stimulverici vəsilə olmuş, müəllimin vicdan, ədalət barometrinə çevrilmişdir.

Bu gün müəllim həyatda, cəmiyyətdə, ictimai və dövlət statuslu məsələlərdə avanqard mövqe nümayiş etdirən simadır, pedaqoji prosesdə isə müəllim - sistemləşdirilmiş bilikləri, bacarıq və vərdişləri, habelə mənəvi keyfiyyətləri adamlara məqsədyönlü, planlı və mütəşəkkil aşılamaq yolu ilə cəmiyyətin sonrakı inkişafına güclü təkan verən pedaqoji təhsilli mütəxəssisdir.

Özünə, şagird və tələbələrinə hörmət edən, pedaqoji etika çərçivəsində onlarla davranan, əxlaqi-mənəvi normalara daim sadiq qalan ustad müəllim bu gün ətrafda baş verən sosial-iqtisadi, mənəvi-siyasi hadisələrə də biganə qala bilməz.

Odur ki, müəllim peşə fəaliyyətində daha mükəmməl və əzəli olan etik davranış prinsiplərini daim uca tutmaqla, bu yolda müasir və orijinal təsirə malik tələblər sisteminə ciddi məhəl qoymalı, etik dəyərlər paradiqmasının aliliyini, vicdanlılığını, peşəkarlıq və fərdi məsuliyyətini, loyallıq səviyyəsini, mədəni davranış etiketlərini, qərəzsizlik missiyasını, gender bərabərliyini, ictimai etimad münasibətliliyini, konfidensiallıq şüurluluğunu göstərməlidir.

Müəllim həssas və qayğıkeş olmalıdır. Müsbət iradi-mənəvi keyfiyyətlərə, pedaqoji etikaya düzgün əməl olunması insan hisslərinə ədalətli və obyektiv təsir edilməsi nəticəsində formalaşdırılmalıdır. Nəzakətlilik etik davranış mədəniyyətinin ən zəruri keyfiyyətidir. Nəzakət qaydaları ilə davranış etiketlərini tənzimləməyi bacarmaq hər bir müəllimin çalışdığı kollektiv, ictimai münasibətlər məkanında da öz şərəf və ləyaqətlilik səviyyəsini yüksəldir, peşə etikasını həyatının vacib məqsədlərinə çevirir.

Müəllim prinsipial və obyektiv olmalıdır. Yəni, onun etik səciyyə daşıyan münasibətlər səviyyəsi ağıllı tələb əsasında qurulmalıdır. Öz həmkarları arasında mehriban və səmimi münasibətlərin yaranmasında peşəkarlıq nümunəsi göstərən müəllim söz və əməl birliyində də cəsarətlilik mücəssəməsi göstərməli, bütün fəaliyyət və hərəkətlərinə ictimai davranış normaları baxımından hüquqi qiymət verməyi də bacarmalıdır.

Müəllimlərin etik davranış qaydalarının məna tutumu mürəkkəb olub özündə hər şeydən əvvəl, uşaqlar, müəllim-cəmiyyət münasibətləri, sonra isə onlara təsir edən bütün qalan münasibətləri ehtiva edir. Bunlar çoxcəhətli olub təhsilalanlarda baxış sistemini, siyasi mövqe mədəniyyətini, peşə-sənət professioqramını, zəka və mədəni-intellektual səviyyəliliyini əhatə edən

münasibətlərdir. Hamısı da sosial mühit və pedaqoji proses təcrübəsində təzahür edən təlimləndirici, təhsilləndirici və inkişafetdirici missiyanı ehtiva edən etik qaydalara aid olub, təkcə şagirdə (tələbəyə) yox, əksər hallarda müəllimə də təsir edir. Savad almaq, elmi inkişaf yolu tutmaq müəllim üçün nə qədər vacib stimulverici qüvvədirsə, onun mənəvi dünyası, etik davranışı, əxlaqi fəzilətləri, peşə, sənət etikası da bir o qədər önəmli amildir.

Böyük fizik Albert Eynşteynin təbirincə desək "Bəşəriyyətin gələcəyi elmi tərəqqinin sabahından bir o qədər asılı deyil, insani əxlaqın və mənəviyyatın sabahkı mənzərəsindən asılıdır".

Müəllimin peşə fəaliyyətində qanunvericiliklə müəyyən olunmuş vəzifələrin dərk edilməsi və bu sahədə hüquqlarının təmin olunması ilə əlaqədar qanunauyğun hallara ciddi əməl etməsi də mühüm etik davranış qaydasıdır. Xüsusən, müəllim şəxsiyyəti problematikasının vacib məziyyətlərini bilmək bu gün çox maraqlı və aktual bir məsələdir. Müəllimlərin etik davranış qaydalarını ehtiva edən, onun şəxsiyyəti ilə bağlı maddələr içərisində peşə, ixtisas, vəzifə məsuliyyəti də qabarıq şəkildə öz əksini tapmışdır. Pedaqoji prosesdə müəllim-şagird münasibətlərinin inkişaf etdirilməsi işinin ağırlığı, məsuliyyəti müəllimin üzərinə düşür. "Qaydalar"la tənzimlənən bu didaktik tələblərdə münasibətlər kredosu konkretləşir. Onun müasir prinsipləri təhsilalanlarla, kollektivlə, rəhbərliklə valideyn və qanuni nümayəndəliklərlə, müəllim və cəmiyyətlə təmasda, vətəndaş cəmiyyəti və vətəndaşlıq tərbiyəsinə münasibətlər yönümündən daha çox təqdir olunur.

Müəllimə məhəbbət və həqiqi hörmət ruhu hər bir cəmiyyətə, ailəyə, ictimai qurumlara, sosial-mədəni təsisatlara hakim kəsilməlidir. Həm valideynlər, həm böyüyən nəsil nümayəndələri öz mənəvi və ictimai tərəqqi məfkurələrinin zənginləşməsində, bu sahədə onlara ağıl, davranış tərbiyəsi yolu ilə qapılar açan hər bir müəllimə bütün ömürləri boyu minnətdarlıq edirlər.

Müəllimin vəzifələri məktəbin qarşısında duran ümumi vəzifələrdən doğur. Müasir məktəbin isə ən mühüm, daimi vəzifəsi böyüməkdə olan nəslə elmlərin əsasları haqqında dərin və möhkəm biliklər vermək, həmin bilikləri təcrübədə tətbiq etmək vərdişləri və bacarıqları aşılamaqdan ibarətdir. Burada həlledici rolu müəllim oynayır. Müəllimin pedaqoji fəaliyyəti müvəffəqiyyətlə yerinə yetirməsi onun öz qarşısında duran funksiyaları necə həyata keçirməsindən asılı olur. Müəllimin pedaqoji fəaliyyətinin təhlili göstərir ki, bu fəaliyyət bir-biri ilə sıx bağlı olan bir sıra funksiyalardan ibarətdir. Həmin funksiyaların həyata keçirilməsi şagirdlərin təlim və tərbiyəsini, onlarda şəxsiyyətin formalaşmasını təmin edir. Psixoloji ədəbiyyatda məktəbdə hər bir fənn müəllimini fəaliyyəti üçün xarakterik olan aşağıdakı pedaqoji funksiyalar qeyd olunur: inkişafetdirici, tərbiyəedici, kommunikativ-öyrədici, qnostik, konstruktiv, təşkilatçılıq. İnkişafetdirici funksiya müəllimdən öz şagirdlərini inkişaf etdirmək vəzifəsini həyata keçirməyi tələb edir. Təlim və şagirdlərin inkişafı vahid, bir-birilə bağlı proseslərdir. Ona görə də inkişafetdirici pedaqoji funksiya o zaman müvəffəqiyyətlə həyata keçə bilər ki, müəllim şagirdlərin şəxsiyyətlərinin əqli, sensor və emosional sahəsinin, idrak imkanlarının formalaşması və inkişafı yolların müəyyənləşdirə bilsin, onlarda müstəqil işləmək bacarığı aşılaya bilsin. Bunun üçün isə müəllim bir sıra zəruri bilik, bacarıq və vərdişlərə malik olmalıdır. Bunlardan: müxtəlif yaş dövründə şagirdlərdə idrak qabiliyyətləri inkişafının psixoloji-pedaqoji əsasları haqqında bilikləri, öyrənilən faktları təhlil etmək və

ümumiləşdirmək, müqayisə etmək, onların mühüm və ikinci dərəcəli əlamətlərini ayıra bilmək bacarığını, şagirdi problem situasiya ilə qarşılaşdıra və onu fikirləşdirə bilmək bacarığını və s. göstərmək olar.

Tərbiyəedici funksiya da inkişafetdirici funksiyadan az əhəmiyyətə malik deyildir. Tərbiyəedici pedaqoji funksiya təlim prosesində və sinifdənkənar tədbirlər zamanı şagirdlərdə düzgün elmi dünyagörüşünün formalaşması, ideya-siyasi, əxlaqi, estetik və vətənpərvərlik tərbiyəsi vəzifələrinin yerinə yetirilməsi ilə bağlıdır. Şübhəsiz, bu funksiyanın həyata keçirilməsi də müəllimdən zəruri pedaqoji bacarıq və vərdişlərə yiyələnməyi tələb edir. Bunlardan, dərsdə və sinifdənkənar tədbirlər zamanı tədris edilən fənnin imkanlarından tərbiyəvi məqsədlər üçün istifadə edə bilmək bacarığını, kollektivizm, prinsipiallıq, fəal əxlaqi mövqe tərbiyə edə bilmək bacarığını, şagirdlərin şüurlu olaraq peşə seçmələri və ilkin peşə hazırlığı üçün şərait yarada bilmək bacarığını və s. göstərmək olar.

Kommunikativ öyrədici funksiya bir tərəfdən müəllimin kommunikativ fəaliyyətinin təşkili, digər tərəfdən onun şagirdlərə zəruri məlumatlar verməsi ilə bağlıdır. Müəllimin kommunikativ fəaliyyəti düzgün qurulduqda tədris etdiyi elmin əsaslarını öyrədə bilir, şagirdlərin maraq və ehtiyaclarını ödəyir, real şəraitdən asılı olaraq təlim və tərbiyə metodlarından səmərəli şəkildə istifadə etməyi bacarır. Kommunikativ funksiyanı həyata keçirmək üçün müəllim siniflə və ayrı-ayrı şagirdlərlə, ayrı-ayrı müəllimlərlə və bütün müəllim kollektivi ilə, məktəb rəhbərləri ilə, şagirdlərin valideynləri ilə tez və asanlıqla işgüzar əlaqə yaratmağı bacarmalıdır.

Müəllimin pedaqoji fəaliyyətindəki qnostik funksiyaya gəldikdə, o, hər şeydən əvvəl məktəbdə bu və ya digər fənnin öyrədilməsinin son məqsədini dərindən dərk etməyə əsaslanır. Bununla yanaşı, həmin funksiya müəllimdən həmin tədris fənninin spesifik cəhətlərini, məzmununu, tədris metodlarını bilməyi, öyrənilən materialın mühüm əlamət və keyfiyyətlərini ayırmaq bacarığını, eləcə də proqramda və dərslikdə verilmi tədris materialını şagirdlərin mənimsəmə, dərk etmə imkanları və mənimsəmədəki çətinliklərin səbəbləri barədə biliyə malik olmağı tələb edir.

Konstruktiv funksiyanı bir növ konstruktiv – planlaşdırma funksiyası da adlandırmaq mümkündür. Bu funksiya məktəbdə tədris prosesini mərhələlər üzrə planlaşdırmağı və təşkil etməyi nəzərdə tutur. Başqa sözlə, konstruktiv funksiya bir növ müəllimin təlim-tərbiyə prosesini məqsədyönlü şəkildə layihələşdirməsindən ibarətdir. Kommunikativ və konstruktiv funksiyaları, müəllim özünün təşkilatçılıq funksiyasını yerinə yetirmədən lazımi səviyyədə həyata keçirə bilməz. Ümummilli liderimiz Heydər Əliyev həmişə müəllim əməyini yüksək qiymətləndirmiş, müəllim haqqında xoş sözlər söyləmişdir. Ulu öndər ölkəmizə rəhbərlik etdiyi bütün dövrlərdə həmişə müəllimə hörmət və ehtiramla yanaşmış, onların maddi vəziyyətinin, rifah halının yaxşılaşdırılması qayğısına qalmışdır. Onun 1970-1987-ci illərdə Azərbaycandan kənarda ali təhsil almış mütəxəssislərin ümumrespublika toplantısındakı nitqində dediyi "Müəllim adı dünyada ən yüksək addır. Məsələn, şəxsən, mən Yer üzündə müəl-limdən yüksək ad tanımıram. Çünki hər birimizə təhsil, bilik verən, bu səviyyəyə qaldıran məktəbdir və məktəbdə təhsil verən də müəllimdir".

Müəllim nüfuzuna verilən mütləq tələb onun əxlaqi saflığıdır. Təlim və tərbiyə

prosesində müəllim nüfuzu olmadan keçinmək mümkün deyil. Ancaq bu nüfuz dağıdıcı yox, yaradıcı olmalı, uşaq şəxsiyyətinin bərqərar olmasına, ona potensialını reallaşdırmağa kömək etməlidir. Bu bir həqiqətdir ki, nüfuz qazanmış adamın dedikləri daha tez və yaxşı mənimsənilir. Pedaqoji nüfuz şəxsi və peşəkarlıq komponentlərindən ibarətdir. Müəllimin zahiri görünüşü, davranış mədəniyyəti də nüfuz qazanılmasında böyük rol oynayır. Uşaqlar təvazökarlığı, sadəliyi, təbiiliyi, geyimin səliqəliliyini qiymətləndirirlər. Onların diqqətindən heç nə yayınmır. Uşaqların hörmətini ancaq düzgün, zəhmətkeş, öz işinə sadiq müəllim qazana bilər. Pedaqoji təcrübə göstərir ki, uşaqlar müəllimin həyatına laqeyd qalmırlar. Bütün müsbət keyfiyyətlərinə baxmayaraq, müəllim məişətdə bağışlanılmaz hərəkət edirsə, bu, şagirdlərə məlum olur.

Peşəkarlıq komponentinə professional bilik, pedaqoji fakt, müəllim-şagird qarşılıqlı münasibətinin üsulu və s. daxildir. Birincisi, nüfuzlu müəllim öz fənnini bilir, onu öyrətməyi bacarır. Müəllim alim müşahidəçiliyinə, uşaq həyəcanını anlamaqda psixoloq biliyinə malik olmalıdır. Buna yalnız öz üzərində sistemli işləmək, başqa müəllimlərin ən yaxşı təcrübəsini öyrənmək yolu ilə nail ola bilər. Müəllim daim öz biliyini təkmilləşdirməlidir. Onun biliyi məhdud fənn dairəsində qapanıb qalmamalıdır. Uşaqlarla qarşılıqlı münasibətdə pedaqoji takt nümayiş etdirməyən müəllimin nüfuzu olmaz. Pedaqoji takt tərbiyəvi təsir vasitəsidir, ona avtoritarlıq, diktat, psixoloji təzyiq yaddır.

Müəllim nüfuzunun mahiyyətini təşkil edən şəxsi və peşəkarlıq komponentlərini bir-birindən ayrı deyil, onlar qarşılıqlı surətdə əlaqədardır. Məktəb rəhbərinin davranışı, iş yoldaşlarına və başqa adamlara münasibətində obyektivliyi və prinsipiallığı ilə fərqlənməli, bütün cəhətlərdən şəxsiyyətinin insanlara müsbət mənada tərbiyələndirici təsir göstərməlidir.İşin səviyyəsi kollektivin uğurlarından asılıdır, elə bu uğurların qazanılmasında da məktəb rəhbərliyinin tələbkarlığı və təşkilatçılığının tutumu əsas vacib şərt hesab edilməlidir. Kollektivə düşüncəli, faydalı, pedaqoji rəhbərlik daim lazımdır, əlbəttə, pedaqoji rəhbərlik inzibatçılıq, əmrvermə səciyyəsi daşımamalıdır. Məktəb rəhbərliyi ilə kollektiv münasibətlərində səmimi və mehribandırsa, orda təlimin və tərbiyənin keyfiyyəti də yüksək olmalıdır. Özünün prinsipiallığı, şəxsi həyat və xarakter cəhətləri, mədəni, əxlaqi davranışı ilə müəllimlərinə nümunə olmağa çalışmalıdır. Məktəb sərbəstlik, müstəqillik istəyir, müəllim öz dərslərində yaradıcılığa əl atır. İndi yeni pedaqoji təfəkkürün yaradılması ilə bağlı işlər gedir, məktəb yeni üsullarla işləyir, yeni pedaqoji təfəkkür formalaşır. Rəhbərlik etmək çox mürəkkəb prosesdir. Onu istənilən səviyyədə yerinə yetirmək üçün daim təkmilləşməli, özünü dəyişdirməli, mühitə və insanlara yaxından bələd olmalı, işçilərin psixoloji xüsusiyyətlərini, pedaqogika elminin son nailiyyətlərini, idarəetmənin elmi əsaslarını öyrənməlidir. Məktəbin ən başlıca işi kollektivdə yaradılan nizam-intizam, özüllü qanun-qaydalar, ənənələrdi, hər bir kollektiv üzvü, hər bir müəllim öz üzərinə düşən vəzifə borcunu vicdanla yerinə yetirməyə çalışır. A.S.Makarenko belə qənaətə gəlirdi ki, müəllimin məharəti və ixtisasının artırılması pedaqoji ustalığın əsasında dayanır. O, qeyd edirdi ki, “Mən özümü heç də istedadlı müəllim hesab etməmişəm və etmirəm. Lakin mən öz üzərimdə çox işləyir, özümü işgüzar hesab edirəm və pedaqoji ustalığa malik olmaq istəyirəm... Mən öz təcrübəmdən belə fikrə gəlmişəm ki, pedaqoji ustalıq məsələsini müəllimin məharəti və ixtisasının artırılması həll edir”. Müəllim

fəaliyyətinə verilən tələblərin keyfiyyətcə yüksəlməsi, tələbkarlığın artması isə pedaqoji kadr hazırlığının təkmilləşməsindən asılıdır. Milli-mənəvi və bəşəri dəyərlərə, yüksək əxlaqi keyfiyyətlərə, yaradıcı təfəkkürə, peşəkar qabiliyyətlərə malik müəllim şəxsiyyətinin formalaşması cəmiyyətdə böyük maddi resurslar və enerji tələb edir. Müəllimin şifahi şərhi zamanı şagirdlər zahirən qeyri-fəal görünür, onlar yalnız dinləyirlər. Buna görə də bəzi pedaqoqlar belə hesab edirlər ki, şagirdin fəaliyyəti reproduktiv səciyyə daşıyır. Əslində isə belə deyildir, müəllim şərh zamanı yalnız elmi məlumatları şagirdlərə çatdırmaqla kifayətlənməməli, o, həm də şagirdin dərketmə fəaliyyətini idarə etməli, düşüncə qabiliyyətini inkişaf, onlarda dinləmə mədəniyyətini tərbiyə etdirməlidir. Hər bir müəllim dərs dediyi şagirdin şəxsiyyət kimi formalaşmasına nail olmaq, pedaqoji kollektivdə hər bir müəllim təlimin təhsil funksiyası ilə bərabər tərbiyəedici və inkişafetdirici funksiyalarını unutmur, dərsdə və sinifdənxaric tədbirlərdə bu müddəaların əsas götürülməsinə qayğı ilə yanaşır. Məktəb rəhbərlərinin müəllimlərin biliyinə, savadına, pedaqoji ustalığına, mənəvi-intellektual səviyyəsinə etinasız, biganə yanaşmalarını qəbulolunmaz hal hesab edir. Müəllim savadsızdırsa, metodikasını nə qədər zənginləşdirsə də, heç nəyə nail ola bilməz, ali məktəblərimizin kadr hazırlığı qənaətbəxş vəziyyətdə olsa, müəllim olan şəxsdə peşəyə zövq, həvəs, maraq hissləri güclü olar. Müəllim öyrənərək tərbiyə etməli, tərbiyə edə-edə öyrənməlidir, çünki o şagirdini nə qədər yaxşı tanısa, onun tərbiyəsi ardıcıl və konkret olar. Övladı valideyn böyüdür, müəllim isə onu düzgün həyat yoluna istiqamətləndirir. Məktəbdə nizam-intizamı şagirddən əvvəl müəllimdən gözləmək lazımdır, müəllim intizamlı, məsuliyyətli olanda həmin məktəbdə şagirdlərin nizam-intizamına ayrılan vaxt bir qədər az olar. Bəzən müəllim öz həmkarlarından bir şeyi soruşmağa ürək eləmir, onu şəxsiyyətinə sığışdırmır, onu dərs hissə müdirindən, direktordan soruşmağı daha müvafiq sayır – bu məqamı da qüsurlu hall hesab edirəm. Müasir dərs müəllimin dərsə ciddi hazırlaşmasını tələb edir, müəllim hansı üsullardan necə və nə zaman istifadə edəcəyini qabaqcadan müəyyənləşdirməli, o dərin biliyi, yüksək mədəniyyəti, gözəl nitqi, estetik zövqü və nüfuzu ilə şagirdlərə şəxsi nümunə olmalıdır. Şagirdlər müəllimlərin səhvləri kimi heç bir şeyi möhkəm yadda saxlamırlar. Məktəbin yeniləşməsində əsas yeri müəllim tutur. O, müəllim ki, humanist pedaqogika mövqeyində dayanırsa, onun fəaliyyətinin üslubu şagirdlərin fəaliyyətini dəyişdirməyə qabildir. Məktəbdə ideya - mənəvi hazırlıq işlərinin əsasını, ilk növbədə müəllimlərin yüksək pedaqoji ustalığı və şəxsi təhsili təşkil edir. Görkəmli pedaqoq Komenskinin müəllim sənəti haqda dediyi fikirlərdən biri bu baxımdan əvəzsizdir: “Pis müəllim həqiqəti söyləyir, onu başa düşməyə qoymur, yaxşı müəllim həqiqəti tapmağı öyrədir, onu axtarıb tapmaq prosesini asanlaşdırır”.Təhlil dərsdinləmənin ən mühüm komponenti və həlledici mərhələsidir, dərsdinləmənin keyfiyyət və əhəmiyyəti bir çox cəhətdən onun nə dərəcədə məqsədəuyğun aparılmasından asılı olur, əgər dərsin təhlili pedaqoji və metodik cəhətdən məqsədəuyğun aparılmasa, dərsdinləmənin istənilən əhəmiyyəti olmaz. Məktəb rəhbərliyi üçün dərs deməyi idarəetmə məsələlərində çox vacib cəhət bilirik, ən əvvəl hər iki tərəfin bir-birini tanıması, ələlxüsus, tərbiyə məsələlərini özüllü, möhkəm, səmimi, inam və mehribançılıq üzərində qurmaq üçün ona dərs deməsi çox kömək edir.Tədris yalnız bilik, bacarıq və vərdişlərin verilməsi prosesi olmayıb, həm

də şagirdlərə öyrənmənin yollarını öyrətmək, onları tərbiyələndirmək, inkişaf etdirmək, şəxsiyyəti formalaşdırmaq prosesidir. Məktəbdə görülən bütün işlər yalnız dərs prosesinə öz müsbət təsirini göstərmək anlamındadır, yəni hansı üsul və vasitələrdən istifadə olunursa-olunsun, təlimin reytinq göstəricisi təmin olunmalı, o göstərilməlidir. Müəllim öyrədəndir, tərbiyəçidir, cəmiyyətin aparıcı simalarından biridir, müasir şəraitdə müəllimin nüfuzunun qaldırılması yalnız müəyyən qərarların verilməsi ilə təmin edilə bilməz, burada hər şeydən əvvəl, müəllimin özünün peşə səriştəliliyinin inkişafının qayğısına qalması vacibdir. Orta məktəblərdə təlim şagirdlər üçün o zaman maraqlı ola bilər ki, həmin proses onların əqli, fiziki və potensial imkanları, maraqları əsas tutulmaqla qurulsun. Təlim fəaliyyəti onun inkişafı uşağın səviyyəsini köklü şəkildə dəyişir. O, əvvəllər öyrənirdi, böyükləri izləyirdi, təcrübə aparırdı. Məktəb həyatı uşaqların cəmiyyətdə yerini əsaslı surətdə dəyişir. İndi uşaq digər rolları həyata keçirir, bu rollar təkcə onun özü üçün deyil, həm də cəmiyyət üçün önəmlidir. İdarəetmədə pedaqoji kollektivin imkanları müəllimlərlə şagirdlərin səmərəli fəaliyyətindən asılıdır, pedaqoji kollektivin başlıca məqsədi şəxsiyyətin mədəni inkişafının əsasını formalaşdırmaqdır. Məktəbdə istedadı və qabiliyyəti ilə fərqlənən şagirdlərin aşkara çıxarılması, onların potensial imkanlarının daha da genişləndirilməsi üçün həlli vacib tədbirlər həyata keçirilir. Müəllimin pedaqoji işinin təhlili göstərir ki, təlim məsələlərinin həllində ciddi çətinliklərin çoxu müəllimlərin uşaqlarla düzgün ünsiyyət qura bilməməsindən yaranır. Müasir dövrdə müəllim-şagird münasibətlərində diqqəti cəlb edən məsələlərdən birini də iki tərəf arasında bərabərhüquqluğun təmin edilməsi hesab etmək olar. Bu münasibətlərə uşaq-müəllim-valideyn-cəmiyyət münasibətləri də əlavə olunmalıdır. Müəllim-valideyn, məktəb-ailə münasibətləri ilə bağlı məsələlərin təhsilin bütün pillələri üçün standartlarda müvafiq şəkildə əksini tapmasını həm təqdirəlayiq, həm də məqsədəuyğundur. Dünyanın bir çox ölkələrinin təhsil sistemlərində ailə, ictimaiyyət və məktəb uşağın böyüməsində, onun şəxsiyyət kimi formalaşmasında, yəni sosiallaşmasında birlikdə iştirak edirlər. Uşaqların tərbiyəsində cəmiyyətin rolunu artırmaq üçün ailə və ictimaiyyətin məktəbdə aparılan islahatlar prosesinə cəlb edilməsi yollarını axtarıb tapmaqla, ailənin tərbiyə prosesindəki müstəsna aktivliyini yüksəltməklə təlim-tərbiyə işinə təsir imkanlarını genişləndirməyə kömək etmiş olarlar.

2003-2004-cü dərs ilinin “Təhsil sistemində müasir yanaşmaların təşəkkülü ili” elan edilməsi müxtəlif təhsil ocaqlarında təlimin yeni üsullarından istifadə edilməsinə səbəb olmuş, dərsə və müəllimə verilən tələblər kökündən dəyişmişdir. Dərs deyən hər bir müəllim öz fəaliyyətini təşkilati, təlim və tərbiyəvi istiqamətdə qurur. Müəllimin tərbiyəvi fəaliyyəti çox mühüm əhəmiyyət kəsb edir. Buraya ilk növbədə şagirdlərdə vətənpərvərlik tərbiyəsinin inkişafı daxildir. Dövlət rəmzləri və atributlarının öyrədilməsi tədris etdiyi fənnin növündən asılı olmayaraq hər bir müəllimin borcudur. Bir halda ki, söhbət şəxsiyyət formalaqdırmaqdan gedir, vətənpərvərlik tərbiyəsi öndə durur. Ümummilli lider cənab Heydər Əliyev çıxışlarında qeyd edirdi ki, “Hamımızın ümumi vəzifəmiz xalqımızda vətənpərvərlik, Vətənə, torpağa, millətə sədaqət, vətən yolunda, şəhidliyə hazır olmaq hisslərini formalaşdırmaq, inkişaf etdirmək və təbliğ etməkdir. Ola bilər ki, gənc nəsil əla oxumasın, lakin o, vətənini sevməyi, torpağını qorumağı bilməli, hər an buna hazır olmalıdır, bütövlükdə yaxşı vətəndaş kimi yetişməlidir”. Bu sözlər hər

bir azərbaycanlı üçün qanun kimi qəbul edilməlidir. Onun həyata keçirilməsi isə müəllimin, tərbiyəçinin özünün vətənpərvərliyinin yüksəkliyindən, şagirdi vətəni sevməyə ruhlandırmasından asılıdır. Xalqımıza məxsus milli-mənəvi dəyərlərin qorunması sahəsində şagirdlərin tərbiyələndirilməsi, onlara nizam-intizam, şagird davranışı, geyim, müəllim-şagird-valideyn münasibətlərində mövqeyi, böyüklərə hörmət, kiçiklərə qayğı prinsiplərinə riayət etməsi və sair kimi vərdişləri aşılamaq son dərəcə vacibdir. Ümummilli lider Heydər Əliyev öz çıxışlarından birində demişdir: "Biz çalışmalıyıq ki, gənclərimiz Azərbaycan xalqına xas olan mənəvi, milli ənənələri əsasında tərbiyə edilsinlər". Milli adət və ənənələrimizə hörmət etmək, onu qoruyub saxlamaq, milli musiqimizin, şifahi xalq ədəbiyyatımızın incilərini bilmək, Azərbaycanın görkəmli şəxsiyyətlərini tanımaq, qədim tarixi abidə və əraziləri öyrənmək ruhunda şagirdləri tərbiyə etmək müəllimin borcudur. Müəllim öz geyimi, davranışı, nəzakəti, yüksək intellekti ilə şagirdə şəxsi nümunə olmalıdır. Belə olduqda şagird müəlliminə oxşamağa çalışır, müəllimi ideallaşdırır.

***Rəyçi: prof. M.Həsənov***

## İstifadə edilmiş ədəbiyyat

1. Əliyev R. Tərbiyə psixologiyası. Bakı, 2006.

2. Həmzəyev M. Pedaqoji psixologiya. Bakı, 1991.

3. Həmzəyev M. Yaş və pedaqoji psixologiyanın əsasları. Bakı, 2002.

4. Məmmədov A. Təlimin psixoloji əsasları. Bakı, 1993.

5. Psixologiya. Prof. S.Seyidov və prof. M.Həmzəyevin elmi redaktorluğu ilə. Bakı, 2007.

6. Ильясов И. Структура процесса учения. М., 1986.

7. Развитие личности ребенка. М., 1987.

8. Столяренко Л.Педагогическая психология. Ростов на Дону. 2000.

9. Махмутов М. Современный урок. М., 1981.

**М.Нуриева**

**Требования к профессии учителя в современном обществе, черты портрета современного педагога**

**Резюме**

В статье особенно выделяются требования к современному педагогу. Автор связывает педагогическую деятельность со строением учебно-воспитательного процесса, а потом продвигает мысли о чертах современного учителя.

**M.Nuriyeva**

**Requirements for a teacher profession in a renewed society and the portrait of a modern educator**

**Summary**

The article deals mainly with the requirements for a modern teacher. The author links the pedagogical activity with the establishment of the training and education process, and then contemplates the portrayal of the modern teacher.

# TƏLİMİN KEYFİYYƏTİNİN YÜKSƏLDİLMƏSİNƏ DAİR MÜLAHİZƏLƏR



**Tofiq Məmmədov**
*fəlsəfə doktoru, dosent*
*Naxçıvan Müəllimlər İnstitutu*



**Vüsalə Mikayılova,**
*Naxçıvan şəhər 12 №-li tam orta məktəbin riyaziyyat-informatika müəllimi*



Məqalədə təhsilin keyfiyyətinin yaxşılaşdırılmasına aid bəzi mülahizələrdən bəhs edir. Azərbaycan Respublikasının təhsilin inkişafı üzrə Dövlət Strategiyasının əsas istiqamətləri ilə bağlı müəyyən fikirlər söylənilir. Bakalavr pilləsinidə təhsil alan istedadlı tələbələrin ustad müəllimlərdən əlavə təhsil alması və onların dərslərinin dinləyib müzakirə edilməsinin əsas xüsusiyyətləri çərh edilir. Daxil və xarici ölkələrin qabaqcıl təcrübəsindən bəhrələnmək üçün nümunələr göstərilmişdir.

***Açar sözlər:*** *təhsil, təhsilin keyfiyyəti, təhsildə peşəkarlıq, istedadlı tələbə, qabaqcıl təcrübə, pedaqoji təcrübə.*
***Ключевые слова:*** *образование, качественное обучение, профессиональное обучение, талантливый студент, передовой опыт, практическое обучение.*
***Key words:*** *education, quality education, professional education, talented student, advanced experiment, experiment education.*

Hər bir dövlətin qüdrətli olması üçün onun iqtisadiyyati, hərbi gücü, social durumu, mədəniyyəti dünyanın ən inkişaf etmiş ölkələri səviyyəsində sisteminin yüksək səviyyədə olması prioritet təşkil etməlidir. Müdrik bir kəlamda deyildiyi kimi “Millətlər necə oxuyurlarsa, elə də: yaşayırlar”. Təhsilin yüksək səviyyəsi isə keyfiyyətli təhsildən keçir.

XX əsrdə bütün sahələrdə olduğu kimi təhsil sistemində də qloballaşma gedir. Bu qloballaşmanın mahiyyətini yaddaş məktəbindən təfəkkür məktəbinə keçid təşkil eidr. Təfəkkürün dəyişilməsi özünü indiqo (kosmik təfəkkürlü) gənclərin yetişməsində daha qabarıq şəkildə göstərməyə başlanmışdır. Təhsildə aparılan islahatlar ölkələri yeni təhsil mühitinin yaradılmasına, müəllimlərin peşəkarlıq səviyyəsinin müasir tələblərə uyğunlaşmasına və uşaqlara yanaşmada müəllimlərin fəaliyyətində müsbət mənada dəyişiliklər edilməsinə də zərurət yaranmışdır.

Təcrübə göstərir ki, şagirdlərin marağı daha çox canlı ünsiyyət və dialoq üzərində qurlan dərsə yönəlir. Bu marağın təmin olunmasında interaktiv (daha fəal) metod və İKT-nin prosesində səmərəli tətbiq edilməsinin xüsusi rolu vardır.

Bu gün ölkələrdə təhsil müəsissələri nə gədər geniş infrastruktur və maddi-texniki bazaya malik olsa da, müasir İKT avadanlıqları ilə təmin olsa da, təhsilə sərf olunan maliyyə vəsaiti kifayyət gədər olsa

belə, peşəkar müəllimlər olmadan təhsilin inkişafını beynəlxalq standartlara cavab verəcək səviyyədə qurmaq çətin olur. Bəs peşəkar müəllim hansı keyfiyyətlərə malik olmalıdır? Hər şeydən əvvəl müəllim öz peşəsinin vurğunu olmalıdır.Öz peşəsini mükəmməl bilməyən müəllim şagirdlərinə tədris etdiyi fənni sevdirə bilməz. Bunun üçün müəllim şagirdlərin dərketmə (Blum taksonomiyası, Qardner nəzəriyyəsi) səviyyələrini bilən, özünə inam, üzünü qiymətləndirməni bacaran (Qultman şkalası) uşaqların ehtiyaclarını təsnifləşdirmə (A.Maslonun ehtiyaclar nəzəriyyəsi) nəzəriyyələri ilə tanış olmalıdır. Bu nəzəriyyələri öyrənmədən müəllim yalnız üzdə görünən (şagirdlərin davranışını, onların dərsdəki cavablarını, fəallığını, dərsə marağını, diqqətli olub-olmamağını və s.) məsələləri müşahidə edə bilir. Şagirdlərin təfəkküründə gedən, lakin gözlə görünməyən (dərk etməsini, nə haqda düşünməsini, informasiyasını qəbul edib əməl etməsini, qəbul olunmuş informasiya haqqında hansı nəticəyə gəlməsini və s.) prosesləri lazımı səviyyədə dərk edə bilmir.

Müəllimlərin peşəkarlıq səviyyəsini yüksəltmək üçün, ilk növbədə pedaqoji fakültələrin pedaqoji təcrübələrin keyfiyyətli keçirilməsindən başlamaq lazımdır. Təcrübə saatlarını müəllimlərin dərs yükünü balanslaşdırmaq məqsədi ilə dərs aparmayan müəllimlərə həvalə edilir. Elə hallar da olur ki, müəllimin ali məktəbdə dərs saatlarının sayı çox olduğundan pedaqoji təcrübədə iştirak etməsi imkansız olur. Şübhəsiz ki, belə halları müəllim hazırlığına mənfi təsirini göstərməyə bilməz.

Naxçıvan Müəllimlər İnstitutunda təhsilin keyfiyyətini yaxşılaşdırmaq məqsədilə və qismən də olsa adı çıkılən nəzəriyyələrə əsaslanan müəyyən işlər aparılır. Belə ki, seminar dərslərində tələbə mövzunu izah etdikdən sonra biliyi qiymətləndirir (Nəzərə alsaq ki, “Sabahın Müəllimləri” şagirdlərin biliyini gələcəkdə obyektiv qiymətləndirməyi bacarmalıdırlar). Burada nələr nəzərə alınır : mövzu tam əhatə olubdurmu? İzahda sistemlilik-ardıcıllıq prinsipi gözlənilibmi? Jurnalların quruluşu-qrammatik qayda və qanunlara uyğunluğu necə idi? Nitqin təmizliyi, aydınlığı, səlistliyi, dinamikliyi, sadəliyi, səsin tempi, onun ürəyə yatımlılığı, ən vacibi dərsi şagirdlərin başa düşəcəyi dildə izah edilməsi və s. şərtlərə diqqət yetirilir. Əgər danışıqda müəyyən nöqsanlar müşahidə olunarsa, bu nöqsanları yaradan səbəb nə idi? Göstərilən məqamlar nəzərə alınaraq, yekunda hər bir tələbə özü öz danışığına qiymət verir. Sual belə qoyulur. Şagirdin sənin kimi cavab versə idi, sən ona hansı qiyməti verərdin? Əksər hallarda tələbələrin özlərinə verdiyi qiymətlə müəllimin nəzərdə titduğu qiymətlər üst-üstə düşür. Bu formada aparılan qiymətləndirmə semestrin sonunda tələbələrlə müəllimlər arasında qiymətləndirmədə ciddi problemlər yaranmır. Bu qayda ilə aparılan dərslərdə tələbələrin əksəriyyəti seminar dərslərinə daha məsuliyyətlə və yaxşı hazırlaşırlar.

Başqa bir önəmli məqam isə tələbələrlə kollokviumların aparılmasıdır: Çox illik təcrübəyə əsaslanaraq kollokviumlar belə təşkil edilir: İmtahan biletlərinin sualları bir qayda olaraq, semestrin əvvəlində (ilk seminar dərsində) hər bir tələbəyə şəxsən təqdim edilir. Kollokviumun sualları bu sistem üzrə hazırlanır: İmtahan biletlərinin sualları təqribən üç hissəyə bölünür. Əgər semestr ərzində imtahana 90 (şərtidir say çox və ya az ola bilər) sual nəzərdə tutulursa, kollokviumlar mərhələlərlə - 30, 60, 90 sistemi üzrə sualların salınması məsləhət görülür. Kollokviumlar ayda bir dəfədən az olmayaraq seminar dərslərinə üç mərhələdə keçirilir. Birinci mərhələdə imtahan suallarının 1/3 hissəsi (30 sual – 15 dəqiqə), ikinci mərhələdə 2/3 hissəsi (60 sual – 30 dəqiqə) və üçüncü (yekun) mərhələdə isə

(90 sual – 45 dəqiqə) imtahan suallarının hamısı kollokviuma salınır. Sualların həcmindən aslı olaraq mərhələlərə ayrılan vaxt bölgüsü dəyişdirilə bilər. Kollokviumlar fənn müəllimlərinin ciddi nəzarəti ilə aparılır. Belə ki, mobil telefonlar, mühazirə dəftərləri, dərs vəsaitləri və dərsliklər tam yığışdırılır. Birinci mərhələdəki suallar ikinci mərhələdə, eyni zamanda birinci və ikinci mərhələdəki suallar isə üçüncü mərhələdə təkrar salına bilər. Kollokviumun sualları hər tələbə üçün fərdi olur – yəni variantlar təkrar olmur və bununla da tələbələrin bir-birindən köçürmə hallarının qarşısı çox asanlıqla alınır. Bu formada aparılan kollokviumların üstün cəhəti orasındadır ki, əgər tələbə bu vəya digər səbəbdən kollokviumların birinci və ya ikinci mərhələsində iştirak edə bilməyibdirsə, ona şərait yaranır ki, ikinci mərhələdə (yekun mərhələsi) iştirak etməklə burda aldığı qiyməti əvvəlki mərhələlərə (birinci və ya ikinci mərhələyə) aid edilsin. Kollokviumların bu qayda ilə təşkili, tələbələrin imtahana artıq ikinci mərhələdə hazır olmalarına əlverişli şərait yaradır. Bu üsulla aparılan kollokviumlarda tələbələr imtahanlarda xoşa gəlməyən problemlərlə qarşılaşmır və yaxşı nəticələr əldə edilir.

İnstitutda neçə illərdir ki, “Sabahın müəllimi” layihəsi fəaliyyət göstərir və effektiv nəticələr əldə olunur. Müəllimlik peşəsinin sirlərini “dörd divar” arasında mühazirə oxumaqla öyrətmək mümkün deyildir. Bu layihənin mahiyyəti ondan ibarətdir ki, müəllimlik sənətinə xüsusi maraq və həvəs göstərən istedadlı tələbləri bu layihəyə cəlb etməklə gələcək müəllimlərin peşə hazırlığını xeyli yaxşılaşdırmaq olur. Müəllimlik sənətinə xüsusi maraq göstərən istedadlı tələbələr Naxçıvan şəhər 12 №-li məktəbdə (baza məktəbində), ustad (öz sənətinin peşəkarı) müəllimlərin dərslərini dinləyir və sinif müəlliminin razılığı və nəzarəti ilə özü dərs aparır (tədris planında nəzərdə tutulan təcrübə saatlarından əlavə). Özünü kifayət qədər hazırlıqlı hiss etdikdən sonra, sinif müəllimi, institutun nəzəri dərslərini aparan müəllim və tələbə yoldaşları hissə-hissə (4, 5 tələbə növbə ilə) onların dərslərini dinləyərək müşahidə aparır. Burada əsasən aşağıdakı məqamlara diqqət yetirilməsi məsləhət görülür: şagirdlərin dərsdə fəallığı necə təmin olunmuşdur? İKT-dən və müxtəlif elektron resurslardan istifadə olundumu? Müəllim dərsin məqsədini düzgün çatdıra bildimi? Metod, vasitələr və iş formasını (cütlərlə, qrupla, kollektivlə iş) düzgün seçilmişdirmi? Dərsin başqa fənlərlə əlaqəsi (inteqrasiya) göstərildimi? Şagirdlərin bir-biri ilə və müəllimlə ünsiyyət qurması Təhsil Strategiyasının tələblərinə cavab verdimi? Şagirdlərin biliyinin qiymətlənidrməsi düzgün aparıldımı? Vaxt bölgüsündən düzgün istifadə edildimi? Sonda dərs müzakirə edilir. Müzakirədə ilk sözü dərsi aparan tələbəyə verilir. Tələbə dərsin gedişində ancaq buraxdığı noqsanlar və onların səbəblərini izah edir. Sonra tələbə yoldaşları dərsdə müşahidə etdikləri müsbət və mənfi cəhətlərini göstərirlər. Daha sonra fənn müəllimi və ən nəhayət nəzəriyyə müəllimi dərs haqqında öz düşüncələrini bildirərək müzakirəni yekunlaşdırır. Müzakirənin gedişi protokolda öz əksini tapır. Ən yaxşı dərs aparan tələbə və onun orta məktəb müəllimi nəzəriyə müəlliminin təqdimatı ilə institutun rektorluğu tərəfindən mükafatlandırılır.

Bu qaydada aparılan dərslər demək olar ki, tədris ili müddətində həftədə bir dəfədən az olmamaq şərtilə (tədris planından əlavə) keçirilir. Əgər tələbə ikinci növbə oxuyursa – ali məktəbdə ki, dərsinə mane olmamaq şərti ilə birinci növbədə ( bir akademik saat dərsin keçirilməsi, təqribən bir o qədər də müzakirəsi) keçirilir.

Eyni zamanda Naxçıvan Muxtar Respublikası Ali Məcəlləsinin sədrinin sərəncamı əsasında alimlər orta məktəblərdə ayda bir dəfədən az olmayaraq açıq dərslərin keçirilməsi tövsiyə olunur. Bu sərəncamın üstün cəhəti orasındadır ki, orta məktəb müəllimlərinin, valideynlərin kurikulumla

bağlı müəyyən çətinlikləri və cualları olarsa, onu yerindəcə həll etmək olur. Bu sərəncam ali məktəblə orta məktəbin əlaqəsini möhkəmləndirmək üçün çox yaxşı vasitədir. Bu deyilənlər şübhəsiz ki, təhsilin keyfiyyətinə öz müsbət təsirini göstərir.

Qeyd etmək yerinə düşər ki, 12 №-li məktəb Naxçıvan MR-də ən qabaqcıl məktəblərdən biri hesab edilir (direktoru Y.Novruzov Prezident mükafatına layiq görülüb).

Peşəkarmüəllimlər hər bir şagirdə fərdi yanaşmaqla onların potensial imkanlarını nəzərə almaqla tədris prosesini təşkil edir. Belə ki, zəiflər, orta səviyyəlilər və istedadlılara yanaşma tərzi hər birinin gücünə müvafiq olur.

Düşünürəm ki, bu sahədə Finlandiya təcrübəsindən bəhrələnmək təhsilimizdə yaxşı nəticə verə bilər.

Finlandiya – dünyanın təhsil sahəsində əsas monitorinq – PİSA-nın sıralamasında ən öndə yer tutmuğa müvəffəq olub (son 30 ildə dünya təhsil sistemindəki reytinqə görə).

Finlandiya təhsil sisteminin özəlliyi nədir? Təhsilin mühüm cəhəti onun “relaxed”, yəni rahat olmasıdır. Hətta sərt tənqidçilər qeyd edirlər ki, bu sistem nəinki “relaxed”, hətta “too relaxed”, yəni həttindən artıq rahatdır. Ekspertlərin fikrincə, Finlandiya özünün təhsil sistemini qurarkən Çin mədəniyyətindən müdrikliyi, yəni Şərq döyüş üslubunda “diqqətin konsentrasiyası” fəlsəfəsindən özü üçün istifadə etməsidir. Bu fəlsəfəyə görə maksimal effektliyi əldə etmək üçün gərginliyə ehtiyac yoxdur, axı gərginlik stress deməkdir ki, bu halda orqanizmin əsas vəzifəsi inkişafa deyil, xilasa yönəlir. Bu sistemin əsas xüsusiyyəti humanizm prinsiplərinə əsaslanaraq öyrə-nənlərin bərabərliyi və qarşılıqlı hörmətə əsaslanan əlverişli mühitin yaradılmasıdır.

Finlandiya təhsil sisteminin əsas missiyası öyrənənləri orta səviyyəyə çatdırmaqdır. Burada əsas məqsəd zəif oxuyanları orta səviyyəyə çatdırmaqdan ibarətdirsə, onda orta xətdən yuxarı olan qeyri-adi istedada malik olanlar necə olmalıdır? Təhsildə geri qalanlar üçün müəllimdən tələb olunan nə lazımdırsa onu etməlidir. Orta xətdən yuxarı olan istedadlı uşaqlar üçün isə xüsusi repetitorlar tutulur (valideynlərin hesabına). Onu da qeyd etmək lazımdır ki, Finlandiyada birinci sinifə qəbul olan uşaqların təqribən 98 %-i uşaq baxçasından gəlir. Finlandiyada 3-cü sinifdən ingilis, alman, fransız, isveç dillərini, 8-ci sinifdən isə rus, ispan və çin dillərini öyrənirlər. Proqram və televiziya filmləri tərcümə edilmir, hansı dildə çəkilibsə o, dildə də tamaşa edilir. Təhsil haqqında media – “Newtonew” qeyd edir ki, hamı Eynşteyn ola bilməz, məqsəd uşaqları professional həyata hazırlamaqdır. Finland.fi internet resurslarından Finlandiya təhsil sisteminin əsas xüsusiyyətləri haqqında geniş məlumat almaq olar.

Təhsilin keyfiyyətinin yüksəldilməsinin əsas meyarı peşəkarlıqdırsa, peşəkarlığın əsas meyarı isə qabaqcıl təcrübədən bəhrələnməkdir. Bu təcrübə istər daxili, istərsə də xarici ölkələrin qabaqcıl təcrübəsi olsun.

***Rəyçi: prof. O.Həsənli***

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, № 5.
2. “Təhsildə Qloballaşma və İKT” mövzusunda konfrans materialları. Bakı, 2008.
3. http://kayzen.az/blog
4. www.anovikov.ru
5. Finland.fi
6. www.edu.gov.az
7. www.mektebli.president.az
8. www.Muallim.edu.az
9.www.wikipedia.org

**Т.Мамедов,**
**В.Микайылова**

**Суждения о повышении качества образования**

**Резюме**

В статье рассматриваются некоторые соображения относительно качества образования. Показаны определенные взгляды на основные направления Государственной Стратегии в развитии образования, в Азербайджанской Республике. Талантливые студенты, обучающиеся на уровне бакалавриата, учатся у учителей основным навыкам слушания и обсуждения их уроков. Приводятся примеры использования передовых практик в стране и за рубежом.

**T.Mammedov,**
**V.Mikayilova**

**The arguments are on the increase of quality of education**

**Summary**

The article considers some considerations regarding the quality of education. Certain looks are shown to basic directions of State Strategy in development of education in Azerbaijan Republic. Talented students studying at the undergraduate level learn from teachers the basic skills of listening and discussing their lessons. Provides examples of best practices in the country and abroad.



# GÖRKƏMLİ BƏSTƏKAR, DİRİJOR, MUSİQİ PEDAQOQU, İCTİMAİ XADİM

**Nazim Kazımov,**
***Əməkdar incəsənət xadimi, professor***

Azərbaycan musiqi mədəniyyətinin görkəmli simalarından olan Səid Rüstəmov sənətin qüdrət və mənasını xalqa xidmətdə, mədəniyyətimizin inkişafı naminə qabaqcıl ictimai idealları tərənnüm etməkdə görən böyük sənətkarlardan idi. O, Azərbaycan musiqi mədəniyyəti tarixinə görkəmli bəstəkar, dirijor, musiqi pedaqoqu kimi daxil olmuş, zəngin yaradıcılıq fəaliyyəti ilə xalqın sonsuz etimad və məhəbbətini qazanmışdır. Sənət aləminə qədəm qoyduğu gündən tutduğu yola sadiq qalan sənətkarın şəxsiyyətindəki kamillik heç bir təsirin poza bilmədiyi yüksək keyfiyyət idi. Respublikamızda yarım əsrdən çox bir müddət ərzində musiqi mədəniyyətinin, musiqi təhsilinin inkişafı sahəsində əvəzsiz xidmətləri olan S.Rüstəmov musiqi təhsili sistemimizin fəal qurucularından biri olmuşdur.

Səid Rüstəmov sənətinin, şəxsiyyətinin bugünkü musiqimiz üçün, onun istedadlı nümayəndələri üçün lazımlı, gərəkli cəhətlərinin daha dərindən və ətraflı öyrənilməsi musiqi ictimaiyyəti qarşısında mühüm vəzifə olaraq qalır.

Səid Rüstəmov öz şəxsiyyəti, sənətinin xəlqiliyi, insaniyyəti, sədaqəti etibarilə əsl mənada Azərbaycan xalqının içindən çıxmış bir sənətkar idi. O, bildiyini öyrətməkdən nəinki yorulmur, əksinə əsl sənət həzzi alırdı. Böyük sənətkardakı bu böyük xüsusiyyəti yaxından müşahidə etmək səadəti mənə də qismət olmuşdur. Səid Rüstəmov istedadlı tələbələrə xüsusi diqqət və qayğı göstərirdi. 1973 – 1978 - ci illərdə Səid müəllimin tar sinfində oxuduğum illərdə onu çox savadlı, aydın, səlis nitq mədəniyyəti, geniş dünyagörüşünə malik pedaqoq kimi tanımışam. O, tələbələrinə bütün sahələr üzrə bilik və bacarıqlarını artırmağı tövsiyə edir, əsl musiqiçinin əsl xalq ziyalısı olduğunu deyirdi.

XX əsrin əvvəllərində milli musiqi təhsili sistemində mütərəqqi mahiyyət kəsb edən “Tar məktəbi” dərsliyinin nəşri musiqi ictimaiyyəti tərəfindən dərin rəğbətlə qarşılanır. Dərsliyin yazılmasında Avropa musiqi alətləri üçün yazılmış mənbələrə müraciət etsə də, S.Rüstəmov tarın özünəməxsus ifa tərzini nəzərə alaraq mükəmməl bir tədris vəsaiti hazırlamışdır. “Tar məktəbi” dərsliyi əsasında təhsil alan, yetişən istedadlı tarzənlər Azərbaycan, rus və Qərbi Avropa bəstəkarlarının əsərlərini mükəmməl ifa etmiş, bununla da milli musiqi alətimizin bədii – texniki imkanlarını respublikamızda, habelə keçmiş SSRİ-də, Şərq aləmində, dünyanın bütün sivil ölkələrində nümayiş etdirmişlər. Özünəməxsus yaradıcılıq yolu və üslubu olan bəstəkarın əsərlərində Üzeyir Hacıbəylinin ənənələrindəki kimi xəlqilik, onun yaradıcılığına xalq xəzinəsindən gələn rəngarəng çalarlar gətirmişdir.

Görkəmli bəstəkar, dirijor Səid Rüstəmovun həyat və yaradıcılığının 40 ildən çox bir müddəti əhatə edən məhsuldar dövrü təməli Üzeyir Hacıbəyli tərəfindən qoyulan Azərbaycan xalq çalğı alətləri orkestri ilə bağlı olmuşdur. Üzeyir bəyin “Arşın mal alan” musiqili komediyasını xalq

çalğı alətləri orkestri üçün işləyən S.Rüstəmov 1938-ci ildə Moskvada keçirilən I Azərbaycan ədəbiyyatı və incəsənəti ongünlüyündə bir dirijor kimi ustalığı ilə orkestrin nizamlılığı, mükəmməl səslənməsi ilə musiqisevərlərin diqqətini cəlb etmşdir. Bir bəstəkar kimi də Səid Rüstəmov orkestr üçün maraqlı əsərlər: “Bayatı – Kürd” fantaziyasını, dörd süita, xor, solist və orkestr üçün üç kantata, tar və orkestr üçün konsert,bir çox müxtəlif formalı pyeslər, mahnılar yazmışdır.



Xalqın ən çox sevdiyi, oxuduğu, həmişə eşitməyə ehtiyac duyduğu musiqi janrlarından ən əsası mahnıdır. Mahnı ən demokratik, ən operativ janr kimi yüksək humanist fikirlərə qədər çox geniş sahəni əhatə edir. Səid Rüstəmovun mövzu rəngarəngliyi, obrazların zənginliyi, eləcə də səmimiyyəti ilə diqqəti cəlb edən mahnılarnda Vətənə məhəbbət, əməyə qiymət ön planda durur. “Sürəyya”, “Neftçi qız”, “Həkim qız”, “Sumqayıt”, “Bakı”, “Quba”, “Mən sülhə səs verirəm”, “Toxucu qız” mahnıları geniş dinləyici kütləsi tərəfindən böyük rəğbətlə qarşılanmışdır. Səid Rüstəmovun mahnıları özünəməxsus orijinal yaradıcılıq dəsti-xətti, zərif lirikası, parlaq melodiyası ilə seçilir. “Sənindir”, “Bənövşə”, “Qurban adına”, “Gəlmədin”, “Dedim-dedi”, “Şer deyilmi”, “Oxu gözəl” və bu kimi mahnılar bəstəkarın vokal musiqisinin parlaq nümunələridir. Səid Rüstəmov Azərbaycan professional musiqi sənətində uşaq mahnı janrının təməlini qoyanlardan biri olmuşdur. “Ana məktəb”, “Dəstə rəhbəri”, “Şaxta baba”, “Kəpənəyim”, “Qaranquşum”, “Sarmaşıq”, “Uşaq və buz”, “Yaz günləri”, “Şəhər nəğməsi”, “Əmək nəğməsi” müxtəlif yaş qruplarına aid olan uşaqlar, məktəblilər üçün nəzərdə tutulmaqla onların musiqi – estetik tərbiyəsində mühüm rol oynamışdır. Bu mövzular məktəblərimizin özülünü inkişaf etdirən və bu sahədəki bilikləri artırmağa kömək edən ən ciddi vasitədir. Çünki musiqi böyüməkdə olan nəslin bədii-estetik tərbiyəsinin hərtərəfli inkişafının təmin olunmasında mühüm rol oynayır.

Musiqili səhnə əsərləri arasında tamaşaçılar tərəfindən daha çox sevilən operetta – musiqili komediya janrında bəstəkarın ilk əsəri M.S.Ordubadi ilə əməkdaşlıq nəticəsində yaranan “Beşmanatlıq gəlin” operettasıdır. Satirik yumorlu məişət səhnələrində S.Rüstəmov hər obrazı öz təbiətinə uyğun, öz dilində canlandırmışdır. Bir qədər sonra meydana gələn “Durna”, “Rəisin arvadı” operettaları da milli musiqili komediya janrının inkişafında önəmli rol oynamışdır. Bəstəkarın M.F.Axundovun “Hacı qara”, “Xırs quldurbasan”, C.Cabbarlının “Almaz”, “Od gəlini”, A.Şaiqin “Nüşabə”, S.Vurğunun “Vaqif”, M.Hüseynin “Nizami”, R.Rzanın “Vəfa”, Ə.Məmmədxanlının “Şərqin səhəri”, S.Rəhmanın “Toy”, “Aydınlıq”, “Nişanlı qız” və digər səhnə əsərlərinə yazdığı musiqi tamaşaların bədii-estetik təsir qüvvəsinin artmasına zəmin yaratmışdır.

Məlum olduğu kimi folklor mənəviyyatımızın güzgüsü, milli dəyərlərimizin və adət–ənənələrimizin göstəricisi, mədəni sərvətimizin ayrılmaz tərkib hissəsi sayılır.

Dahi Üzeyir bəy bu sərvət və mənbədən layiqincə istifadə etmək üçün musiqi folklorunun tədqiqi ilə məşğul olmağı, xalq musiqi nümunələrinin toplanıb nota köçürülməsini gənc musiqiçilər qarşısında duran ümdə vəzifələrdən biri sayırdı. Folklorşünaslıq sahəsinin dərin bilicilərindən olan Səid Rüstəmov yüzlərlə el havalarını, xalq mahnılarını toplayıb nota köçürmüş və nəşr etdirmişdir. 1937-ci ildə "Azərbaycan xalq rəqsləri", 1938-ci ildə Cabbar Qaryağdının repertuarından "50 Azərbaycan xalq mahnısı", həmin ildə "Aşıq mahnıları" adlı nəşr olunmuş 4 məcmuəsi musiqi folklorşünaslığının inkişafında mühüm tapıntı oldu. Nota köçürülən xalq musiqi nümunələri tədris prosesinə tətbiq edilmiş, musiqi təhsilinin milli zəmində davam etməsinə şərait yaratmışdır. Nota köçürülən xalq musiqi nümunələrindən bəstəkarlarımız daha səmərəli şəkildə istifadə edərək müxtəlif janrlı musiqi əsərləri yaratmışlar. Səid Rüstəmovun nota köçürdüyü xalq musiqi nümunələri sərhədləri aşaraq digər ölkələrdə də musiqi təhsili prosesinə, ifaçılıq məktəbinin inkişafına müsbət təsir göstərmişdir.

Səid Rüstəmov Azərbaycan mədəniyyəti tarixində böyük musiqi xadimi ilə yanaşı ictimai xadim kimi də şərəfli yer tutur. Azərbaycan Bəstəkarlar İttifaqının sədri kimi fəaliyyət göstərdiyi illərdə sənətkar musiqi mədəniyyətimizin nailiyyətlərini daha da artırmaq və bunları geniş xalq kütlələrinə çatdırmaq səyilə çalışmışdır. 1951-ci ildə üçüncü çağırış Azərbaycan SSR Ali Sovetinə deputat seçiləndən sonra onun ictimai fəaliyyət diapazonu daha da genişlənmişdir. Səid Rüstəmov dəfələrlə Bakı şəhər sovetinə deputat seçildiyi illərdə də zəhmətkeşlərin mədəni həyat səviyyəsinin yüksəlməsi naminə yorulmadan çalışmışdır. Səid müəllim dəfələrlə xalq çalğı alətləri ifaçıları üçün keçirilən Ümumdünya və Ümumittifaq festivallarında münsiflər heyətinin sədri və üzvü olmuşdur. Azadlığa, mədəni tərəqqiyə, sülhə səs verən sənətkar iştirak etdiyi bütün tədbirlərdə öz səsi, sözü, məzmunlu çıxışları ilə tanınmışdır. Sənətin qüdrət və mənasını xalqa xidmət və hizmətdə görən sənət fədaisi, alovlu vətənpərvər Səid Rüstəmovun geniş, çoxşaxəli fəaliyyəti layiqincə qiymətləndirilmiş, 1938-ci ildə Əməkdar incəsənət xadimi, 1957-ci ildə Azərbaycan Respubli-kasının xalq artisti fəxri adlarına, 1951-ci ildə SSRİ Dövlət Mükafatına layiq görülmüşdür. O, iki dəfə Qırmızı Əmək Bayrağı ordeni ilə, Xalqlar Dostluğu ordeni və bir sıra medallarla təltif olunmuşdur.

Azərbaycan musiqisinin zənginləşməsində xüsusi xidmətləri olan böyük bəstəkarın adı respublikada böyük şöhrət və nüfuz qazanan Milli Konservatoriya nəzdindəki Musiqi Kolleci ilə sıx bağlıdır.

Adı musiqi tariximizə qızıl hərflərlə yazılmış tarixi şəxsiyyətlər; Qara Qarayev, Fikrət Əmirov, Cövdət Hacıyev, Tofiq Quliyev, Süleyman Ələsgərov, Hacı Xanməmmədov, musiqişünaslardan Elmira Abbasova, Rəna Məmmədova, Tariyel Məmmədov, İmruz Əfəndiyev kimi o da bu kollecin məzunudur. Onun da adı böyük hərflərlə yazılan adlarla bir cərgədə çəkilir.

Tarix Səid Rüstəmovu bizdən uzaqlaşdırdıqca, zaman onun bir sənətkar kimi milli – mənəvi varlığımız, mədəniyyətimiz üçün əhəmiyyətini dönə – dönə təsdiq edir.

***Rəyçi: prof. V.Xəlilov***



# MİLLİ-MƏNƏVİ DƏYƏRLƏRİMİZİ QORUYAQ

**Nuranə Mirzəyeva,**
***Astara Pedaqoji Kollecinin müəllimi***

Məqalədə dövlətimizin dəstəyi və qayğısı nəticəsində 2009-cu ildə UNESCO-nun qeyri-maddi mədəni irs siyahısına salınmış Azərbaycan aşıq sənəti və onun görkəmli nümayəndəsi Aşıq Ələsgər haqqında iformasiya verilir. Milli-mənəvi dəyərlərimizin tələbələrə aşılanmasında sinifdənxaric tədbirlərin təşkili və bu tədbirlərin gənc nəslin mənəvi aləminin zənginləşməsində rolundan bəhs olunur.

***Açar sözlər:*** *gənc nəsil, tərbiyə, sinifdənxaric tədbirlər, qeyri-maddi mədəni irs, aşıq sənəti.*

***Ключевые слова:*** *молодое поколение, воспитание, внеклассные мероприятия, нематериальное культурное наследие, искусство ашугов.*

***Key words:*** *younger generation, education, extracurricular events, non-material heritage, ashig art.*

Müstəqil Azərbaycan Respublikasının gələcək vətəndaşının savadlı, tərbiyəli, mədəni, əxlaqi cəhətdən saf, mənəvi cəhətdən kamil bir insan kimi yetişməsi qarşıda duran vacib pedaqoji və sosial problemlərdəndir. Cəmiyyət üçün yararlı vətəndaş yetişdirmək məsuliyyəti təhsil müəssisələrinin, müəllimlərin, o cümlədən ədəbiyyat müəllimlərinin üzərinə düşür.

Məlumdur ki, yüksək keyfiyyətlərə malik yeni insanı yalnız sinif-dərs prosesində tərbiyə etmək mümkün deyildir. Dərs çərçivəsi heç də həmişə müəllimə tələblərin daxili aləminə nüfuz etməyə, onlarda sağlam maraq və arzular oyatmağa, davranışlarındakı nöqsanları aradan qaldırmağa, milli-mənəvi dəyərlərimizi öyrətmək və qeyri-maddi mədəni irsimizə hörmətlə yanaşmaq kimi keyfiyyətləri aşılamağa imkan vermir. Həyatımızda baş verən hadisələr pedaqoqlar qarşısına tərbiyənin elə problemlərini qoyur ki, onları təkcə dərs prosesində həll etmək qeyri-mümkündür. Bu nöqteyi-nəzərdən tələbələrlə dərsdənkənar tərbiyə işlərinin təşkili mühüm rol oynayır. Dərdənkənar tərbiyə işləri sinifdənxaric tədbirlər formasında həyata keçirilir. Sinifdənxaric işlər məktəbdə təlim-tərbiyə işinin əsas tərkib hissəsidir. Ümumiyyətlə, təhsil müəssisələrində bu tip tədbirlərin təşkili şagirdlərin, tələbələrin estetik zövqünün formalaşmasına, mənəvi aləminin zənginləşməsinə, onlarda Vətənimizə, mədəniyyətimizə bağlılıq hissinin yaranmasına, milli ruhun formalaşmasına xidmət edir və tələbələrə dərs prosesində qazandıqları bilik, bacarıq və vərdişləri, nəcib keyfiyyətləri dərsdənkənar vaxtda möhkəmləndirməyə imkan verir.

2016-2017-ci tədris ilinin ikinci yarısından direktorumuzun təşəbbüsü ilə dövlətimizin dili, tarixi, mədəniyyəti ilə

bağlı, milli-mənəvi dəyərlər, qeyri-maddi mədəni irsimiz, multikulturalizm, əlamətdar və xüsusi günlərlə bağlı silsilə tədbirlərin keçirilməsi və tələbələrin bu tədbirlərin təşkilinə cəlb olunması, zəif oxuyan tələbələrin elmə, ədəbiyyata, mədəniyyətə münasibətində, etik davranışlarında ciddi dönüş yaratmış, fəal tələbələrin müəyyən bacarıq və qabiliyyətlərinin üzə çıxarılmasına müsbət təsir göstərmişdir.

Kollecdə keçirilən maraqlı tədbirlərdən biri də aşıq sənəti və qədim musiqi alətimiz olan sazın təbliği ilə bağlı təşkil olunmuş "Böyük el sənətkarı" adlı ədəbi-bədii gecə olmuşdur.

Aşıq sənəti xalqın özünün yaradıcılığıdır. Xalq yaradıcılığı isə heç bir texniki, metodiki kömək qəbul etmir. O, öz-özünə xalqın mədəni, iqtisadi-siyasi səviyyəsi ilə bərabər inkişaf edir. Bu elə bir sənət sahəsidir ki, orada şairin də yazıçının da, ədəbiyyatşünasın da, bəstəkarın da, çalmaq, oxumaq, oynamaq, söz qoşmaq və dastan söyləmək kimi incəsənətin bir çox növlərini özünə birləşdirən zəngin sənət sahəsidir.

Azərbaycan Respublikasının Birinci vitse-prezidenti, Heydər Əliyev Fondunun prezidenti Mehriban Əliyevanın böyük səyi nəticəsində Azərbaycan aşıq sənəti 2009-cu ildə UNESCO-nun Bəşəriyyətin qeyri-maddi mədəni irsinin reprezentativ siyahısına daxil edilmişdir.

Azərbaycan aşıq sənəti çox dərin tarixi kökləri olan və yuzilliklər boyu keçilən inkişaf yolunun məntiqi məhsulu olsa da Azərbaycan aşıq yaradıcılığı dedikdə ilk yada düşən, böyük istedadı ilə aşıq sənətinin tarixi simvoluna çevrilmiş Aşıq Ələsgər olur. Azərbaycan aşıq sənətində özünəməxsus yeri olan böyük ustad Aşıq Ələsgər xalqımızın bədii təfəkkür tarixində tükənməz bir xəzinə sahibidir. Aşıq Ələsgər yüz ildə bir dəfə dünyaya gələn nadir şəxsiyyətlərdəndir. O, özünün fitri istedadı, qeyri-adi bacarıq və qabiliyyətləri ilə Azərbaycan aşıq sənətində hamıdan seçilir. Maraqlıdır ki, Dədə Qorquddan sonra ədəbiyyatımızda "Dədə" titulu, "Dədə" künyəsi məhz Aşıq Ələsgərə verilib: Dədə Ələsgər.

Böyük el şairi, göyçəli Dədə Ələsgər 1821-ci ildə Ağkilsə kəndində, Alməmməd kişinin ocağında dünyaya göz açsa da, sonradan saz, söz, sənət sevən hər bir ocağın doğmasına, sevimlisinə çevrilmişdir. Aşıq Ələsgər üç müqəddəs ocağın doğmalığında yaşamış, üç müqəddəs ocağın istisində isinmişdir: bir şair qəlbli Alməmməd kişinin ata ocağında altı uşağın böyüyü kimi sevilmiş, bir, böyük ustad Aşıq Alının ocağında sənət dünyasının sirlərini öyrənmiş, bir də, Göyçə mahalının qoynunda Vətən övladı və tanınan sənətkar kimi pərvazlanmışdır.

Aşıq Ələsgər təhsil ala bilməmişdir. O, sənətin sirlərini el sənətkarlarının yanında öyrənmişdir. Aşıq Alının yanında 5 il şagird qalmışdır. Şəyirdilik dövrünü başa vurduqdan sonra aşıqlıq etmiş, toy məclisləri aparmışdır. Qısa bir zamanda o, nəinki Azərbaycanda, hətta Azərbaycanın hüdudlarından kənarda Türkiyədə, İranda Dağıstanda da ustad bir sənətkar kimi tanınmış və sevilmişdir.

105 il ömür yaşayan Ələsgərin həyatının on illəri keşməkeşli olmuşdur. 1918-1919-cu illərdə ermənilərin türklərə qarşı törətdiyi qırğın nəticəsində Göyçə mahalı talanmış, əhali dədə-baba yurdunu tərk etməli olmuşdur. Aşıq Ələsgər də qoca vaxtında ailəsi ilə birlikdə Vətənini tərk etməyə məcbur olmuş, əvvəlcə Kəlbəcərdə, bir müddət də Tərtərdə yaşamalı olmuşdur. Nəhayət, 1921-ci ildə

Ağkilsə kəndinə qayıdan Aşıq 1926-cı ildə öz doğma yurdunda 105 yaşında vəfat etmişdir.

Aşıq Ələsgərin nəvəsi, eyni zamanda Ələsgər yaradıcılığının tədqiqatçısı, İslam Ələsgər babası haqqında danışaraq qeyd edir ki, Ələsgərin qeyri-adi yaddaşı varmış, bir dəfə eşitdiyini yaddaşına ömürlük yazarmış. Aşıq Ələsgər o dövrün savadlı adamları ilə, mirzələri ilə dostluq edər, onların evinə qonaq gələndə onlara kitab oxutdurub qulaq asarmış. O, eşidib öyrənmək yolu ilə zəngin bilik qazanmışdır.

Aşıq Ələsgər Quranı əzbər bilirmiş. Bir dəfə kənddə yas mərasimi olur. Aşıq da bu məclisdə iştirak edir. Molla Quranı oxuyub bitirdikdən sonra Əlsgər mollaya deyir ki, ay Molla, filan yerdə filan sözü düz demədin. Molla gülüb deyir ki, Aşıq Ələsgər, sən ki, oxumayıbsan, nə bilirsən düz demədiyimi?

Aşıq deyir: “Bilməsəm demərəm”. Molla gətirib Quranı açır və oxumuş adamlara bir-bir göstərir ki, baxın görün mən deyəndimi? Hamı baxır ki, Molla deyən kimidir. Aşıq Ələsgər isə deyir ki, o kitabda, o söz səhv gedib. Elə məclisdən iki nəfər göndərirlər ki, gedib başqa bir Quran gətirsinlər. Kitabları tutuşdururlar. Məlum olur ki, də mollanın kitabında söz səhv gedib.

Aşıq Ələsgər dini kitablarla yanaşı bədii kitablara da çox əhəmiyyət vermişdir. O, şeirlərində Firdovsinin, Nizaminin, Nəsiminin, Hafizin adını çəkir, onların əsərlərindəki qəhrəmanların adını çəkir. Bütün bunlar göstərir ki, heç bir mədrəsə, məktəb təhsili görməmiş Dədə Ələsgər çox böyük savad sahibi olmuşdur.

Aşıq Ələsgər haqqında söylənilən xatirələrindən və rəvayətlərdən öyrənirik ki, böyük sənətkar qarşı-qarşıya söhbət etdiyi adamların fikrindən keçənləri oxuya bilirmiş. O, həm də baş verəcək bir çox hadisələri əvvəlcədən yuxuda görürmüş.

Dədə Qorqud kimi Aşıq Ələsgərin də alqışı və qarqışı böyük təsir gücündə malik imiş. Dədə Ələsgər, hətta dünyadan köçəcəyi günü belə əvvəlcədən yaxınlarına xəbər veribmiş. Bu cür qeyri-adi keyfiyyəti və böyük istedadı ilə Aşıq Ələsgər Azərbaycan aşıq sənətinin tarixi simvoluna çevrilməyi bacarmışdır. Bu gün biz Aşıq Ələsgər dediyimiz zaman bütövlükdə Azərbaycan aşıq sənəti göz önündə canlanır.

Ələsgərin poeziyasında bir neçə qabarıq istiqamət özünü göstərir. Birinci, xalq müdrikliyindən gələn, xəlqi didaktika ilə bağlı olan elat həyat tərzinin təcrübəsi. İkinci istiqamət, onun bilik öyrənmək yolu ilə əldə etdiyi Təsəvvüf simvolikası, İfran elmidir. Üçüncüsü isə, öz könüldən qaynaqlanan könül duyğularıdır. İstər Azərbyacan təbiətinin gözəllikləri olsun, istər elat gözəlləri olsun, istərsə də insanın mənəvi gözəllikləri olsun, bütün bu keyfiyyətlərin hamısı bu üç axar boyu Aşıq Ələsgərin poeziyasında danışıb gəlməkdədir. Onun şeirlərindəki ülvi gözəllik, onun şeirlərindəki dərin fəlsəfi tutum və obrazlılıq, bütün bunlar hamısı, Aşıq Ələsgərin böyük istedadından xəbər verir.

Aşıq Ələsgər daşıdığı sənət ənənəsini, Ağ aşıq, Aşıq Alı kimi ustadlardan əxz etmişdir, özünün məhsub olduğu sənət şəcərəsindən, nəsil şəcərəsindən almışdır. Onun atası da, babası da saz-söz sənəti ilə bağlı çox sərraf adamlar olmuşlar. Bu ənənə Aşığın ailəsində də davam etmişdir. Ələsgərin qardaşları, övladları, nəvələri də bütövlükdə saza-sözə köklənmiş, bu sənətin sirlərini canladırmağı bacaran böyük istedadlar olmuşlar.

Aşıq şeirinin rəngarəng formalardan

keçməsi tarixi də Aşıq Ələsgər yaradıcılığı ilə bağlıdır. O, rəngarəng aşıq şeri formalarından qoşayarpaq qoşma, müstəzad qoşma, cığalı təcnis, dodaqdəyməz, dildönməz təcnis kimi formalardan istifadə etmişdir. Aşıq Ələsgər elə bir nadir söz ustalarındandır ki, sözü mum kimi özünə tabe edtirə bilir, istədiyi formada sözdən məna ala bilir. Yəni, qeyri-adi dərəcədə sözlə oynamaq, sözü özünə tabe etdirmək və bu meydanda xüsusi təşəbbüs göstərib onun rəngarəng nümunələrini yaratmaq, onun da daxilində sözün hikmətini göstərmək, bu hər sənətkara nəsib olmur.

Forma axtarışları Aşıq Ələsgərin nə qədər böyük sənətkar olduğunu, söz sahibi olduğunu bir daha ortaya qoyur. Dədə Ələsgər bəşəri bir söz zirvəsi, sənət abidəsidir. Ondan ötrü Tanrının yaratdığı əsrarəngiz təbiət, gözəl və gözəllikləri var, bu bir də insanlıq və dünyəvi paklıq var. Onun şeirlərində hər sözün öz çəkisi, öz çataları var.

Aşıq Ələsgərin şeirləri bir tərbiyə məktəbidir. Onlardan hamı qidalanır, hamı öyüd-nəsihət alır. Dədə Ələsgər həqiqətən böyük sənətkardır. Ona görə böyükdür ki, iki min ildən çox yaşı olan ədəbiyyatımızda öz sözünü demiş, heç kəsi təkrar etməmiş, qeyri-adi söz sənəti yaratmışdır.

***Rəyçi: prof. V.Xəlilov***

## İstifadə edilmiş ədəbiyyət

1. Namazov Q. Ozan-aşıq sənətinin tarixi. Bakı: Elm və təhsil, 2013.

2. Aşıq Ələsgər. Əsərləri. Bakı: Şərq-Qərb, 2004.

3. M. Qasımlı. Aşıq sənəti. Bakı: Ozan, 1996.

4. E. İsmayıl. Ulu Göyçə. Bakı: Yazıçı, 1990.

**Н.Мирзоева**

**Сбережем духовно-национальные ценности**

**Резюме**

В статье говорится о представителе ашугского искусства Ашуге Алескере. Об искусстве, которое при поддержке и заботе нашего государства вошло в список нематериального культурного наследия ЮНЕСКО в 2009 году.

Рассказывается об организации внеклассных мероприятий, для воспитания у молодого поколения наших национально-духовных ценностей. Данные мероприятия, проводятся с целью обогащения духовного мира молодого поколения

**N.Mirzoyeva**

**Let's safeguard our moral values**

**Summary**

With the support and care of the government in 2009, there was given the information about the ashig art and its great representative Ashig Alasgar which was added to the UNESCO's intangible cultural heritage. It deals with the role of enriching, young generation's inner world through the organizing extracurricular events for instilling national-moral values to the students.

# УЧИТЕЛЬ, ПЕДАГОГ, УЧЕНЫЙ …

Выдающемуся российскому ученому и педагогу, доктору педагогических наук, профессору, действительному члену Российской академии образования Николаю Дмитриевичу Никандрову – 80 лет. Его биография, отражающая славный жизненный путь ученого, организатора – это блестящий пример многолетнего добросовестного служения науке и образованию, интересам российского государства, а также стран СНГ. Научный мир знает его как профессионала высшей квалификации, посвятившего большую часть своей творческой жизни сохранению и процветанию российской науки.

Начав свой трудовой путь учителем одной из школ Василеостровского района Ленинграда, Николай Дмитриевич с августа 1961-го года работает в системе высшего образования, преподает иностранные языки в ряде вузов. По ходу работы постепенно выкристаллизовывается направленность исследовательского поиска молодого ученого. А владение многими иностранными языками предопределило сферу научных интересов Н.Д.Никандрова: сравнительно-педагогические исследования.

В 1960-е годы модернизация советского высшего образования остро нуждалась в исследованиях, анализирующих подходы к образовательному процессу в системе высшего образования в передовых странах Западной Европы и США. Начав исследования по актуальной, но относительно узкой проблематике программированного обучения в педагогике капиталистических стран и защитив на эту тему кандидатскую диссертацию, Н.Д.Никандров вскоре смело расширяет спектр и объем исследований.



В центре внимания ученого, заведующего кафедрой ЛГПИ им. А.И.Герцена, оказываются вопросы теории обучения в педагогике зарубежной высшей школы. Итогом многолетнего напряженного научного поиска стала защита в 1973 г. докторской диссертации на тему: «Проблемы буржуазной дидактики высшей школы» и последующая за этим пуб-

ликация фундаментальной монографии «Современная высшая школа капиталистических стран». В книге впервые в отечественной компаративистике были охарактеризованы такие вопросы, как сравнительный анализ систем высшего образования в современных странах капитализма, актуальные проблемы содержания образования, социального заказа в образовании и его целей, основные дидактические направления педагогики высшей школы, проблемы лекционного преподавания и практические занятия в системе высшего образования, активизация познавательной деятельности студентов при организации самостоятельной работы студентов, использование технических средств обучения.

В противовес доминировавшему в то время в сравнительно-сопоставительных исследованиях сугубо критическому взгляду на развитие «буржуазной педагогики» Н.Д.Никандров, трактуя сравнительную педагогику в единстве ее описательной, объяснительной и конструктивной функций, сосредоточил свое внимание на тех продуктивных идеях, подходах, формах и технологиях, которые могли бы содействовать развитию отечественной педагогики высшей школы и теории обучения в целом, В монографии наряду с высоким методологическим уровнем автора впечатляет и глубокий анализ им многочисленных источников на разных языках, интересное повествование, обоснованность и масштабность выводов и обобщений. В этот же период Н.Д.Никандровым создается комплекс учебных пособий для высшего педагогического образования: «Педагогика высшей школы», «Организация учебно-воспитательного процесса в педагогическом институте», «Введение в специальность» и др.

С 1983 г. Н.Д.Никандров работает в Москве. Сначала он заведует лабораторией методологии педагогики НИИ общей педагогики АПН СССР, а затем занимает ответственную должность заместителя директора института по научной работе. Так началась его научно-исследовательская и административно-организационная деятельность, связанная с Академией педагогических наук СССР (ныне Российской Академией образования).

В 1980-е годы происходит существенное обогащение спектра научной деятельности ученого. Продолжая активно разрабатывать проблемы современной зарубежной педагогики, Н.Д.Никандров большое внимание уделяет проблемам отечественного педагогического образования. Итогом цикла статей стала обстоятельная монография «Педагогическое творчество» (М.: 1990), написанная в соавторстве с талантливым ученым и другом Н.Д.Никандрова Виктором Абрамовичем Кан-Каликом. В работе были выделены и охарактеризованы следующие уровни педагогического творчества: 1) уровень элементарного взаимодействия с классом - педагог использует обратную связь, корректирует свои воздействия по ее результатам, но он действует «по методичке», «по шаблону», по опыту других учителей; 2) уровень оптимизации деятельности на уроке, начиная с его планирования, когда творчество проявляется в умелом выборе и целесообразном сочетании уже известного педагогу содержании, методов и форм обучения; 3) эвристический, когда педагог

использует творческие возможности живого общения с учениками, высший уровень творчества педагога, который характеризуется его полной самостоятельностью, использованием готовых приемов, в которые вкладывается личностное начало, поэтому они соответствуют его творческой индивидуальности, особенностям личности воспитанника, конкретному уровню развития класса.

1990-е годы стали судьбоносными для Н.Д.Никандрова. Он работает на ответственных должностях в Президиуме Российской Академии образования: сначала исполняет обязанности главного ученого секретаря, затем становится вице-президентом Академии, а в октябре 1997 г. Н.Д. Никандрова избирают президентом Российской Академии образования.

С годами сфера научных интересов Н.Д.Никандрова значительно расширяется и обогащается. Как искренний патриот России Н.Д.Никандров обращается к наиболее сложным проблемам трансформирующегося общества, связанным с социализацией и воспитанием молодежи. В процессе научного поиска Николай Дмитриевич подвергает системному изучению такие важнейшие категории как цели, традиции и ценности российского образования и воспитания, национальные и общечеловеческие принципы образования.

Разрабатывая в ходе своих многолетних теоретических и опытно-экспериментальных исследований проблему социокультурных оснований интегрирования образовательного пространства, Н.Д.Никандров раскрыл комплекс базовых ценностей российского общества, определив необходимые условия и возможности социализации растущих людей. В данной связи ученым-патриотом внесен существенный вклад в создание теоретической модели российского образовательного пространства, в определение стратегии его сохранения и развития на фундаменте исконных ценностей и интересов многочисленных российских народов.

На основе междисциплинарного синтеза философских, социологических, политологических, психологических и педагогических подходов ученый создает цикл фундаментальных трудов, в совокупности представляющих собой философию педагогики российской цивилизации. В этих трудах, открывающих новые перспективные направления развития психолого - педагогической науки и представляющих серьезный вклад в теорию и практику современного российского образования, интегрированное образовательное пространство рассмотрено как особое социокультурное явление, решающим фактором структурирования которого выступает взаимодействие семьи, церкви, общества и государства, целенаправленно осуществляющих процесс воспитания. Наряду с крупными теоретическими исследованиями в начале XXI века Н.Д.Никандров создал комплекс учебников для высшего педагогического образования: «Основы общей педагогики» (2006), «История педагогики» (2007, гл. редактор).

Не осталась в тени и программа компаративистских исследований. Н.Д.Никандров стал соредактором «Международной энциклопедии образования» («The International encyclopedia of educati-

on», V. 1—12, Oxf., 1994), автором ряда публикаций по методологии сравнительно-сопоставительных исследований.

Н.Д.Никандров является автором более чем 500 научных работ (монографий, учебников, статей и др.). В последние годы он особое внимание уделяет духовно-нравственным проблемам педагогики, гражданскому воспитанию, становлению и развитию нравственно здорового общества. В работах Н.Д.Никандрова глубоко осмыслены проблемы духовно нравственного развития страны, определены его специфика и приоритеты, возможности интеграции и взаимообогащения общечеловеческих, национальных и индивидуально-личностных ценностей.

Под руководством Н.Д.Никандрова в Российской академии образования выполнен комплекс работ, связанных с созданием образовательных стандартов для общеобразовательной школы.

Концептуальные положения научных работ нашли свое отражение в многочисленных выступлениях Н.Д. Никандрова в различных учебных заведениях России, за рубежом, в том числе и в Азербайджане. Свободное владение несколькими иностранными языками позволяет ему достойно пропагандировать достижения российского образования и оперативно использовать в своих исследованиях передовые достижения зарубежной педагогики.

Н.Д. Никандров ведет активную общественно-государственную работу. Он является членом Научно-экспертного совета при Председателе Совета Федерации Федерального собрания Российской Федерации, членом Президиума Федерального совета по учебникам, членом Межведомственной комиссии по научно-инновационной политике Минобранауки РФ, председателем одной из комиссий Межведомственного совета по рассмотрению вопросов присуждения премий Правительства РФ в области образования, членом ВАК и Президиума ВАК Минобрнауки РФ, членом Высшей аттестационной комиссии Федеральной службы по надзору в сфере образования и науки, членом Комиссии РФ по делам ЮНЕСКО, председателем Совета по защите докторских и кандидатских диссертаций по педагогическим наукам в Московском государственном педагогическом университете, членом редколлегий ряда российских и зарубежных журналов.

Н.Д.Никандров представляет собой успешное сочетание талантливого ученого, заслуженно получившего признание широкой научной общественности выдающегося педагога и организатора науки. Научно-педагогические работы академика Н.Д.Никандрова определили развитие многих новых актуальных направлений педагогической науки. Результаты проведенных им исследований являющиеся ярчайшим примером сочетания глубоко разработанной теории с выходом в практику, широко известны специалистам, как в России, так и за рубежом.

За свою многолетнюю плодотворную научную и педагогическую деятельность, вклад в подготовку специалистов нового поколения Н.Д.Никандров был награжден орденами и медалями, государственными премиями, премиями Российской академии образования и ряда зарубежных академий и университетов. На каком бы посту он не находился, трудясь с полной

отдачей, Н.Д.Никандров отдает свои профессиональные знания, накопленный опыт этой большой и важной работе, результаты которой имеют огромное значение для укрепления и развития педагогической науки. Научная эрудиция и творческая активность способствуют успешности его многолетней широкой научно организационной деятельности. Благодаря таланту ученого и педагога, высоким организаторским способностям, им были подготовлены десятки молодых ученых и специалистов.

Глубокие знания, профессионализм, активная жизненная позиция, самоотверженное служение науке, высокая мера ответственности, мудрость и широта мышления снискали Н.Д.Никандрову высокий авторитет, уважение и широкую известность среди многочисленных коллег и друзей.

Российская академия образования, которую многие годы возглавлял Н.Д.Никандров, в настоящее время является мощным фактором развития научного знания в России, объединяя в своих рядах выдающихся ученых страны. Приоритетные научные направления, разрабатываемые под руководством Н.Д.Никандрова, позволяют считать Академию важным центром развития инновационных образовательных технологий. Одной из многочисленных заслуг является понимание того, что наука и знание в целом являются органичной частью общечеловеческой культуры, отстаивание основополагающих ценностей культурного развития и утверждение важной роли ученых в этом процессе. Он известен как человек высоких душевных качеств, для которого стремление достичь лучшего научного результата, верность моральным принципам и принятым на себя обязательствам являются главными составляющими его профессиональной деятельности на всем протяжении его жизненного пути. Богатый и насыщенный событиями жизненный путь является ярким примером целеустремленности и трудолюбия, профессиональная научная деятельность, широта взглядов и компетентность, внимательное и чуткое отношение к людям вызывают чувство глубокого уважения и восхищения.

В Азербайджане с именем выдающегося ученого педагога современности, академика Николая Дмитриевича Никандрова связано укрепление научных контактов между учеными двух стран, что придало новый импульс научному сотрудничеству между нашими государствами.

Ученые Азербайджана выражают искреннее убеждение в том, что авторитет мудрого и дальновидного учителя, педагога, ученого академика Н.Д.Никандрова будет и впредь способствовать развитию и укреплению конструктивного научного партнерства и творческого сотрудничества между нашими странами.

**Гусейн Ахмедов,**
**доктор педагогических наук,**
**профессор**
**член-корреспондент АПН СССР,**
**ин. чл. РАО**

**Мисир Марданов,**
**доктор физико-математических наук,**
**профессор**
**член-корреспондент НАН**
**Азербайджана, ин. чл. РАО**

**Гумеир Ахмедов,**
**доктор педагогических наук,**
**действительный член АПСН, ин. член**
**РАО**

***Arxivimizdən***

# ALİMİN YOLU

Professor Mərdan Muradxanov haqqında yazmaq həm asan, həm də çətindir: asandır ona görə ki, adi müəllimlikdən pedaqogika sahəsində görkəmli bir alim dərəcəsinədək yüksələn bu adamın həyat və inkişaf yolu gözümüzün qabağında keçmişdir; çətindir ona görə ki, onun pedaqoji-elmi fəaliyyət dairəsi çox geniş və məhsuldar, dərin və rəngarəngdi, bu fəaliyyətin bütün cəhətlərini həm də təfərrüatı ilə bir jurnal məqaləsində əhatə etmək mümkün deyildir.

Salyan şəhərində müəllim ailəsində anadan olmuş, Qori müəllimlər seminariyasını qurtaran atasından müəllimlik estafetini qəbul etmiş Mərdan Əsədulla oğlu Muradxanov müəllimlik bayrağını həmişə uca tutmuşdur.

Gənc Mərdan tarixi bir dövrdə məktəb və maarif sahəsində fəaliyyətə başlamışdır. Sabit dərsliklər, proqramlar yox idi. Məktəb binaları, ixtisaslı müəllim kadrları çatışmırdı. Əmək və politexnik məktəb yaradılmasına, mahiyyət etibarı ilə məktəbin yenidən qurulmasına yönəldilmiş göstərişlərin həyata keçirilməsi üçün çoc böyük səy göstərmək lazım idi. M.Muradxanov da böyüyüb artmaqda olan gənc müəllimlər ordusunun sıralarında bu mühüm vəzifələrin həyata keçirilməsinə fəali bir surətdə can atırdı. O, 1927-ci ildə Bakı müəllimlər seminariyasını qurtardıqdan sonra Salyanda, şəhər 3 nömrəli məktəbdə müəllimlik etmiş, 1932-ci ildə Ali Pedaqoji İnstitutu bitirmiş, yenə maarif sahəsinə qayıtmışdır. Lakin dağ selini xatırladan onun həyatı nəhri əzəldən öz məcrasına sığışmırdı. Məktəb və maarif sahəsində nə isə daha səmərəli işlər görmək, öz bilik və coşğun qüvvəsini tamamilə bu işə həsr etmək istəyirdi. Bunun üçün, hər şeydən əvvəl, elmi zirvələrə yiyələnmək tələb olunurdu. Bəlkə elə buna görə də o, adi təhsilini başa vurduqdan və bir müddət kütləvi məktəblərdə işlədikdən sonra aspiranturaya daxil oldu. O, aspiranturanı bitirmək üçün 1939-cu ildə Kertsen adına Leninqrad Pedaqogika İnstitutuna getmiş və orada məşhur alim E.Y.Qolasntın və Ş.İ.Qanelivin rəhbərliyi altında aspirantura hazırlığı keçmişdir. M.Muradxanov hələ aspirantura dövründən əvvəl ciddi bir tədqiqatçı, pedaqoji-ədəbi materialı və məktəb təcrübəsini təhlil edib ümumiləşdirmək və elmi nəticələr çıxarmaq bacarığı olduğunu göstərmişdi.

Xalqımızın dünya şöhrəti qazanmış böyük şair və mütəfəkkiri Nizaminin ölməz əsərlərindəki zəngin pedaqoji xəzinəni o, duyub hiss etmişdi. 1941-ci ilin iyun ayında gənc və ehtiraslı tədqiqatçının "Nizaminin pedaqoji görüşləri" mövzusunda yazdığı namizədlik dissertasiya əsəri artıq hazır idi. Lakin məşhur şərqşünas K.İ.Bertele, B.B.Komarovski, A.O.Makovelski və digər görkəmli sovet alimləri tərəfindən yüksək qiymətləndirilən bu dissertasiya əsərini həmin il müdafiə etmək Mərdan Muradxanova qismət olmadı... 1941-ci ildə tarixin ən müthiş müharibəsi başlandı və M.Muradxanov öz ilk böyük elmi-tədqiqat əsərini müdafiə etmək əvəzinə, müharibənin ikinci günü ələ silah alıb vətənimizi müdafiə etməyə getdi.

1943-cü il gəlib çatmışdı. Vətən torpağını faşist işğalçılarından azad etmək uğrunda ağır, lakin müzəffər yürüş davam edirdi. Belə bir şəraitdə, 1943-cü ilin axırlarında M.Muradxanov Azərbaycan Dövlət Universitetinin dəvəti ilə bir neçə günlüyə Bakıya gəldi və dekabrın 31-də universitetin böyük elmi şurasında əsgər paltarında "Nizaminin

pedaqoji görüşləri” mövzusunda dissertasiya əsərini müdafiə etdi. Starşina M.Muradxanov 1944-cü ili pedaqoji elmlər namizədi kimi qarşıladı.

Müəllifin “Nizaminin pedaqoji görüşləri” əsəri Azərbaycanda pedaqoji fikrin tədqiqi sahəsində yaradılan ən qiymətli əsərlərdən biri kimi məşhurdur. Respublikamızda tarixi-pedaqoji fikrin tədqiqinə həsr edilmiş bu əsərində M.Muradxanov Şərqin ən böyük dühalarından biri olan Nizaminin əqli təhsil, əxlaqi tərbiyə, xüsusilə əməksevərlik və s. sahəsindəki baxışlarını ilk dəfə olaraq təhlil etmişdir. Bu əsərin böyük elmi əhəmiyyəti ondadır ki, burada Nizaminin pedaqoji ideyaları, onun ümumi fəlsəfi və etik konsepsiyası orta əsr Şərq pedaqoji fikrinin inkişafı ilə əlaqədar olaraq işıqlandırılmışdır. M.Muradxanov Nizaminin zəngin pedaqoji irsindən bir çox fikirləri onun müasirləri, o cümlədən İranın XI əsr mütəfəkkiri Keykavusun, XII əsr şairi Sədi Şirazinin fikri ilə müqayisə edərək Azərbaycan mütəfəkkiri ideyalarının üstünlüyünü, demokratikliyini sübut etmişdir.

Məktəbin, təlim-tərbiyə sisteminin, pedaqogikanın ümumi inkişaf istiqaməti müvafiq proqram sənədlərində müəyyən edilmişdir. Lakin mahiyyət etibarı ilə tamamilə yeni olan sovet pedaqogikasını yaratmaq başlıca olaraq onun banilərindən biri olan A.S.Makarenkonun üzərinə düşdü. A.S.Makarenko öz pedaqoji kollektivi ilə 1920-1925-ci illərdə Poltava yaxınlığında M.Qorki adına uşaq koloniyasında orijinal təcrübəsi ilə sovet pedaqogikasının yaranmasında yaxından iştirak edir, yeni tərbiyə üsullarını sınaqdan keçirirdi. A.S.Makarenkonun fəaliyyəti, böyük proletar yazıçısı M.Qorkinin təbirincə desək, dünya miqyasında əhəmiyyətə malik çox böyük iş idi. Pedaqoqlarımızın bir çox nəsilləri Makarenkonun əsərlərindən, onun gözəl əməllərindən pedaqoji qida almış və almaqdadır.

İftixarla demək olar ki, Azərbaycanda Makarenkonun ən qızğın təbliğatçısı M.Muradxanov olmuşdur. O, Makarenkonun əsərlərinin tərcümə və redaktə edilməsində, onların şərh olunmasında bilavasitə yaxından iştirak etmişdir. A.S.Makarenko irsinin öyrənilməsi və yayılmasında respublikamız bir də ona görə fərqlənir ki, professor M.Muradxanov Makarenkonun zəngin irsinə aid böyük və dərin monoqrafik tədqiqat əsəri yazılmışdır. Uzun illər boyu aparılan ardıcıl tədqiqatın nəticəsi olan “A.S.Makarenkonun pedaqoji irsi və ondan Azərbaycanda istifadə edilməsi təcrübələri”ndə müəllif bu böyük pedaqoqun təlim-tərbiyə sahəsində zəngin təcrübə və fikirlərinin məhz hansı tarixi-ictimai şəraitdə, necə təşəkkül tapdığını və təkmilləşdiyini əsaslandıraraq 30-cu illərdə onun yeni pedaqoji problemləri necə həll etdiyini, işə yaradıcı münasibətinin necə gözəl səmərə verdiyini əyani surətdə nümayiş etdirmişdir. M.Muradxanov yeni pedaqogikanın metodoloji əsasları haqqında, tərbiyənin məqsədi, əxlaq tərbiyəsinin mahiyyəti, prinsip və üsulları, uşaq kollektivinin təşkili və tərbiyəsi; əmək tərbiyəsi və uşaq oyunları haqqında Anton Semyonoviçin zəngin təcrübə və fikirlərindən geniş bəhs edib faktlara əsaslanaraq belə bir nəticəyə gəlir ki, “A.S.Makarenkonun böyük müvəffəqiyyət qazanması ancaq pedaqoq olması ilə deyil, başlıca olaraq onun bu nəzəriyyəni yaradıcılıqla pedaqoji işə tətbiq etməsi ilə izah edilir”. M.Muradxanov Makarenkonun pedaqoji irsinə vaxtı ilə müvəffəqiyyətlə tətbiq olunub, indi tarixin malı olan bir təcrübə kimi baxmamış, onun iş təcrübəsi və fikirlərinin, əsas etibarilə, bu gün üçün də yaradığına dərin inam bəsləmişdir. Bunun üçündür ki, M.Muradxanov “sabahın pedaqogikasını” yaratmağa çalışan bu böyük pedaqoqun zəngin irsinin Azərbaycan məktəblərində necə yaradıcılıqla tətbiq edildiyini respubli-

kamızın məktəblərinin həyatından gətirilmiş zəngin material əsasında əsaslandırıb şərh etmişdir.

Professor M.Muradxanovun makarenkoşünaslığa çox mühüm bir hədiyyə olan bu əsəri nəinki respublikamızda, habelə Ümumittifaq miqyasında yüksək qiymətləndirilmişdir. Həmin əsərin rus pedaqoji ictimaiyyəti tərəfindən hərarətlə qarşılanması, yüksək qiymətləndirilməsi, hətta tərcümə edilib ondan digər respublikalarda istifadə edilmək üçün məsləhət görülməsi çox fərəhli haldır.

M.Muradxanov pedaqoji elmi sahəsində ensiklopedik xarakter daşıyan əsərləri, orijinal fikirləri ilə Azərbaycanda pedaqoji elmin, maarif və mədəniyyətin inkişafına böyük xidmət göstərmiş və göstərir. Onun elmi tədqiqatının əhatə dairəsi genişdir. M.Muradxanovun pedaqoji fikir və məktəb tarixi, əmək və politexnik təlim, ailə tərbiyəsi, təlim nəzəriyyəsi və s. məsələlər haqqında yaratdığı sanballı əsərlərin adlarını belə, bir məqalədə sadalamaq imkan xaricindədir. 40 ilə yaxın məhsuldar elmi-tədqiqat işi ilə məşğul olan M.Muradxanovun əsərləri haqqında danışarkən bunu demək olar ki, 1931-ci ildən indiyə kimi onun 468 çap vərəqi həcmində 38 kitabı, 134 jurnal və 255 qəzet məqaləsi dərc olunmuşdur. Onun Nizami və Makarenko irsinə həsr edilmiş yuxarıda adları çəkilən, habelə "Məktəblilərin əxlaq tərbiyəsinin prinsip və üsulları", "Məktəbdə şüurlu intizam tərbiyəsi", "Ailə və məktəb" və s. kimi sanballı əsərləri pedaqoji elminin xəzinəsini zənginləşdirmişdir.

M.Muradxanov Azərbaycan dilində pedaqoji institutlar üçün pedaqogikadan orijinal dərslik yaratmaq işində də yaxından iştirak etmişdir. O, 1958 və 1959-cu illərdə 25 çap vərəqi həcmində tərtib olunmuş "Pedaqogika" dərsliyinin əsas müəlliflərindən biri, həm də I hissənin redaktoru olmuşdur. Onun rəhbərliyi və redaktorluğu ilə 1964-cü ildə nəşr olunmuş 27 çap vərəqi həcmində "Pedaqogika" dərsliyinin 8 fəslini (beşdə iki hissəsində) M.Muradxanov yazmışdır.

Azərbaycan dilində pedaqogika üzrə terminologiyanın hazırlanmasında professor M.Muradxanovun xidməti də xüsusilə qeyd edilməyə layiqdir. O, professor Ə.Seyidovla birlikdə Azərbaycan SSR Elmlər Akademiyası tərəfindən təsdiq və nəşr olunmuş pedaqogika və pedaqogika tarixi terminoloji lüğətlərinin tərtibatçısı və redaktorudur.

M.Muradxanovun qələmindən çıxan, təlim-tərbiyənin demək olar ki, bütün sahələrinə dərindən nüfuz edən hər bir əsərində, habelə mühazirə, məruzə və çıxışlarında dərin bir müasirlik, mübarizlik hiss olunur. Onun elmi-pedaqoji tədqiqatında tərbiyəvi məsələlər, xüsusilə böyük yer tutur. Müəllif dəyərli tədqiqatında və eləcə də başqa əsərlərində Azərbaycan məktəblərinin qabaqcıl təcrübəsini ümumiləşdirmiş və onu bütün Azərbaycan müəllimlərinin malı etməyə çalışmışdır. Son üç il ərzində M.Muradxanovun danvranış (intizam) qiymətlərinin orijinal meyarlarını və onların verilməsinin səmərəli qaydalarını müəyyənləşdirmək sahəsində respublika məktəblərində geniş eksperimental iş aparması buna canlı sübutdur. Bu meyarlar hazırda məktəbdə tətbiq olunan meyarlardan konkretliyi, verilmə qaydasına görə isə qiymətlərin daha tez-tez (hər həftə) verilməsi və sinif şagird kollektivinə istinadən çıxarılması ilə fərqlənir. Bu meyarlar və qaydalar bir çox məktəblərimizdə artıq tətbiq edilməkdədir.

Professor M.Muradxanov respublikamızda ailə tərbiyəsi nəzəriyyəsinin görkəmli mütəxəssisi kimi tanınır. O, bu sahəyə 12 kitab və kitabça həsr etmişdir. Bunlar içərisində "Ailə və məktəb", "Ailədə uşaqların intizam tərbiyəsi", "Ailədə uşaqların

əmək tərbiyəsi”, “Ailə mühüm tərbiyə ocağıdır” və b. dövri mətbuatımızda yüksək qiymət almış, müəllim və valideynlərə yaxından kömək göstərmişdir. O, Pedaqoji Elmlər Akademiyasının rusca nəşr etdiyi “Valideynlər üçün lüğət”in müəlliflərindəndir.

Belə çoxcəhətli və faydalı elmi fəaliyyətinə görə hələ 1961-ci ildə ona pedaqogika üzrə professor elmi adı verilmişdir.

Geniş, dərin, zəngin pedaqoji düşüncələr sahibi olan, yorulmaq bilmədən elmi-pedaqoji sahədə fəaliyyət göstərən və eyni zamanda yeni-yeni müəllim nəslinə gözəl insani hisslər aşılayan, onları mahir pedaqoq kimi böyüdüb yetişdirməyə çalışan Mərdan müəllim bu qədər enerjini hardan alır?

Bizcə bu, hər şeydən əvvəl, professor M.Muradxanovun kütləvi məktəb və müəllimlərimizin pedaqoji ehtiyac və tələblərini, habelə pedaqoji elmin bütün irəliləyiş və yeniliklərinin vaxtında duymasından, nəzəri məsələləri müəllimin gündəlik həyatı, məktəb praktikası ilə üzvi surətdə, bacarıq və yaradıcılıqla əlaqələndirməsindən irəli gəlir.

M.Muradxanov yenilik sorağı, yaradıcılıq əzmi ilə yaşayan alimdir. Lakin o, yeniliyin ünvanını öyrənmək üçün oturub gözləmir, yaxud yenilikçi müəllimlərin fəaliyyətini yalnız mətbuat səhifələrindən izləməklə kifayətlənmir. O, tez-tez kütləvi məktəblərə, internat-məktəblərə gedib, qabaqcıl təcrübəni yerindəcə öyrənir; bir çox yeni qaydaların tətbiqini təşkil edərək təcrübədə sınaqdan keçirir və sonradan ümumiləşdirib yayır.

Müəllimlərin elmi-metodik fəaliyyətinə istiqamət vermək, qabaqcıl təcrübəni öyrənib respublika məktəblərində yaymaq məqsədi ilə öz kafedrasının müəllimləri, yaxın əmək dostları İ.Vəlixanlı, S.Axundov və başqaları ilə birlikdə kütləvi və pedaqoji məktəblərin müəllimləri və maarif şöbəsi işçiləri ilə bilavasitə yaxından əlaqə saxlayan professor M.Muradxanov məktəblərə gedir, mühazirələr oxuyur, məruzələr edir. Bu görüşlər zamanı əxlaq tərbiyəsinin üsulları, biliyin qiymətləndirilməsi, əxlaq qiymətlərinin verilməsi, məktəbin ailə ilə əlaqəsi və müəllimləri maraqlandıran digər aktual məsələlər üzrə onlara kömək göstərir. Mərdəkandakı 3 nömrəli internat-məktəbdə, Neftçala internat-məktəbində, Salyan şəhərindəki 3 nömrəli məktəbdə, habelə Əli-Bayramlı, İsmayıllı, Göyçay və başqa yerlərdə müəllimlər və maarif işçiləri ilə keçirilən yaradıcılıq görüşləri bu cəhətdən çox faydalı olmuşdur.

M.Muradxanov rayonlara, məktəblərə gedərkən gənc müəllimlər, xüsusilə öz fakültəsinin məzunları ilə görüşməyi çox sevir, onların pedaqoji ehtiyac və tələblərini öyrənməyə, bunları ödəməyə çalışır, qarşıya çıxan çətinlikləri aradan qaldırmaq üçün lazımi məsləhətlər verir. Maraqlıdır ki, hər hansı bir məruzədən sonra müəllimlər adətən professoru üzük qaşı kimi əhatə edir və ən müxtəlif məsələlər üzrə onunla saatlarla söhbət etməkdən, sual verib dolğun və əhatəli cavablar almaqdan doymurlar.

- Professor M.Muradxanov məktəbin, təlim-tərbiyə işinin canlanması, keyfiyyətinin yüksəldilməsində çox böyük rol oynayan məktəb inspektorlarının işi ilə xüsusilə maraqlanır, - deyə onun həmkarlarından biri xatırlayır. – Rayonlardan birində belə növbəti görüş məktəb inspektorlarının işinə həsr edilmişdi. “Nəyi yoxlayırsınız? Necə yoxlayırsınız?” – deyə Mərdan müəllim qabaqcıllardan sayılan bir inspektordan soruşdu. Həmin inspektor 40 illik müəllim stajına malik bir müəllimin işindən danışıb təəssüflə qeyd etdi ki, əvvəllər məşhur olan bu müəllim artıq qocalmışdır. İnspektorun söhbətindən belə çıxdı ki, yenilik naminə həmin müəllimin işində heç bir cəhət yoxdur. O, hətta dərsdə əks

əlaqə, problemli situasiya yaratmaq kimi müasir dərsin ən mühüm elementlərinin adını da bilmir. Qocaman müəllimin işinə inspektorun belə yanaşması professorun xoşuna gəlmədi. Lakin o, çox ehmallı, özünəməxsus təmkinlə inspektora narazılığını bildirib dedi ki, qocaman müəllimin işinə belə yanaşmaq, onun işində yalnız nöqsan axtarmaq düzgün deyil. Ola bilsin ki, həmin müəllim müasir dərsin mərhələlərini düzgün adlandıra bilməsin. Lakin o, bu mərhələləri ustalıqla əlaqələndirir. Belələrini dərhal qocalmış, köhnəlmiş deyə qələmə vermək olmaz. Müəllimin fəaliyyətində hər şeydən əvvəl müsbət cəhətləri axtarmaq, müşahidə etmək, nə qədər cüzi olsa da, qabaqcıl təcrübəni artırıb inkişaf etdirmək, adamları, o cümlədən müəllimlərimizi müsbət təcrübə əsasında tərbiyələndirmək lazımdır.

Mərdan müəllimin özünün qısa inspektorluq fəaliyyətindən bir əhvalatı xatırlatmaq burada yerində olardı.

...1930-cu il 20 yaşlı Mərdan müəllim APİ-nin pedaqoji fakültəsinin (o zaman həmin fakültə təşkilat-inspektorluq fakültəsi adlanırdı) I kursunu bitirmişdi. Maarif Nazirliyi həmin fakültənin bir neçə başqa tələbəsi kimi M.Muradxanovu da səfərbərliyə alıb cəmi bir il bundan əvvəl dərs dediyi Salyan məktəblərini yoxlamağa göndərmişdi. O, Xıllı qəsəbəsindəki orta məktəbin işini yoxlayıb çox narazı halda qayıtdı və tutarlı bir akt yazıb maarif şöbəsinə verdi. Onun yoxlama nəticələrinə əsasən Gülhüseyn müəllimi direktor vəzifəsindən azad etdilər. Bundan iki il keçdi. M.Muradxanov institutu qurtarıb Sabirabad rayonuna məktəb inspektoru təyin edildi. O, böyük həvəslə getdi, lakin çox soyuq qarşılandı. Vaxtı ilə M.Muradxanovun təkidi ilə direktorluqdan çıxarılan Gülhüseyn müəllim indi Sabirabad rayon xalq maarif şöbəsinin müdiri vəzifəsində işləyirdi. Rayon müəllimlərinin ilk zamanlar M.Muradxanovu təəccüblə qarşılamasının başqa səbəbi də vardı. Mərdan müəllim hələ tələbə ikən "Müəllimə kömək" jurnalının məsul katibi Hüseyn Əfəndiyevlə birlikdə III sinif üçün "Gənc kolxozçu" adlı ana dili dərsliyi yazmışdı. Sabirabadda da həmin dərslik üzrə məşğələ keçilirdi. Müəllimlər haradansa "Ağzından süd iyi gələn" bu inspektorun həmin dərslik müəllifi olduğunu bilmiş və yəqin hər hansı bir təqsir üzündən onun rayona göndərilməsini müəyyən cəza tədbiri olduğunu zənn etmişdilər. M.Muradxanov Sabirabadda müəllimlər konfransında iştirak və çıxış etdi. Sonra da məktəblərə inspektor yoxlamalarına çıxdı. Müəllimlərlə ünsiyyət yaradıb onların işlərini yoxladı. Yoxlamaların nəticəsi haqqında rayon xalq maarif şöbəsində məruzə etdi. Bir müddətdən sonra M.Muradxanov maarif komissarı M.Cuvarlinskidən Bakıya işə keçməsi, irəli çəkilməsi haqqında göstəriş aldı. Maarif şöbəsinin müdiri isə komissarın sərəncamına qarşı çıxıb ona belə bir qəti teleqram vurdu: "Mərdan müəllimi buraxa bilmərəm. Qoy o bizimlə işləsin". Buna səbəb Gülhüseyn müəllimin öz keçmiş "düşməni" M.Muradxanovu (əlbəttə, sabirabad müəllimlərinin ümumi hüsn-rəğbətini də nəzərə alaraq) ən qısa müddətdə daha yaxından tanıması və Mərdan müəllimin məktəb işini yaxşı bilən, prinsipial, ədalətli, işgüzar və yalnız ümumi işin xeyrinə çalışan bir adam olmasını bir daha görüb dərk etməsi və bütün bunlara görə də ondan bərk yapışması idi.

Professor M.Muradxanov qaynar elmi-pedaqoji fəaliyyətlə yanaşı elmi kadrların hazırlanmasında da fəal iştirak edir. O, indiyə qədər 12-dən artıq elmlər namizədi yetişdirmiş, öz elmi məsləhətləri, rəy və çıxarışları ilə, habelə rəsmi opponent kimi 30-dan artıq elmlər namizədi yetişməsinə yaxından kömək etmişdir. Hazırda dissertanta rəhbərlik edir.

Özünə qarşı çox ciddi və tələbkar olan Mərdan müəllim öz yetişdirmələrinə, aspirant və dissertantlarına da həmişə yüksək tələbkarlıq və hörmət hissi ilə yanaşır. Mərdan müəllimin yetişdirdiyi elmlər namizədlərinin demək olar ki, hamısı onun tələbkarlığından "həzər" çəkir. Lakin inki-

şafında Mərdan müəllimin iştirak etdiyi alimlər “bu vəziyyət” və “məşəqqətlərin” dadını sonradan hiss edirlər.

O, adətən, öz aspirantlarının, dissertantlarının əsərlərini və eləcə də ona rəy üçün göndərilən məqalələri 2-3 dəfə yenidən üzərində işləmək üçün geri qaytarır və öz tələbləri yerinə yetirilməyincə müsbət rəy vermir. Lakin professor Muradxanov ancaq tələb vermir, həm də bu tələbləri necə yerinə yetirmək üçün göstərişlər verir. Onun qeydləri müəllifə əsər üzərində daha səmərəli işləməkdə yaxından kömək edir.

M.Muradxanov təkcə başqalarının əsərlərinə yox, öz əsərlərinə də çox tələbkarlıqla yanaşır. Mərdan müəllimin yetirmələri – hazırda dosent kimi ali məktəbdə çalışan bir çox alimlər deyirlər ki, biz bir məqalə yazanda ona Muradxanovun tələbkar gözü ilə dönə-dönə baxır və öz əsərimiz üzərində əsaslı işləmədən mətbuata vermirik.

İşgüzar alim, tələbkar müəllim olan professor M.Muradxanov həm də fəal ictimaiyyətçidir. O, respublikanın pedaqoji həyatında yaxından iştirak etmiş və etməkdədir. 24 ildən artıqdır ki, o, arasıkəsilmədən “Azərbaycan məktəbi” jurnalının redaksiya heyətinin üzvüdür. Uzun illər Azərnəşr və Uşaqgəncnəşrin bədii redaksiya şurasının üzvü, “Pioner” jurnalının redaksiya heyəti üzvü olmuşdur. Hazırda o, Azərbaycan SSR Maarif Nazirliyinin tədris-metodika şöbəsi ibtidai təhsil bölməsinin sədri, Ali və Orta İxtisas Təhsili Nazirliyi tədris-metodika şurası pedaqoji bölməsinin, habelə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun, Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutunun, M.F.Axundov adına Pedaqoji Dillər İnstitutunun elmi şuralarının, APİ-nin tərbiyə işləri üzrə daimi komissiyasının üzvü və “Əsərlərinin” redaksiya heyəti üzvüdür.

Professor M.Muradxanov elmi işçilərin və müəllimlərin respublika, Zaqafqaziya, Ümumittifaq və beynəlxalq miqyasında keçirilən məclislərində, konfranslarında fəal iştirak etmiş, öz dolğun və məzmunlu çıxışları ilə alimlərin, maarif işçilərinin və bütün maarifpərvər ictimaiyyətimizin hörmətini qazanmışdır.

Professor M.Muradxanov 30 ilə yaxındır ki, Azərbaycanın ali məktəblərində arasıkəsilmədən pedaqoji kursdan mühazirə oxuyur. Bu mühazirələr fikirlərin aydınlığı, məntiqi ardıcıllığı, sadə ədəbi dili ilə həyatdan – məktəb və müəllimlərin işindən gətirilən nümunələrin dərin təhlili ilə fərqlənir.

Mərdan müəllim adətən axırıncı mühazirələrindən birini müəllim mövzusuna həsr edir. Professor M.Muradxanov bu mühazirəsini o qədər hərarət, daxili məhəbbət və məntiqi inam hissi ilə oxuyur ki, tələbələr nəinki müəllimini, şərəfli tarixi vəzifəsini bütün aydınlığı ilə hiss və dərk edir, habelə həmişə intizarla gözlədikləri, mühazirələrini hərarət və sevinclə dinlədikləri, bu nəcib insandan ayrılmaq vaxtının çatdığını duyur və sevincdən çox kədərlənirlər. Keçən dərs ilinin axırında son kurs tələbələrinə mühazirə oxuyarkən də məhz belə olmuşdu. Tələbələr auditoriyadan çıxarkən vida - son mühazirəni qızğın müzakirə edirdilər. Onlardan biri yoldaşlarına deyirdi:

Doğurdanmı biz, Mərdan müəllimdən ayrılırıq? Bu, çox çətin işdir. Ancaq bir şeyi başa düşürəm: professor, müəllim haqqında bu səmimi, unudulmaz və hərarətli mühazirəsini və nəcəb kursun əvvəllərində oxumur? Belə olsaydı şəxsən mən pedaqogikanı daha böyük ehtirasla yenidən öyrənməyə başlardım.

**Məmmədəli Əliyev**
**“Azərbaycan məktəbi”, 1970, № 6**

# PEDAQOJİ MƏRİFƏT HAQQINDA

**Professor M.Muradxanov**

Pedaqoji mərifət pedaqoji ədəbiyyatda ən az işlənmiş olan və ayrı-ayrı müəlliflər tərəfindən müxtəlif şəkildə izah edilən pedaqoji məfhumlardandır.

K.D.Uşinski özünün "Pedaqoji antropologiya" əsərinin müqəddiməsində pedaqogikanın sənət olmasını sübuta çalışarkən, bununla əlaqədar olaraq, pedaqoji mərifət məfhumunu aydınlaşdırmağa təşəbbüs etmiş və bu barədə bir sıra maraqlı fikirlər irəli sürmüşdür. K.D.Uşinskinin fikrincə, pedaqoji mərifət, başqalarının ruhuna təsir etmək istəyən hər bir adama (şairə, natiqə, siyasətçiyə) nə dərəcədə lazımdırsa, pedaqoq üçün də o dərəcədə lazımdır. O, pedaqoji mərifəti "ruha təsir etmək" kimi şərh edərək, onun mahiyyət etibarilə psixoloji mərifət demək olduğunu iddia edir. Psixoloji mərifətin nədən ibarət olması sualına isə K.D.Uşinski belə cavab verir: "Psixoloji mərifət insanın özünün keçdiyi müxtəlif pedaqoji aktların az-çox tutqun və yarı tutqun şəkildə toplanmış xatiratı deməkdir. Ruhun öz tarixini bu cür xatırlaması əsasında insan başqasının ruhuna təsir etməyi mümkün hesab edir və onun üçün vaxtı ilə öz üzərində sınaqdan keçirmiş olduğu məhz həmin vasitələri seçir".

Uşinskinin deməsinə görə, uşağa qarşı pedaqoji mərifət pedaqogika və psixologiyanın elmi müddəa və tələblərini yada salıb hərəkət etmək əsasında deyil, "çox sürətlə, ani surətdə özünü göstərir". Belə bir bacarığı isə müəllim ancaq təcrübə əsasında əldə edir. O, əlavə edir ki, "Ruhun öz fəaliyyəti üzərindəki müşahidəsi nə qədər çox olsa, nə qədər inadla və dəqiq aparılsa, insanda psixoloji mərifət bir o qədər çox və yaxşı inkişaf edər və bu mərifət bir o qədər dolğun, dürüst və nizamlı olar".

K.D.Uşinskinin fikrinə görə müəllim pedaqoji mərifəti ifadə etmək üçün, bir tərəfdən, hər uşağın fərdi xüsusiyyətini diqqətlə öyrənib yaxşı bilməli, o biri tərəfdən, pedaqogika və psixologiyadan yaxşı nəzəri hazırlığa malik olmalıdır.

Biz K.D.Uşinskinin pedaqoji mərifət haqqındakı fikirlərində bir sıra səmərəli ideyalar olduğunu qeyd etməliyik. Əvvəla, biz Uşinskinin fikirlərində pedaqoji mərifətin uzun müddətli proses olmayıb, "sürətlə, ani surətdə özünü göstərməsi"nin pedaqoji mərifətdə çox mühüm əlamət olduğunu qəbul etməliyik; pedaqoji mərifət haqqında əsər yazmış bir çox müəlliflər məsələnin məhz bu cəhətini unudurlar. İkincisi, biz Uşinskinin pedaqoji mərifəti düzgün ifadə etmək üçün müəllimin uşağı hərtərəfli bilməsi haqqında fikrini sözsüz qəbul edirik. Nəhayət, bu da düzgündür ki, pedaqoji mərifət təcrübə əsasında qazanılırsa da, bununla bərabər, müəllimin pedaqogika və psixologiya elmi üzrə nəzəri hazırlığı onun şəxsiyyətinin təşəkkülünə kömək etməklə, onda pedaqoji mərifətin təşəkkülündə mühüm rol oynayır.

Pedaqoji ədəbiyyata gəldikdə, bu məsələ birinci növbədə böyük pedaqoqlar N.K.Krupskaya və A.S.Makarenkonun irsini qeyd etməliyik. Pedaqoji mərifətin əsasında,

hər şeydən əvvəl, uşağın şəxsiyyətinə hörmət etmək, onun izzət-nəfsi ilə, insanlıq ləyaqəti ilə hesablaşmaq tələbi durduğunu nəzərə alarıqsa, bu prinsipin müəllimlə şagird arasındakı düzgün münasibətdə nə qədər böyük əhəmiyyəti olduğu aydınlaşar.

A.S.Makarenko pedaqoji mərifət məsələsini özünün uşağa ciddi surətdə fərdi yanaşma tələbi ilə xeyli zənginləşdirmişdir. O, bunu uşaqların və şəraitin olduqca müxtəlifliyi ilə əsaslandırmış və bu əsasda pedaqoqdan hər an müxtəliflikdən sürətlə baş çıxarmağı və düzgün yol tapmağı tələb etmişdir.

Anton Semyonoviçin “Heyrət doğurmaq” priyomu (tərzi) haqqındakı fikirləri də pedaqoji mərifətin mahiyyətini şərh etməyə əsas verir. O, özünün iş təcrübəsində bu priyomu müxtəlif formalarda – bəzən əliəyri uşağa hədsiz etimad göstərməkdə, uşaq işlətdiyi günah üçün şiddətli cəza gözlədiyi halda bəzən ona cəza verməməkdə, bəzən isə kollektivin qəzəbli və yekdil qəti tələbini intizamsız uşaq üzərinə hər tərəfdən “yağdırmağa” və s. ifadə edirdi. “Pedaqoji poema”dan keçmiş cinayətkar gənc Semyon Karabanova bankdan böyük məbləğdə pul almağı etibar etmək və bu pulu alıb gətirəndən sonra ondan saymadan təhvil götürmək epizodunu xatırlayaq: Semyon Karabanov bu hədsiz etimaddan sarsıyaraq Makarenkoya deyir: “Siz məni ələ salırsınız? Ola bilməz ki, siz mənə belə inanasınız. Ola bilməz! Siz bilə-bilə risk edirsiniz, mən bilirəm siz bilə-bilə...”. Həmişə ustalıqla pedaqoji mərifət işlədən Anton Semyonoviç Semyonun pulu gətirərkən bu etimadı necə doğrultmaq istədiyini dinlədikdən sonra, yenə özünü o yerə qoymayaraq deyir: “Sən qəribə adamsan Semyon! Pul həmişə risk tələb edir. Bu qədər pulu koloniyaya risksiz gətirmək olarmı? Amma mənə belə gəlir ki, pulları sən gətirəndə risk daha az olur. Çünki sən cavansan, qüvvətlisən, yaxşı at sürürsən , quldurlardan tez can qurtara bilərsən. Amma məni asanlıqla tuta bilərlər...”. “İndi sən daha pul almağın qaydasını bilirsən, bundan sonra da gedib alacaqsan... Mən bilirəm ki, sən də mənim kimi namuslu bir adamsan. Mən bunu əvvəl də bilirdim. Sən görmürdünmü?” – “Yox, mən elə bilirdim ki, siz bunu bilmirsiniz”, - deyə Semyon cavab verir və yüksək əhvali-ruhiyyə ilə kabinetdən çıxır. Bundan sonra o, tamamilə dəyişir.

Böyük etimada heyrət doğurmanın bir nümunəsini də kommunanın keçmiş məzunu A.N.Şved öz həyat təcrübəsi nümunəsində göstərir. Kommunaya gəlincəyə qədər bir çox uşaq evlərində olub qaçmış A.N.Şved öz təəssüratında nağıl edir ki, hər dəfə bizi yenə qəbul edərkən, uzun-uzadı sorğu-sual edib, bütün pis keçmişimizi – nə vaxt və neçə dəfə oğurluq etdiyimizi, qarətlə necə məşğul olduğumuzu aydınlaşdırır və yazıb qalın qovluqlarda saxlayırdılar. “Səhər məni kommunaya gətirdilər və dərhal Anton Semyonoviçin kabinetinə dəvət etdilər. O, eynəyinin arxasından mənə diqqətlə baxdı və mənim ancaq familiyamı soruşdu... Mən hələ özümə gəlməmişdim ki, mənə geyim verdilər. Bir neçə gün keçmədi ki, mən artıq bütün kommunanı, onun qayda və ənənələrini öyrəndim. Doğrusu mən təəccüb etdim ki, burada o biri uşaq evlərindəki “öyrənmə əməliyyatını” mənim başıma gətirmədilər”. O, sonralar öyrənir ki, Makarenko onun haqqında zəngin məlumata malikdir. Lakin Anton Semyonoviç kolonist və kommunalın pis keçmişi haqqında məlumatı elə məharətlə və incə yollarla toplayırdı ki, uşaq bunu duymur və özünü sıxılmış vəziyyətdə hiss etməyərək, bütövlüyü ilə ona bağlı olur və özünü onun ixtiyarına verirdi. Makarenko, hətta rəhbərlik etdiyi uşaq müəssisələrində müəllim və uşaqlara da kolonist və kommunaların keçmişi ilə maraqlanmağı qadağan etmişdi və bu,

tədricən möhkəm ənənə şəklinə düşmüşdü. Anton Semyonoviç uşağı "keçmişində eşələnməyi" ona qarşı nəzakətsizlik kimi qiymətləndirir, bu fikrini və təcrübəsini M.Qorkiyə yazır. Böyük humanist M.Qorki Makarenkoya cavabında yazır ki, "Sizin kolonistlərə qarşı münasibətdə "nəzakət" haqqında dedikləriniz həm şərtsiz olaraq düzgün və həm də çox gözəldir. Bu, həqiqətən yenidən tərbiyə sistemidir və o, həmişə və xüsusən indi, ancaq belə ola bilər və olmalıdır. Rədd olsun öz çirkinliyi və mənəvi yoxsulluğu ilə birlikdə dünənki gün. Qoy, onu tarixçilər xatırlasınlar, lakin o, uşaqlara lazım deyil, onlar üçün zərərlidir".

Qoy, bu sözləri, intizamsız uşağın keçmiş intizamsızlığını tez-tez xüsusən başqalarının yanında dönə-dönə xatırladan, necə deyərlər, onun "başına çaxan", bəzən uzaq görməyən pedaqoqlar yaxşı yadda saxlasınlar!

Bu priyomun üzərində ona görə ətraflı dayandıq ki, bizə görə uşağa hörmət və tələbkarlıq prinsipinə uyğun qurulmuş olan pedaqoji mərifətin uşağa müsbət təsiri və onun bu təsir sayəsində sürətlə islah olunması halları bir çox vaxt Makarenkonun yuxarıda təsvir etdiyi psixoloji halət əsasında baş verir: uşaq ona göstərilən hörmət və qəti tələbdən "heyrətə gəlir", sarsıyır və bu zaman özünün düzgün olmayan köhnə təsəvvürlərindən azad olub yeni, düzgün yol tutur.

Makarenko tərbiyəçinin – müəllimin uşağa və uşaq kollektivinə ürəyiaçıq, səmimi münasibətini pedaqoji mərifətin mühüm əlaməti hesab edirdi. O yazır: "Haqqında çox şeylər yazılan məşhur pedaqoji takt məhz sizin rəyinizin səmimiliyindən ibarət olmalıdır. Mən heç bir şeyi gizlətməyə, malalamağa çalışmıram, mən həqiqətdə nə düşündüyümü açıq söyləyirəm. Bu ən səmimi, sadə, asan və ən yaxşı nəticə verən üsuldur...".

Son 10-15 ilin pedaqoji ədəbiyyatında da pedaqoji mərifət məsələləri bəzi müəlliflər tərəfindən işlənmişdir. Hələlik bizə bu mövzuda rus dilində yazılmış üç kitabça və bir neçə jurnal məqaləsi, Azərbaycan dilində isə ancaq bir jurnal məqaləsi məlumdur. Bizə bu məqalədə həmin kitabça və məqalələri təhlil etmək niyyətində deyilik. Xüsusən ona görə ki, bu əsərlərin əsas hissəsində pedaqoji mərifət adı altında, sadəcə olaraq, fərdi yanaşma ifadə edilir.

İ.Klebanov "Uşaqların tərbiyəsində pedaqoji mərifət haqqında" kitabçasında pedaqoji mərifətə belə tərif verir: "...Pedaqoji mərifət uşağa yanaşmaq yolunu tapmağı, onun qəlbinə yol tapmağı bacarmaq, onun davranışını müəyyən edilmiş cığıra istiqamətləndirə bilməkdir; mərifət uşağın ağıl və hislərini ələ alıb onlara istənilən məzmun və istiqamət vermək bacarığıdır. Kitabçanın başqa bir yerində o, fikrini izah edərək mərifəti "tərbiyəçinin qarşıya qoyduğu müəyyən məqsədi əldə etməkdən ötrü uşağa fərdi yanaşması" kimi qiymətləndirir və onu özünəməxsus "pedaqoji taktika və strategiya" adlandırır.

T.N.Bondarevskaya "Pedaqoji mərifət" adlı əsərində pedaqoji mərifətin ictimai əsasını insana bəslənən hörmətdə, humanizmdə görür və tərbiyə işində onun özünəməxsus cəhətlərini aydınlaşdırmağa cəhd edir. O, pedaqoji mərifəti müəllimin çox mühüm peşə bacarığı hesab edərək, bunu uşağın subyektiv vəziyyətini müəllimin daxilən yaşayıb dərk etməsi, əsasında, ona edilən təsirə qarşı uşağın necə hərəkət edəcəyini qabaqcadan hiss edərək, ona səmimi surətdə təsir göstərməsi və bu təsir vasitələrində hədd gözləməsi kimi xarakterizə edir.

A.A.Malinanov "Ailə tərbiyəsində pedaqoji mərifət" adlı kitabçasında pedaqoji mərifətdə uşağa, vaxtında lazımi təsir

göstərmək məsələsini xüsusi qeyd edir. Onun fikrincə, pedaqoji mərifət yüksək tələbkarlıqla uşaq ruhunu anlamağın vaxtında lazımi tərbiyəvi təsir tədbiri və formasını tapmaq bacarığı ilə birləşməsini nəzərdə tutur.

V.Straxov “Mərifətin psixoloji əsası haqqında” məqaləsində pedaqoji mərifətin daxili quruluşunda 5 əsas cəhəti qeyd edir: 1. Uşağın şəxsiyyətinə hörmət etmək və ona tələblər vermək; 2. Uşağın psixoloji vəziyyətinə həssaslıq və qayğı göstərmək; 3. Uşağa etimad edib onun işini müntəzəm yoxlamaq; 4. Uşaqlarla münasibətdə təmkinli olmaq; 5. Törənmiş vəziyyətə və məktəblilərin yaş və fərdi psixolojilərinə uyğun olaraq tərbiyədə pedaqoji təsir üsulları və tərzlərindən düzgün istifadə edə bilmək.

Azərbaycan ədəbiyyatında pedaqoji mərifət məsələsi ancaq dosent İ.Vəlixanlının “Azərbaycan məktəbi” jurnalında dərc olunmuş məqaləsində işıqlandırılmışdır. Bu məqalədə müxtəlif pedaqoji mərifət üçün V.Straxovun yuxarıda gətirdiyimiz 5 “əsasını” qeyd edir. Onun gətirdiyi misallarda, bir-ikisi müstəsna edilərsə, ümumiyyətlə, fərdi yanaşmada uşağa hörmət və həssaslıq göstərilməsi xüsusi qeyd edilir. Məqalədə müəllimin pedaqoji mərifət göstərməməsi, qabalığı və hörmətsizliyi mərifətsizlik kimi qeyd edilir (“Azərbaycan məktəbi”, 1966, №10). Bu məqalə Azərbaycan pedaqoji ədəbiyyatında müəllimlərin diqqətini bu mühüm məsələyə ilk dəfə cəlb edən bir məqalə kimi qiymətləndirilməlidir.

Yuxarıda adını çəkdiyimiz müəlliflərin pedaqoji mərifətə verdikləri tərifdən və onun şərhi ilə əlaqədar gətirdikləri fakt və nümunələrdən aydın olur ki, söhbət əsas və hörmətcil münasibət bəsləmək əsasında düzgün tərbiyəvi üsul və tərz seçməkdən gedir. Biz bu əsərlərdə, eləcə də V.Straxovun şərh etdiyi psixoloji əsaslarda uşaq kollektivinin inkişaf səviyyəsi və pedaqoqun üsul və ya tərz tətbiqində anilik məsələlərinin əks olunmadığını görürük. Halbuki iki böyük pedaqoqun – K.D.Uşinskinin və A.S.Makarenkonun fikirlərində bu iki cəhət pedaqoji mərifətdə, fərdi yanaşma və hörmətcilliklə birlikdə əsasdır.

Bəs biz pedaqoji mərifəti necə şərh edirik?

Fikrimizcə, pedaqoji mərifət uşağa fərdi yanaşmağın xüsusi forması olub, uşağa və uşaq kollektivinə həssas münasibət bəsləmək, onlara hörmət və tələbkarlıq prinsipinə əsasən yanaşmağı nəzərdə tutmaqla bərabər, özünəməxsus iki mühüm cəhəti də əhatə edir: bunların birincisi, şəraitin və kollektivin həmin vaxtkı vəziyyətini nəzərə almaq, ikincisi törənmiş çətin pedaqoji vəziyyətdə cəld və düzgün təsir tərzi (priyomu) işlətməkdir. Bunlar olmasa və xüsusən təsir üsulları və ya tərzlərinin tərtibində anilik, sürət və cəldlik olmazsa, o, ali fərdi yanaşmaya çevrilir və öz spesifikliyini itirir. Yuxarıda adını çəkdiyimiz əksər müəlliflər pedaqoji mərifət adı altında dərc etdikləri əsərlərdə məhz belə edirlər, onlar bir çox halda uzun müddətli fərdi yanaşma epizodlarını təsvir edir və bu zaman müəllimin uşağa etimad etməsi, hörmət göstərməsi. Həssaslıqla yanaşmasını əsas tutaraq, bunu pedaqoji mərifət adlandırırlar. Həmin əsasda onların bu haqdakı əsərlərində təsvir etdikləri bir çox nümunələr müəllimin intizamsız uşaqda rəssamlıq, çalğıçılıq, təşkilatçılıq meyilləri olduğunu hiss edib, müvafiq dərnəklərə cəlb etməsi, vəzifəyə irəli çəkməsi, valideyni ilə danışıb vahid xətt müəyyən etməsi və s. tədbirlər pedaqoji mərifət adı altında verilir. Müəlliflər adətən uşağa hörmətlə yanaşan, ona həssaslıq və qayğı göstərən müəllimləri “mərifətli müəllim” adlandırırdılar: “mərifətli müəllim” ifadələri ilə başlayan bu epizodlarda müəllimin uşağa adi fərdi yanaş-

ması göstərilir. Bu ifadə bəlkə də belə bir kontekstdə doğrudur. Çünki "mərifət" terminini həmin müəlliflər "ariflik", "həssaslıq", "qanacaq" mənasında işlədir.

Fikrimizcə, pedaqoji termin və məfhumları belə qarışdırmaq işin xeyrinə deyildir. Uşağın şəxsiyyətinə hörmət göstərmək, ona tələblər vermək, etimad edib ona həssaslıqla yanaşmaq tərbiyə işinin mühüm prinsipləridir və bu, bütün fərdi yanaşma prosesində mütləq gözlənməlidir.

Biz, böyük pedaqoq K.D.Uşinskinin pedaqoji (psixoloji) mərifətdə qeyd etdiyi uşağa "sürətlə, ani surətdə" təsir göstərmək əlamətinə diqqəti bir daha cəlb edir və bunu pedaqoji mərifəti fərdi yanaşmanın başqa tətbiq formalarından ayıran əsas xüsusiyyət hesab edirik. Bu zaman müəllim uşağın şəxsiyyəti ilə bərabər, həmin vaxtdakı şəraiti və uşaqların yaş xüsusiyyətlərini, uşaq kollektivinin xüsusiyyətlərini, uşaq kollektivinin vəziyyətini, inkişaf səviyyəsini hökmən nəzərə alır ki, tətbiq etdiyi təsir üsulu düzgün olsun, müsbət nəticə versin. Bütün bu dediklərimiz əsasında biz pedaqoji mərifətə belə tərif veririk: pedaqoji mərifət yaranmış olan mürəkkəb pedaqoji vəziyyətdə uşaqların yaş və fərdi xüsusiyyətlərini və uşaq kollektivinin inkişaf səviyyəsini nəzərə almaq, hörmət və tələbkarlıq prinsipinə əsaslanmaqla cəld bir şəkildə düzgün üsul və ya tərz işlətməkdən ibarətdir.

Bu tərifdən göründüyü kimi, pedaqoji mərifətin əsl mahiyyəti törənmiş mürəkkəb pedaqoji vəziyyətdə pedaqoqun təxirə salmadan, cəld bir surətdə düzgün üsul və ya tərz işlətməsidir; uşaq haqqında bu üsul və ya tərzi tətbiq edərkən pedaqoq hörmət və tələbkarlıq prinsipini rəhbər tutaraq, tələbkarlığı azaltmadan ona həssaslıqla yanaşır, onun fərdi xüsusiyyətlərini, xarakterinin əlamətlərini və eləcə də uşaq kollektivinin inkişaf səviyyəsini yaxşı bildiyi üçün bu üsul və tərzlərin uşağa və kollektivə necə təsir edəcəyini qabaqcadan yəqin edir.

Belə bir bacarığa malik olmaq təlim-tərbiyə işində tez-tez lazım olur. Pedaqoji işdə müəllim, tərbiyəçi, valideyn çətin pedaqoji vəziyyətdən dərhal çıxış yolu tapmalı olurlar: pedaqoqun hansı üsul və təsir tərzi işlətmək haqqında uzun fikirləşməyə macalı olmur, o, dərhal vəziyyətdən çıxmağı bacarmalı, özü də bu çətinliyi pedaqoji cəhətdən düzgün həll edərək, uşağa və uşaq kollektivinə müsbət təsir göstərməlidir. Bu zaman müəllimdən – tərbiyəçidən ustalıq, yaradıcılıq tələb olunur.

Bunu bir neçə misalla izah edək (misalların bir çoxu L.L.Dodonun "Pedaqogika üzrə məsələ və çalışmalar məcmuəsi"ndən götürülmüşdür).

Oktyabr ayında I sinifdə yazı dərsi gedirdi. Şagirdlərdən birinin perosu sınır, ehtiyat qələmi isə yoxdur. Müəllim:

- Uşaqlar, kim ona qələm verər? – deyə sinifə müraciət edir.

Uşaqlardan heç biri qələm verməyə tələsmir. Müəllim vəziyyətdən tez çıxış yolu tapmalıdır. O, bir neçə cür hərəkət edə bilərdi: Bir şagirddən sərəncam tonu ilə qələm verməyi tələb edər, ya uşaqlara izah edərdi ki, xəsislik pisdir, yoldaşa kömək etmək lazımdır, yaxud da öz qələmini həmin şagirdə verib, sinfə məzəmmət nəzəri ilə baxa bilərdi və s. lakin müəllim bu dəfə dolayı yoldan istifadə etməyi lazım bildi. O, uşaqlara dedi: "Siz qələm axtarınca, mən sizə kiçik bir nağıl danışım". O, xəsis və xeyirxah qızlar haqqında kiçik bir nağıl danışdı. Bu nağılda hadisələr belə qurulur ki, hər iki qız ağır vəziyyətə düşür. Lakin heç nə xəsis qıza kömək etmir, xeyirxah qıza külək də, çiçəklər də, otlar da kömək edir.

Nağıl bitir. Müəllim soruşur: - Hə, uşaqlar, kim qələm tapıb?

Bütün şagirdlər qələmini sındırmış uşağa qələm təklif edir.

Burada müəllim I sinifdə hələ uşaqlar

arasında yoldaşlıq əlaqələrinin zəif olduğunu nəzərə alıb, onların könlünə dəymədən dolayı təsir tərzindən istifadə edərək müvəffəqiyyət qazandı. Bu, yeganə çıxış yolu idimi? Yox, lakin cəld ifadə olunan düzgün təsir tərzi idi.

İkinci bir misal: müəllim III sinfə daxil olarkən həmişə özünə diqqət cəlb etmək istəyən bir uşağın bu dəfə özünü təlxəkliyə qoyaraq, üzünü mürəkkəbə boyamış şəkildə partada oturduğunu görür. O, cəld qərara gəlir ki, həmin uşağı danlasa və ya başqa cəza tətbiq etsə onu sinfin diqqəti mərkəzinə qoymuş olar və bununla da uşaq öz məqsədinə nail olar. Müəllim daha düzgün olan başqa yol tutur. O özünü görməzliyə vurub öz işinə başlayır, həmin uşaq tərəfə baxmadan sorğuya başlayır. Üzünü mürəkkəblə boyamış uşaq “Mən cavab verim”, - deyə müəllimin ona nəzər salmasına çalışsa da, müəllim ona etina etmir. Uşaq pərt olur, sinif istehza ilə yavaşdan gülüşür. Uşaq “nömrəsinin” keçmədiyini hiss edib birazdan sinifdən çıxmaq üçün müəllimdən icazə istəyir və üzünü yuyub sinfə daxil olur.

Lovğa uşağı pərt etməyə aid bir misal da gətirək.

VII sinif şagirdlərindən biri, hər riyaziyyat dərsində onu yazı taxtasına çağırmağı israrla xahiş edir. Müəllim izah edir ki, digər şagirdlər də cavab verməlidir. Lakin bu ona təsir etmir. Bir dəfə müəllim yenicə dərsə başlamışdı ki, yenə də həmin şagirdin “mən gəlim”, - sözlərini eşitdi. Müəllim: - “Buyurun”, - deyib dərsinə davam etdi. Şagird beş dəqiqəyə qədər yazı taxtası yanında dayanıb müəllimin ona müraciətini gözlədi. Sinif də intizarda idi. Müəllim isə izahatını davam etdirirdi. Bir neçə dəqiqə də keçdi. Yazı taxtası yanındakı şagird ona iş təklif olunmadığını müəllimə bildirdi. Müəllim: - “Mən ki, sizi çağırmadım, özünüz yazı taxtası qarşısına çıxmaq istədiniz” – deyə cavab verdi. Sinif gülüşdü. Şagird qızarıb yerinə qayıtdı və bir daha yersiz olaraq “mən gəlim” ifadəsini işlətmədi.

Adətən pedaqoji işdə törənmiş çətin vəziyyətdən bir yox, bir neçə cür çıxış yolu olur. Bunlardan, əlbəttə, birisi həmin uşaq kollektivində və ya həmin uşaq üçün daha düzgün yoldur. Bunu müəyyən etmək isə müəllimdən sinfə və həmin şagirdə yaxşı bələd olmağı tələb edir.

Biz aşağıda sinfi zibilli görən müəllimlərin necə müxtəlif hərəkət etməsi misalında bunu aydınlaşdırmağa çalışacağıq.

Bir müəllim sinfə daxil olarkən döşəmədə xeyli zibil görərək: - Kim zibilləyib? – deyə sinfə müraciət edir. Sinif susur. Müəllimin təkrar sorğusuna bəzi şagirdlər “Biz bilmirik” – deyə cavb verir. Müsbət cavab almayan müəllim şagirdlərə deyir: “Kimin zibillədiyini deməyincə” heç kəs evə getməyəcək. Evə getməyə tələsən iki şagird bunu kimlərin etdiyini söyləyir. Müəllim hamını evə buraxır, sinfi zibilləmiş şagirdləri isə cəzalandırır.

İkinci bir müəllim sinfi zibillənmiş görüb, yenə: “Sinfi kim zibilləyib?” – deyə soruşur. Sinfin susduğunu görüb – “İndi ki, demirsiniz onda sinfi hamınız yığışdırın. Danışıq lazım deyil”, - deyə sərəncam verir. Şagirdlər narazılıqla sinfi yığışdırırlar, dərsin müəyyən hissəsi itir.

Üçüncü pedaqoq başqa yol seçir, o, deyir: - “Kimin zibillədiyini demirsiniz? Təəssüf! Nə olar... Gedə bilərsiniz. Qaydanı pozan intizamsız şagird, sizin onu müdafiə edəcəyinizə ümid edib, gələcəkdə də sinfin adını ləkələyəcək. Belə görünür ki, o, heç sizi saymır və istəyir ki, bütün sinif cəzalansın ya başqalarından şübhələnsinlər”.

Dördüncü müəllim sinfi zibilli görüb” – “Mən belə zibillikdə dərs deyə bilmərəm. Mən koridorda gəzinirəm, zibilliyi təmizlə-

yəndə mənə xəbər verərsiniz. Dərsimizi davam etdirərik. Sonra dərsdən alınmış dəqiqələrin əvəzinə tənəffüsdə dərsi davam etdirərik", - deyir. Belə də edir.

Beşinci müəllim sinfi zibilli görüb, onun kim tərəfindən zibillənməsi ilə maraqlanmayaraq paralel təsir yolunu tutur: O, "Bu gün növbətçi kimdir?" – deyə soruşur. Növbətçi qalxır. Müəllim – Siz, sinifdə təmizliyi təmin etməli idiniz. Etməmisiniz. Dərsdən sonra qalıb sinfin təmizlənməsini təmin edin (və ya bu saat sinfi təmizləyin) deyib dərsə başlayır.

Bulardan hansının ən düzgün hərəkət etdiyini qəti söyləmək mümkün deyildir. Lakin şagirdi öz yoldaşını "satmağa" məcbur edən birinci müəllimin düzgün hərəkət etmədiyi məlumdur. İkinci müəllim ondan daha doğru hərəkət edirsə də, sinif şagird kollektivinin vəziyyətini, inkişaf səviyyəsini nəzərə almağı yaddan çıxarmışdır.

Üçüncü müəllim isə kollektivin şərəf hissinə müraciət edir. Əgər sinifdə kollektivçilik hissi inkişaf etmişsə, bu tərz ömək edə bilər. Lakin zibil təmizlənməmiş qaldığından məsələ həll edilməmiş olur.

Dördüncü və beşinci müəllimlər daha doğru hərəkət edirlər: lakin bunlardan dördüncüsü sinifdə möhkəm kollektiv olmadığı şəraitdə, sonuncusu isə sinifdə kollektivçilik hissi inkişaf etdiyi şəraitdə sayılmalıdır.

Pedaqoji mərifət tərzləri ciddi surətdə fərdi xüsusiyyət daşıdığından burada əsil məsələ fərdin və kollektivin vəziyyətini nəzərə almaqdır.

Bir çox halda şagirdlərin hər kiçik intizamsız hərəkətlərini ağardıb, onları bunun üçün danlamaq yaxşı nəticə vermir. Xüsusən bu zaman müəllim intizamsızlığı qabaq bir şəkildə dayandırmaq istəyəndə müəllimdə şagird arasında münaqişə baş verə bilər. Bunu nəzərə alaraq, bəzi hallarda usta müəllim şagirdin pis hərəkətini çox ağartmayaraq, ancaq bu hərəkətdən xəbərdar olduğunu bildirməklə kifayətlənir və bu, şagirdə müsbət təsir göstərir: uşaq müəllimin nəzakətli münasibətini qiymətləndirir və həmin pis hərəkətdən əl çəkir. Bunu aşağıdakı misallarla göstərək.

Bir müəllim VI sinifdə oxuyan oğlana intizamsızlığı, dalaşqanlığı üçün dəfələrlə izahat və məzəmmət təsir etmədikdə onun atasını məktəbə dəvət edir. O, gəlmir. Müəllim onun ailə şəraitini öyrənmək və valideyni ilə söhbət etməkdən ötrü evlərinə getməyi qət edir. Oğlan müəllimi küçələrində görəndə özünü itirir, rəngi qaçmış halda onunla evə getməli olur. Müəllim çoxdan təmizlik və yır-yığış görməyən evə daxil olur, stol arxasında üzünü saqqal basmış pinti geyinən bir kişi görür. Əyyaşlığa qapılmış, gözündən dəhşət yağan kişi içəri girən şəxsin müəllim olduğunu hiss edər-etməz:

-Hə, yenə bizim bu küçük nə dələduzluq edib? İndi mən onun aşını bişirərəm – deyib, qəzəblə qayışa əl atır.

Rəngi saralmış uşaq titrək səslə:

- Heç nə etməmişəm – deyib susur.

Müəllim uşağın qorxaq vəziyyətinə və atanın hərəkətlərinə baxıb bu vəziyyətdə söhbətin baş tutmayacağını, şikayətin isə işi ancaq korlayacağını hiss edib cəld yeni taktika qəbul edir:

Oğlunuz özünü məktəbdə yaxşı aparmağa başlayıb, mən ondan şikayətə gəlməmişəm, -deyir. – Buradan keçirdim, dedim bir onun ev şəraiti ilə tanış olum.

Bu sözləri eşidən oğlanın rəngi özünə gəlir və müəllimə təşəkküredici nəzərdə baxır. Müəllim gedəndə o, onu küçə tininə qədər ötürür, bir qədər sakitcə getdikdən

sonra, oğlan müəllimin əlindən yavaşca tutub sıxır və:

- Siz bir də məndən nadinclik görməzsiniz, - deyib geri dönür.

Doğurdan da, müəllimin, onu şiddətli fiziki cəzadan xilas etmək üçün göstərdiyi həssaslıq və qayğıkeşliyindən sarsılmış uşaq, o gündən tamam dəyişir və bütün işlərdə müəllimin ən yaxın köməkçisi olur.

Utancaq, lakin dərslərini vaxtında hazırlayan V sinif şagirdi dərs vaxtı sakit otura bilmir. Nə ilə isə məşğul olur. Bu dəfə də o, evlərindən gətirdiyi bir oyuncağı oynadır. Müəllim ciddi nəzəri ilə onun diqqətini dərsə cəlb etməyə çalışırsa da, bu ancaq qısa müddətdə təsir göstərir. Müəllimin səbri kəsilib ona yaxınlaşır və:

-Nə ilə məşğulsan, əlindəki nədir? – deyə soruşur. Uşaq özünü itirərək təqsirkar adam kimi oyuncağı müəllimə verir. Silahlı süvarini təsvir edən oyuncaq çox məharətlə qayrılmışdır. Bu, onun öz əl işi idi.

Müəllim:

-Bir də bu oyuncağı görməzsən, - deyib oyuncağı küçəyə atır. – Bundan sonra bilin, kim sinifə artıq şey gətirsə onu əlindən alıb bir daha qaytarmayacağam, - deyir. Lakin müəllimin belə qaba hərəkəti onun gözlədiyi nəticəni vermir, əksinə, uşaqda müəllimə qarşı gizli etiraz doğurur. O, bunu aşkar ifadə etməsə də, onda müəllimə qarşı mənfi hiss yaranır.

Başqa dərsdə həmin şagird yenə özünün bir həftə əziyyət çəkib hazırladığı tapança modelinə baxarkən, bu dəfə o biri müəllim oyuncağı yenə şagirddən tələb edir. Şagird müəllimin bu oyuncağı da küçəyə atacağını düşünərək heyfsilənə-heyfsilənə tapançanı stolun üstünə qoyur. Müəllim oyuncağa baxmadan onu kitabla örtür və dərsi davam etdirir. Zəngdən sonra o, şagirdin hazırladığı tapançanı maraqla nəzərdən keçirib bunu kimin hazırladığını soruşur. Belə silahı harada gördüyünü öyrənir. Axırda oyuncağı tərifləyərək deyir:

-Görünür, çox işləmisən, al bunu, bu, sənin gözəl əl işindir. Ancaq gəl belə danışaq ki, sən bundan sonra sinfə heç bir kənar şey gətirməyəcəksən. Bacararsanmı?

-Bəli, - deyə şagird sevincək cavab verir və sözündə sadiq qalır.

İkinci müəllim mərifətlə hərəkət etdi və uşağın hörmətini qazandı.

Bu məsələyə aid daha bir misal gətirək.

VIII sinifdə son dərsdə müəllim hiss edir ki, iki şagird domino oynayır. Bu haqda heç bir söz demədən o, əvvəl birini, sonra o birisini cavab üçün çağırır. Sinif onların domino oynadığını bilmir, lakin şagirdlər bundan özləri üçün nəticə çıxarırlar.

Başqa bir müəllim isə VI sinifdə coğrafiya dərsində son partada oturan iki şagirdin şahmat oynadığını görür. Onlara yanaşaraq partanın üzərindən fiqurları əli ilə itələyib döşəməyə salır. Şagirdlər donquldanıb müəllimə cavab qaytarırlar.

Burada, əlbəttə, müəllim qaba hərəkət edir. Məsələni pedaqoji mərifət dairəsində həll etmir, nəticədə şagirdi cavab qaytarmağa vadar edir.

Lakin tərbiyə işində bütün məsələlər hər zaman mülayimliklə həll olunmur. Bəzi hallarda müəllim kobud intizamsızlığa qarşı öz həqiqi qəzəbini ifadə etməli və şagirdi utandırmalı, intizamsızlığı dərhal dayandırmağı ciddi surətdə tələb etməli olur.

A.S.Makarenko pedaqoqun qəzəblənmək hüququ məsələsini qaldırmış və qəzəbin müəllim tərəfindən uzun-uzadı deyinmək şəklində yox, açıqcasına, həyəcanla ifadə olunmasını və qəti tələblə bitməsini lazım bilmişdir.

Tənəffüs vaxtı VII sinifdə bir oğlan uşaqları güldürmək üçün köynəyinin altından döşlərinə cındır qoyaraq bəzi qızlar kimi əzilib-büzülür. O biri oğlanlar gülüşür, qızlar isə utandıqlarından başlarını aşağı dikir, bəziləri də sinfi tərk edirlər. Bundan xəbər tutan müəllim dərhal sinfə gəlib qəzəbli səslə: - Heç utanmırsınız? Sizin qızlara olan hörmətiniz hanı? Bir nəfər özünü təlxək yerinə qoyub ədəbsiz hərəkət edir, siz isə bacılarınızı bu ədəbsizdən qorumaq əvəzinə hırıldayırsınız. Utanın! – deyərək qapını çırpıb gedir.

Sinfin oğlanları öz səhvlərini başa düşürlər. Onlar qızlardan sinfi tərk etməyi xahiş edirlər. Sonra ədəbsiz hərəkətə yol vermiş yoldaşlarını şiddətli məzəmmət edirlər.

Bəzi şagirdlər yeni müəllimi ilk dəqiqədən pərt etməyi sevir və onu çox gözlənilməz şəkildə qəbul edirlər: stulu təbaşirə boyayır, uğultu səslər çıxarır və s. Müəllimin belə şəraitdə şagirdlərin gözlədiyi kimi yox, tamam başqa cür hərəkət etməsi, onları heyrətə gətirir və tutduqları işdən peşimanlıq hissi keçirməyə sövq edir.

Pedaqoji institutu yeni bitirib birinci dəfə VI sinfin qapısını açan müəllim görür ki, qapıdan ta müəllim stolunun yanına kimi yer şagirdlərin paltosu ilə döşənmişdir. Belə halda nə etmək lazım olduğu, ən düzgün hərəkətin nədən ibarət olduğu heç bir pedaqogika və psixologiya kitabında yazılmamışdır. O, pedaqogika müəllimindən eşitmişdi ki, bəzən siniflərdə uşaqlar sözü bir yerə qoyub təzə gələn müəllimi əcayib şəkillərdə qəbul edirlər. Lakin o, heç ağlına da gətirə bilməzdi ki, sinif onu məhz bu cür qarşılaya bilər. Burada dərhal nə isə etmək – ya geri çəkilib qayıtmaq, ya paltoların yerdən götürülməsini tələb edib sinfi danlamaq, ya özünü görməzliyə qoyub, paltoları tapdamadan keçmək və s. yol tutmaq lazım idi. Müəllim sinfin gözləyici vəziyyətdə duruxduğuna nəzər salıb paltoların üzəri ilə yeriyərək öz stolu yanına gəlir və sinfə: - “Təşəkkür edirəm”, - deyib ciddi surətdə dərhal dərsə başlayır. Paltolar dərsin axırına qədər döşəmə üzərində qalır. Ev tapşırığı verəndən sonra, müəllim şagirdlərə paltoları asqıdan asmağı təklif edir və bundan sonra onu, belə təntənəli şəkildə qəbul etməməyi xahiş edir. Sinif öz kələyinin baş tutmadığını görüb peşman olur və bir daha həmin müəllimə belə hərəkət etmir.

Bütün deyilənlərdən və gətirilən misallardan görünür ki, pedaqoji mərifət hər bir müəllim, tərbiyəçi üçün zəruridir. Bu, tərbiyə işində uşaqlarla pedaqoqlar, övladlarla valideynlər arasında düzgün münasibət yaradıb bir çox münaqişələrin baş verməsi qarşısını alır və müəllimin, tərbiyəçilərin nüfuzu üçün əsas yardır. Uşaqların yaş və fərdi xüsusiyyətlərini bilmədən, şəraiti və kollektivin tərbiyə səviyyəsini nəzərə almadan onlara təsir göstərməyə çalışan pedaqoq pedaqoji mərifət işində müvəffəqiyyətsizliyə uğrayır. Uşaqlara hörmət etməyən, onlara həssaslıq və qayğı ilə yanaşmayan, tez-tez onları acılayan, heysiyyətlərini, izzəti-nəfslərini tapdayan, pedaqoq münaqişələrdən yaxa qurtara bilməz. Müəllimdən hörmət görməyən şagirdlər ona da hörmət etməzlər.

Əksinə, pedaqoq şagirdlərin yaş xüsusiyyətlərini, kollektivin inkişaf səviyyəsini və hər bir şagirdin fərdi xüsusiyyətini, xarakterini yaxşı bilmək, şagirdlərə tələbkarlığı azaltmadan onlara çox hörmət

etmək, həssaslıqla yanaşmaq əsasında çətin vəziyyətdə cəld düzgün pedaqoji yol taparsa şagirdlər onu sevir və onun mərifətinə aludə olur, nüfuzunu sözsüz qəbul edirlər. Bu əsasda şagirdlərlə müəllim arasında səmimi münasibət yaranır, pedaqoji iş gümrah əhvali-ruhiyyə şəraitində, münaqişəsiz cərəyan edir.

Belə bir bacarıq, əlbəttə, pedaqoqda fitrətən olmur. Bəzi çıxışlarda “pedaqoq anadangəlmə pedaqoq olmalıdır” fikrinə rast gəlirik. Onlar bu fikirlərində, birinci növbədə, müəllimin pedaqoji mərifətə yaxşı malik olmasını nəzərdə tuturlar. Lakin minlərlə usta müəllimin iş təcrübəsinin təhlili göstərir ki, onlar bu ustalığa və o cümlədən pedaqoji mərifətə məhz öz üzərlərində işləmək, başqalarının və özlərinin təcrübəsini təhlil edib, nəticə çıxarmaq əsasında yiyələnmişlər.

İctimai quruluşumuz şəraitində pedaqoji mərifət, hər şeydən əvvəl, müəllimin ideyaca, yetkin, əxlaqca saf, təmiz olmasını, pedaqoji məsələlərin həllində prinsipial, ədalətli, obyektiv olmasını nəzərdə tutur.

Bu, həm də müəllimdən psixologiya elmini, xüsusən hər yaşın psixologiyasını yaxşı bilməyi, uşaq kollektivinin əhvali-ruhiyyəsinə bələd olub, onun “nəbzini” yaxşı tuta bilməyi tələb edir.

Pedaqoji mərifət, həmçinin pedaqoqdan uşaqların fərdi xüsusiyyətlərini ətraflı öyrənib, onların hər birinin inkişaf şəraitini, temperament və xarakterini, emosiya və iradəsinin xüsusiyyətlərini gözəl bilməyə əsaslanır. Bunun üçün isə o müntəzəm surətdə hər bir uşağı öyrənməlidir.

Pedaqoji mərifətin hörmət və tələbkarlıq prinsipinə əsaslandığını nəzərə alaraq müəllim bu prinsipi şagirdlərlə apardığı bütün tərbiyə işlərinin əsasına qoymalı və uşaqlarla hər hansı bir təmasda bu prinsipi rəhbər tutmalıdır.

Pedaqoji mərifət müəllimin pedaqoji ustalığa yiyələnməsini və xüsusən onun yüksək dərəcədə fərasətə və bələdlik hissinə malik olmasını nəzərdə tutur. Fərasət dedikdə biz müəllimin gözlənilməz şəraitdə, uzun-uzadı fikirləşmədən, cəld bir surətdə düzgün çıxış yolu tapıb işlətməsini, bələdlik hissi dedikdə isə biz A.S.Makarenkonun ifadəsi ilə desək, müəllimin öz ətrafında dəyişən şəraiti dərhal hiss etməklə tez özünü ələ alaraq bu şəraitə müvafiq hərəkət etməsini nəzərdə tuturuq.

Bu keyfiyyətlər müəllimin öz üzərində işləməsi, müəllim yoldaşlarının və xüsusən mahir pedaqoji ustaların iş təcrübəsini öyrənməsi, özünün və başqalarının pedaqoji səhvləri və tapıntılarını müntəzəm təhlil etməsi, uşaqlarla necə danışmaq, onlara sərəncamı necə vermək və s. kimi pedaqoji mərifət məsələləri üzərində çalışması əsasında yaranıb yetkinləşir.

**“Azərbaycan məktəbi” jurnalı,**
**1969, № 12**



# ƏNƏNƏLƏR DAVAM EDİR

**Vəfa Eyvazova,**
***Tovuz şəhəri A.S.Puşkin adına tam orta məktəbin müəllimi***

Azərbaycan təhsilinin hazırki uğurları çox etibarlı mənbələrdən qidalanmışdır.

Xalqımızın maarifçi oğulları həmişə məktəb və təhsili millətin tərəqqisinin vacib şərti hesab etmiş, onun yüksəlişinə səy etmişlər. Hələ XIX əsrin sonlarında, XX əsrin əvvəllərində C.Məmmədquluzadə, F.Köçərli, Ü.Hacıbəyli, M.Mahmudbəyov, S.M.Qənizadə, S.S.Axundov, A.Şaiq müəllim kimi şöhrət tapmışlar. Xalqımız bu gün də onları müəllim kimi xatırlayır.

Tovuz rayonu həmişə təhsilimizdə qabaqcıllar sırasında olmuşdur. Tovuzlular da öz keçmiş müəllimlərini unutmurlar. Hər bir məktəb orada çalışıb, işləyən müəllimləri yad edir, onların xatirəsini əziz tutur. Onların içərisində Böyük Vətən müharibəsindən geri dönməyənlər də, Qarabağ döyüşlərində həlak olanlar da vardır. Müəllimlərinin yolu ilə gedən məzunlar da az deyildir. Rayonda qoyulan çoxlu abidələr də dediklərimizi tədqiq edir. Tovuzlular onlara xidmət edənləri unutmur, gənc nəslə tanıtmağı öz borcu bilir.

XX əsrin 70-80-ci illər maarifimizin yüksəliş dövrü olmuşdur. Ümummilli liderimiz Heydər Əliyevin 1969-cu ildə Azərbaycana rəhbərliyə başlaması bütün sahələrdə olduğu kimi təhsil sahəsində də canlanmaya səbəb olmuşdur. O illərdə maarifçi, qabaqcıl rayonlar sırasında Tovuz rayonunun adı tez-tez çəkilmişdir. Həmin illərdə rayonumuzda çox təcrübəli müəllimlər işləmişdir. Bu gün məktəbimizdə o illərdən söz düşəndə adları tez-tez xatırlanan belə müəllimlər hörmətlə yad edilir. Bu cəhətdən məktəbimizin bəxti gətirmişdir. Belə ki, indi də müəllimlərimizin tez-tez yada saldığı Qara Sultanov, Məhər Quliyev, Əli Abdullayev, İsrafil Quliyev, Talıb Qurbanov, Məmməd İsayev, Qızxanım Səfərova, Minayə Kərimova və başqaları məhz o illərdə fəaliyyət göstərmişlər.

Məktəbin müəllimləri minnətdarlıqla xatırlayırlar ki, Puşkin adına orta məktəbin əsasını tovuzlular həmişə ağsaqqal kimi qiymətləndirdiyi Ağaməmməd Axundov və Məmmədqara Məmmədov qoymuşdur. Onlar Tovuz maarifinin patriarxları kimi xatırlanırlar.

Rayonumuzun təhsilində danılmaz xidmətləri olan bu müəllimlər haqqında yazmaq üçün yaxşı müəllimlərlə məsləhətləşdim və ancaq ən zəruri məsələləri qələmə almağı lazım bildim.

Puşkin adına orta məktəbin 100 illik yubileyi münasibətilə görkəmli ziyalı, hüquqşünas, ictimai xadim, həmyerlimiz Zakir Zeynalovun "İstedadlar məktəbi" kitabı burada görülən işlər haqqında çox gözəl

və dəyərli məlumatlarla zəngindir. Tovuz rayonunun ilk dünyəvi təhsil ocağı olan bu məktəb, həmçinin, çoxlu istedadlar yetişdirmişdir.

Zakir Zeynalovun kitabından aşağıdakı sətirləri olduğu kimi verirəm: “İki görkəmli şəxsiyyətin - Qara Sultanovun (1960-1964) və Əli Abdullayevin (1964-1970) məktəbdə direktor işlədiyi illər nailiyyətlərlə müstəsna dərəcədə zəngin olmuşdur. Uzun illərin pedaqoji təcrübəsinə söykənən bu iki şəxsiyyətin dövründə Puşkin məktəbi Azərbaycanın ən nüfuzlu təhsil ocaqlarından biri kimi bütün respublikada və ittifaqda tanınmışdır. Məhz 1960-1970-ci illərdə A.S.Puşkin adına Tovuz şəhər orta məktəbinin adı SSRİ-nin bir sıra mərkəzi şəhərlərində, eləcə də Moskvada, Kiyevdə, Minskdə, Leninqradda keçirilən olimpiadaların nəticələrinə görə yüksək kürsülərdən hörmətlə çəkilmişdir. Qara Sultanov Əli Abdullayevin ardıcıl tələbkarlığı, nadir təşkilatçılıq qabiliyyəti, müəllimlərlə iş iş üsulu, ciddi intizam yaratması, pedaqoji qayda-qanunlara dəqiq əməl etməsi 1960-1970-ci illərdə gözəl bəhrələr vermişdir. Ali məktəblərə qəbul vaxtı demək olar ki, Puşkin məktəbinin məzunlarına imtahan bileti çəkdirmədən yüksək qiymət yazırdılar”.

Qara Sultanov riyaziyyat müəllimi olmuşdur. Onun tələbələri riyaziyyatın sirlərini məhz onun təbaşirinin vasitəsilə öyrənmişlər. İndi rayonumuzun bir sıra məktəblərində işləyən riyaziyyat müəllimləri vaxtı ilə Qara müəllimin şagirdləri olmuşlar. Məhz, gördüyü işlərə görə, Qara müəllim məktəb direktoru, sonra isə uzun müddət RXMŞ müdiri vəzifələrində irəli çəkilmişdir. Respublikanın rəhbər maarif işçiləri müəyyən məsələlərin həllində Qara müəllimlə hesablaşar, onunla məsləhətləşərdilər. Respublika elmi-praktik konfransında onun çıxışının təşkil edilməsini təşkilat komitəsindən xahiş edirdilər. Qara müəllim “Əməkdar müəllim” fəxri adına layiq bilinmiş, orden və medallarla təltif edilmişdir.

O illərdə Tovuz rayonunun iş təcrübəsi tez-tez respublika miqyasına çıxarılırdı. “Azərbaycan məktəbi”, “Azərbaycan müəllimi” tez-tez Tovuz müəllimlərinin işinə dair məqalələr dərc edirdi. Rayona başqa yerlərdən təcrübə mübadiləsinə gələnlərin sayı da ildən-ilə artırdı. Bu mübadilələrdə kimya müəllimləri çoxluq təşkil edirdi. Məktəbin kimya müəllimi Məhər Quliyev Sosialist Əməyi Qəhramanı idi. Keçmiş SSRİ dövründə Azərbaycanda bu ada üç müəllim layiq bilinmişdir: Z.Səmədov (Bakı), M.Atakişiyeva (Ağsu), M.Quliyev (Tovuz).

Tovuz müəllimləri öz rayonlarında belə bir müəllimin olmasına qürur duyurdular Məhər müəllimin səsi SSRİ Pedaqoji Elmlər Akademiyasından gəlirdi. Alimlər onu dinləyib, təcrübəsindən bəhrələnirdilər. Məhər müəllim haqqında kitabçalar yazılırdı. Deyirlər ki, ali məktəblərdə qəbul imtahanlarında kimyadan imtahan götürənlər Məhər müəllimin şagirdlərinə hörmət, diqqət və nəzakətlə yanaşır, onlara üstünlük verirdilər. Çoxları bunu indi də etiraf edirlər.

Azərbaycan Mərkəzi Müəllimlər İnstitutunda tez-tez Məhər müəllim ixtisasartırma kurslarına gələn müəllimlərin görüşü keçirilirdi. Bu barədə qəzetlərdə də məlumat verilmişdir. Tovuzda elə bir müəllim, valideyn tapılmaz ki, Məhər müəllimi tanıma-

sın.

Məhər müəllim öz ardıcıllarını da yetişdirirdi. Onun köməyi, zəmanəti və tövsiyəsi ilə Fərman müəllimi (Xatınlı kəndi), Talıb müəllimi (Çobansıxnaq kəndi) bütün Azərbaycan tanıyırdı.

Təlim-tərbiyə işləri üzrə direktor müavini Əli Abdullayevin iş üslubu sərt olsa da pedaqoji etikadan kənara çıxmırdı. Əli müəllim intizamı sevən rəhbər idi. O heç zaman məktəbdən aralanmazmış. Bütün günü öz otağında məktəbin tədris işləri ilə məşğul olurmuş. Əli müəllim yaşlaşdığı illərdə də yenə həvəs və enerji ilə işləmişdir. İsrafil müəllim, Leyla müəllimə fizikanı, Zaur müəllim riyaziyyatı yüksək səviyyədə tədris edirdilər.

A.Puşkin adına orta məktəbin səsi-sədası digər məktəblərə də yayılırdı. 70-ci illərdə rayonun Bozalqanlı məktəbi üçün yeni bina tikiləndə oraya axın başlanmışdı. O zaman Məhər müəllim də Bozalqanlı məktəbinə keçmişdi. Şəmsəddin Paşayevin idarəetmə üslubu tezliklə bu məktəbin də ölkədə tanınmasına səbəb oldu. Məktəbin riyaziyyat müəllimləri bütün rayonda ad çıxarmışdılar. Gülərüzlü Əfə müəllim (Əfə Həsənov), qaraqabaq Mədəd müəllim (Mədəd Qasımov), böyük həyat yolu keçmiş Xədicə müəllimə "riyaziyyatçı başlar" yetişdirmişlər. Bütün bu işlərə hazırlıq elə Puşkin adına məktəbdə başlanırdı. Puşkin adına məktəb yenə də örnək olaraq qalır.

Bu gün məktəbimiz ənənələri yaşadır və ən yaxşılarını davam etdirir. Məktəbimizin direktoru Rəşid Əmrahov bunu hamıdan yaxşı hiss edir. O öz təşkilatçılıq bacarığı ilə bütün işlərə istiqamət verir. Məktəbimiz fəxr edir ki, respublikamızın müxtəlif sferalarında çalışan kadrların içərisində bizim məktəbin məzunları da vardır. Məktəbimizin 100 illiyinin bayram edilməsi bunu bir daha nümayiş etdirdi. O zaman mərhum deputatımız Zakir Zeynalovun məktəbimiz haqqında yazdığı kitab əl-əl gəzmişdir. Orada qeyd olunur ki, bu məktəb nəinki savadlı, elmli gənclər, həm də mənəvi cəhətdən yetkin vətəndaşlar yetişdirmişdir. Pedaqoji kollektivimiz bu gün də sükanı möhkəm saxlamaqdadır.

Tovuzlular vətəni, torpağı sevir, onu qoruyurlar. 80-ci illərin sonunda mənfur qonşularla üz-üzə dayananda da onlar bu məziyyətlərinə sadiq qaldılar. Düşmənin heç bir təxribatı Tovuzdan bir qarış da torpaq qopara bilmədi. Tovuzlular mərdliklə hər bir çətinliyə sinə gərirlər.

Təhsilimizin dünya təhsilinə inteqrasiyası, kurikulumun uğurlu tətbiqi, qarşımızda açılan geniş üfüqlər bizdən daha yaradıcılıqla işləməyi tələb edir. İndi məktəbdə də, müəllimdə də keyfiyyət dəyişikliyi baş vermiş, proqramlar, dərsliklər tamamilə yeniləndirilmiş, təhsilimizə ən səmərəli yeniliklər gətirilmişdir. Elmi-texnika əsrinin məktəbi onun tələblərinə uyğunlaşdırılmalıdır. Belə vəziyyətdə məktəbimizin maddi tədris bazası, kadr potensialı, idarəetmə üsulları imkan verir ki, uğurlarımız ildən-ilə çoxalsın və yaxşı işləməyi bizə miras qoyub gedən müəllimlərimizin ruhu şad olsun.

# TƏHSİL TARİXİMİZİN UNUDULMAZ SƏHİFƏSİ

Qərbi Azərbaycan təhsili həmişə Azərbaycan təhsilinin bir hissəsi olmuşdur. İrəvan Pedaqoji Məktəbinin fəaliyyəti də təhsilimiz tarixinə qızıl hərflərlə yazılmışdır. Son faktlar bu mövzuda tədqiqatların aparılması fərəh doğurur. Qərbi Azərbaycanın təhsil tarixini tədqiq edənlər bu və ya digər dərəcədə İrəvan Pedaqoji Məktəbinin tarixinə də toxunmuşlar. Bu cəhətdən filologiya üzrə fəlsəfə doktoru, dosent Cəfər Cəfərov və filologiya üzrə fəlsəfə doktoru Cəlal Allahverdiyevin "Təhsil tariximizdən: İrəvan Pedaqoji Məktəbi" kitabı (Bakı,




2017) təqdirəlayiqdir. 238 səhifəli, nəfis şəkildə oxuculara tədqiq olunan bu kitab çox mətləblərdən xəbər verir. Qeyd etmək lazımdır ki, bir sıra dəyərli kitablar işıq üzü görmüşdür. Bilavasitə bu mövzuda isə, dosent Nəcəf Nəcəfovun "İrəvan Pedaqoji Məktəbi" "İrəvan Pedaqoji İnstitutu Azərbaycan bölməsinin acı taleyi" adlı iri həcmli məqalələri 2013-cü ildə "Azərbaycan müəllimi" qəzetində dərc olunmuşdur. Lakin təbii ki, bir qəzet məqaləsində bu qədər zəngin faktları yerləşdirmək imkanı olmamışdır və ola da bilməzdi. Lakin C.Cəfərov və C.Allahverdiyevin bu kitabı təhsil tariximizə unudulmuş faktları daxil etmiş, bir daha təsdiq etmişlər ki, əzəli torpaqlarımız olan İrəvanı təhsil tariximizdən ayırmaq olmaz. Mənfur qonşular müxtəlif adlarla İrəvanı "özlərininki" hesab etsələr də, tarixi faktlar onların haqsız olduğunu şəksiz sübut edir. Kitabı oxuyanlar oradakı tarixi şəxslərin çoxunun indi həyatda olmamasına təəssüflənsələr də, o şəxslərin övladları, nəvə və nəticələri bunu minnətdarlıqla qəbul edirlər və kitabın müəlliflərinə "sağ olun", - deyirlər.

**Sona Xankişiyeva**
***"Azərbaycan məktəbi" jurnalının şöbə müdiri, Azərbaycan Jurnalistlər Birliyinin üzvü***

# UŞİNSKİNİN VƏSİYYƏTLƏRİNDƏN

"Öz vətənimə mümkün qədər çox fayda vermək – mənim həyatımın yeganə məqsədidi, mən bütün qabiliyyətlərimi məhz buna yönəltməliyəm".

"Təlim tərbiyənin olduqca qüdrətli üzvüdür və bu üzvdən məhrum olan müəllim uşaqlar üzərində ən başlıca və ən gerçək təsir vasitəsini itirmiş olur".

"Nəzəriyyəsiz tək bir pedaqoji təcrübə təbabətdəki türkəçaralığa bənzər".

"Öz dərsində bütün şagirdlərin diqqətini cəlb etmək bacarığı müəllimlik ləyaqətinin məhək daşıdır".

"Fənn müəllimin başında nə qədər aydın olsa, şagirdlərinin də başında bir o qədər aydın əks olunar. Ona görə müəllimliyə hazırlanan adamlara şagirdlərə verəcəkləri təlim materialını əsaslı sürətdə öyrətmək lazımdır".

"Şagirdlərin yaşı az olduqca, tərbiyəçidən daha çox pedaqoji bilik tələb olunur və şagirdlərin yaşı artdıqca bu tələb artmır, əksinə olaraq azalır. Pedaqogikanın çox geniş əsası və çox dar zirvəsi vardır. İlk tədris didaktikası haqqında cildlərlə əsər yazmaq olar".

"Uşaq ana dilini öyrənərkən yalnız şərti sözləri öyrənməklə kifayətlənmir, o, doğma sözün doğma döşündən mənəvi həyat və qüvvə əmir".

"Tərbiyə yalnız insanın aglını inkişaf etdirmək və ona müəyyən həcmdə məlumat verməklə kifayətlənməməlidir, o, insanda ciddi əmək arzusu da oyatmalıdır, bunsuz onun həyatı nə ləyaqətli, nə də xoşbəxt ola bilməz".

"Əlaqəsiz, qırıq-qırıq biliklərlə dolu olan baş, içərisində bütün şeylər qaydasız toplanan ambara bənzər ki, ambar sahibi özü də oradan bir şey axtarıb tapa bilmir".

"Əgər tərbiyə insanı xoşbəxt etmək istəyirsə, onu xoşbəxtlik üçün tərbiyə etməli, bəlkə də əmək həyatına hazırlamalıdır. Əmək insanın yer üzündə əldə edə bilcəyi və onun adına yeganə layiq olan xoşbəxtlikdir. Əmək bəşəriyyət tarixinin lap əvvəlindən yer üzündə solğun işıq saçan, müqəddəs şamdır, onu söndürsəniz, hər yer zülmətə çevrilər".

***"Azərbaycan məktəbi",***
***1946, № 2-3***

# BİZƏ YAZIRLAR

**Pedaqogika elmləri üzrə fəlsəfə doktoru, dosent Sədaqət Hüseynovanın “Fənlərarası əlaqəyə dair”** məqaləsində fənlərarası əlaqələrin ən zəruri məsələlərindən danışır.

Məqalədə deyilir: Tədris prosesində fəndaxili və fənlərarası inteqrasiyanın təmin edilməsi dərsin maraqlı və məzmunlu qurulmasına, bilik və bacarıqların şagirdlər tərəfindən daha dərindən mənimsənilməsinə səbəb olur. Artıq metodika elmi çoxdan sübut etmişdir ki, fənlərarası əlaqə təlim prosesinin səmərəliliyinə şərait yaradır. Şagirdlərin təbiət və cəmiyyətlə qarşılıqlı əlaqələri şəraitdə qurulmasına dair biliklərə yiyələnməsini stimullaşdırır və bununla da fənlər arasında qarşılıqlı əlaqə və asılılığı dərinləşdirməyə xidmət edir.

Fənlərarası əlaqənin mahiyyətini anlatmaq üçün şagirdlərə böyük adamların həyatından bəzi faktları xatırlatmaq faydalı olur. Məsələn, böyük yazıçıların heç də hamısı ixtisasca ədəbiyyatçı olmamışdır. Böyük romanlar, dramlar müəllifi Mehdi Hüseyn ali məktəbin tarix fakültəsini bitirmişdir. “Yerin sirri” romanı, “Eşitdiklərim, gördüklərim, bildiklərim” əsərinin müəllifi M.Süleymanov geoloji-kəşfiyyat fakültəsini bitirmişdir. Rus alimi, şair M.V.Lomonosov deyirdi ki, “bütün elmlərin qrammatikaya ehtiyacı vardır”. A.S.Puşkin deyirdi ki, “qəlbən şair olmayan əsl riyaziyyatçı ola bilməz”. Leonardo da Vinçi deyirdi ki, “bütün kəşflər riyazi sübutlarla təsdiqlənməlidir”.

Müxtəlif dövrlərdə xalqımızın tarixi inkişafı, mədəniyyəti, məişət tərzi, yadelli işğalçılara qarşı azadlıq uğrunda apardığı mübarizə və s. bədii ifadəsini ədəbiyyatımızda tapmışdır. Bir xalqın ədəbiyyatı həmin xalqın tarixində baş vermiş hadisələri bədii şəkildə nəsillərdən-nəsillərə çatdıran vasitədir. Eyni zamanda, ədəbiyyatı xalqın tarixi ilə əlaqədar hadisələri bu və ya digər şəkildə əks etdirən güzgü, milli, mədəni sərvətini mühafizə edib saxlayan xəzinə adlandırmaq olar.

Orta ümumtəhsil məktəblərində tədris olunan ədəbi əsərlərin əksəriyyəti tarixlə əlaqəlidir. Yazıçının yaradıcılıq xüsusiyyəti onun yaşadığı dövrlə ayrılmaz şəkildə bağlı olur. Onu hər hansı bir qənaətə gətirən, bu və ya başqa əsərini yazmaq ideyasını doğuran, yazıçının yaşadığı ictimai quruluşa, o dövrdə baş verən ictimai – siyasi hadisələrə göstərdiyi münasibətdir. Buradan aydın olur ki, yazıçının yaradıcılığında diqqəti cəlb edən problemlərin başa düşülüb dərk edilməsi üçün onun yaşadığı dövr haqqında şagirdlər məlumatlandırılmalıdır. Bu məqsədlə də sənətkarın əsəri öyrədilməmişdən əvvəl, dərsliklərdə onun həyatı haqqında məlumat verilir. Lakin ədəbiyyat tariximizdə, xüsusilə orta məktəb üçün ədəbiyyat dərsliklərində bəzi yazıçıların həyatı haqqında kifayət qədər məlumat verilmədiyindən tərcümeyi-hal materialının öyrədilməsi zamanı onu şagirdlərin tarixdən

aldıqları biliklərlə əlaqələndirmək zərurəti meydana çıxır.

Ayrı-ayrı konkret bədii əsərdə danışılan əhvalatı əsərin məzmununu tarixdən qazanılmış biliklərlə əlaqələndirmək lazım gəlir. Bədii əsərlərin məzmununun tarixi faktlarla əlaqələndirilməsi iki halda tələb olunur:

1. Orta məktəbdə tədris olunan əsər müəyyən bir tarixi hadisəyə, tarixi şəxsiyyətin həyat və fəaliyyətinə həsr olunur. Müəllim əsərin tədrisi zamanı tarix fənni ilə əlaqə yaratmalı, şagirdlərin diqqətini hadisələrin başvermə səbəbinə yönəltməlidir.

2. Tarix fənni ilə əlaqənin yaradılmasını zəruri edən səbəblərdən biri də bədii əsərdəki obrazlarla bağlıdır. Ədəbi əsərlərdə onların yaşadığı dövr əks olunur. Oxucu həmin əsərdə baş verən hadisələrin mahiyyətini daha yaxşı dərk etmək üçün obrazların yaşadığı dövrə müraciət etməli, onu araşdırmalıdır.

Ümumiyyətlə, fənlərarası əlaqə nəticəsində şagirdlərin təlim prosesində müşahidələri daha geniş olur. Onlarda təfəkkürün inkişafına kömək müqayisəsi, mücərrədləşdirmə və ümumiləşdirmə güclənir. Fənlərarası əlaqə o zaman uğurlu nəticələr verir ki, müəllim böyük pedaqoji ustalığa malik olsun.

Ədəbiyyat dərslərində kurikulumun tələbinə uyğun olaraq, fənlərarası əlaqədən istifadə şagirdlərdə məlumat toplama, sistemləşdirmə, ümumiləşdirmə və s. kimi bacarıqların formalaşmasına zəmin yaradır.

**Bakı şəhəri, Xəzər rayonundakı S.Abbasov adına 117 nömrəli tam orta məktəbin müəllimi Şəlalə Novruzova məqaləsini mühüm bir məsələyə həsr etmişdir. "İnklüziv təhsil və əlillərin cəmiyyətə inteqrasiyası"** adlanan məqalədə hər bir insanın hüquq və azadlıqlarının vacib tərkib hissəsi olan təhsil hüququnda inklüziv təhsilin yerindən söhbət açılır və aşağıdakı nəticələri çıxarır:

Əlilliyi olan uşaqların sağlam uşaqlarla bir yerdə təhsil almasına, sağlam uşaqların valideynləri tərəfindən müxtəlif cür narazılıqlara rast gəlmələrinin şahidi oluruq. Bunun ən böyük səbəbi valideynlərin düzgün istiqamətləndirilməməsidir.

Əsas səbəb isə onların bu istiqamətdə düzgün maarifləndirilməməsidir. Bu mövzuda valideynlər arasında maarifləndirmə işlərinin aparılması vacib məsələlərdən biridir.

Əlil övladı olan valideyn bilməlidir ki, uşaqların kiçik yaşlarından təhsil almaları olduqca vacibdir. Uşaq təhsil ala bilməsə, cəmiyyətdən kənarda qalır və özünü cəmiyyətdə yarasız kimi hiss edir. Onları cəmiyyətə necə inteqrasiya etməli? Sağlamlıq məhdudiyyəti olan uşaqlar kollektivə uyğunlaşdırılır. Onlarda özlərinə inam yaranır. Cəmiyyətin digər üzvləri kimi bərabərhüquqlu bir şəxsiyyətə çevrilirlər. Hər hansı peşəyə sahib olur və gələcəkdə hər hansı bir sahədə özlərinə yer tuturlar, sağlam insanlardan heç də fərqlənmirlər. Son vaxtlar, ibtidai təhsilin səviyyəsi üzrə inklüziv təhsilin tətbiqi sahəsində bir sıra tədbirlər həyata keçirilməkdədir.

**Sevinc Qarazadə**
***"Azərbaycan məktəbi" jurnalının əməkdaşı***